***Müəllif:*** ***Məhəmməd Cəmil Zeynu***
***Türk dilindən tərcümə:*** *Fərahim Sələfi*
***Redaktor:*** *Ramil Həsənov*
***Kompüter:*** *Azər Qurbanov*

**كيف نفهم القرآن أنواع التفسير وشرح بعض آي القرآن**
**إعداد : محمد بن جميل زينو**

***«Kuranı nasıl anlayalım»*** *(Türk dilində)*
***Yazıçı:*** *Muhammed Cemil Ziynu*
***Ərəb dilindən tərcümə:*** *M. Beşir Eryarsoy*
***Nəşriyyat:*** *Guraba*
***Birinci çap***
***İstanbul,*** *May 2003/ H 1424*

*Məhəmməd Cəmil Zeynu*
***Quranı necə anlamalı. Təfsirin növləri və bəzi ayələrin şərhi***
*Gənclik 2004, səh. 225*

*Quranı anlaya bilmək bəzən onun təfsirini də açıqlamağı zəruriləşdirir. Xüsusilə, təfsir edilməsi və açıqlanması lazım gələn bəzi ayələrdə bu xüsusi əhəmiyyət kəsb edir.*

*Geniş oxucu kütləsi üçün nəzərdə tutulmuş bu əsərdə Qurani Kərimi anlamağa və açıqlamağa yardımçı ola biləcək tərzdə, təfsirin bəzi növləri əsas götürülməklə, açıqlanmasına ehtiyac duyulan bir sıra ayələrin şərhi xülasə şəklində verilmişdir.*

***ISBN-029-316(04-3-2004)***

# *Redaktordan*

*Həmdüsənalar Allaha məxsusdur! Peyğəmbərlərin ən şərəflisi Məhəmmədə (sallallahu əleyhi və səlləm), ailəsinə, əshabələrinə və Onun yolunu ixlasla davam etdirən hər bir müsəlmana Allahın salavatı və salamı olsun!*

*Uca Allah buyurur:* ***«Onlar Quran barəsində [****onun Allah kəlamı olması haqqında****] düşünməzlərmi?...» (Nisə, 4/82)***

*Məhəmməd Cəmil Zeynu* ***«Quranı necə anlamalı?»*** *əsərində Quranla bağlı müəyyən elmlərə toxunaraq, onlara Uca Allahın əzəmətli Kitabından, Peyğəmbər hədislərindən, əshabələrin, tabeinlərin və tanınmış təfsir alimlərinin sözlərindən nümunələr göstərmişdir. O, bübahisə doğuran bir sıra ayələrin təfsirinin əsaslandırılmasını daha mükəmməl dəlillərə istinad etmiş elm adamlarının sözləri ilə sübuta yetirmişdir. Lakin bütün bunlarla yanaşı müəllifin əsərdə nəzərə çarpacaq yüksək elmi xidmətlərindən biri də, onun fəsilləri çox böyük məharətlə tərtib etməsidir. Hamıya bəllidir ki, Qurani-Kərimin təfsirinə və onunla bağlı elmlərə dair yazılmış əsərlərlə müqayisədə kiçik həcmli bu kitabla müəllif ən mühüm məsələlərə toxunmaq istəmişdir. Onun ilk öncə oxucuya Qurani-Kərim ayələrinin təfsir etmə (yəni, Quranı Quranla, Quranı hədislə və Quranı əshabələrin sözləri ilə açıqlamaq...), daha sonra bu təfsirə əməl etmə (yəni, nəsx və mənsux, Məkkədə və Mədinədə nazil olmuş hökmləri nə vaxt tətbiq etmək...) metodikasını öyrətməsi isə, əsərin xüsusi gözəlliklərindəndir.*

*Uca Allah buyurur:* ***«Heç bilənlərlə bilməyənlər [****alimlə cahil****] eyni ola bilərmi?...» (Zumər, 9)***

*Türk dilindən Fərahim Sələfi tərəfindən tərcümə edilmiş* ***«Quranı necə anlamalı?»*** *əsərinin redaktəsi zamanı,*

*ötən tərcümə və redaktə etdiyimiz əsərlərdə olduğu kimi, burada da müəyyən araşdırmalar aparılmışdır. Onlar aşağıdakılardır:*

*1) Əsərin orijinallığını qorumaq məqsədilə onun Məkkə*
*şəhərində işıq üzü görmüş ikinci və üçüncü nəşrləri əsli nüsxələr kimi seçilmişdir. Lakin redaktə zamanı üçüncü nəşri ikincidən, türk tərcüməsini isə ərəb nüsxələrindən fərqləndirəcək müəyyən əlavələr və dəyişikliklər aşkar edilmişdir. Əsərin ərəb nüsxələrində "artırılmış və araşdırılmış..." sözlərinin yazılmasını gördükdən sonra isə türk tərcüməçisinin dördüncü, beşinci və s. yeni çaplardan istifadə etməsi ehtimalına gəldik. Məsələn, ərəb nüsxələrində «Quranı Quranla təfsir etmək» fəsli üç, türk tərcüməsində isə yeddi bənddən ibarət idi.*

*Həmçinin «Allah göylərin və yerin nurudur» fəslinin ərəb nəşrlərində İbn Abbas, Ubey bin Kəb, Abdurrahmən b. Zeyd və İbn Kəsirin ayənin təfsirində dedikləri sözlər mətndən çıxarılaraq əvəzinə Təbərinin məsələ ilə əlaqədar verdiyi açıqlamaları göstərilmişdir.*

*2) Əsərdə dəlil kimi gətirilən iqtibaslar onların götürüldüyü əsli mənbələrə uyğun olaraq tərəfimizdən yoxlanılmışdır. Məsələn: 42-ci səhifədə təqdim olunan: "Quranı oxuyun və ona uyğun əməl edin. Fəqət, onun vasitəsilə yeməyin…" – hədisini İmam Əhmədin "Musnəd" əsərindəki hədislə müqayisə etdikdə "...və ona uyğun əməl edin.." sözlərini orada tapa bilmədik. Bu halda, hədisin yuxarıdakı əlavə ilə əl-Beyhəqi tərəfindən nəql edildiyi bildirilmişdir.*

*79-cu səhifədə isə: "Şübhəsiz ki, Allahın insanlar arasından olan..." – hədisinin mənbəyi bildirilmədiyinə görə tərəfimizdən araşdırılmış və nəticə olaraq İbn Məcənin "Sünən" əsərində rəvayət edilməsi məlum olmuşdur.*

*3) Əsərdə sübut kimi misal gətirilən hədis və rəvayətlərin səhih və ya zəifliyini tanınmış hədis alimlərinin, xüsusən də şeyx Əlbaninin sözləri ilə dəqiqləşdirərək, onlardan yalnız zəif olanlarını göstərmiş, etibarlı rəvayətlərə heç bir sətiraltı qeyd yazmadan bəyan etmişik.*

*Məsələn, 94-cü səhifədəki: "Allahım, mən sənin qulunam, sənin kölənin və cariyənin oğluyam. Taleyim sənin əlindədir..." hədisinin isnadı, dahi hədis alimi şeyx Əlbaninin "Tərqib və tərhib" əsəri üzərində apardığı tədqiqatlara əsasən göstərilmişdir.*

*4) Kitabda buraxılan çoxçaylı mexaniki səhvlərə mümkün qədər düzəlişlər verilmişdir. Məsələn:*

*a. «Bu pauzalarla bağlı bəzi nümunələr» adlı başlığın 6-cı bəndində: (Bu ayədə «bu»....) ifadəsi Qurani Kərimlə müqayisəli şəkildə yoxlanıldıqda səktənin «Lut» sözü üzərinə qoyulması aşkar edilmişdir.*

*b. «Quranın əmr etdikləri Peyğəmbərə nazil olanlardır» fəslinin sonunda «ayəsini oxudum» ifadəsi orijinala uyğun olaraq «***فقلت له: اقرأ** *ayəsini oxu dedim» sözləri ilə əvəz edilmişdir.*

*c. «Kişilərin qadınlarla təklikdə qalmasının təhlükəsi» fəslindəki (səh. 154) «...Ebu Bekir əl-Cezairi də bu görüşü tercih etmiş görünmektedir. "Andolsun ki o kadın ona niyetlemişti...» ifadəsi əsli nüsxəyə müvafiq olaraq:*

واختاره أبو بكر الجزائري حين قال : ( ولقد همت به ...)

*«...Əbu Bəkr əl-Cəzairi də bu nəzər nöqtəsini üstün sayaraq demişdir:* **"Doğrudan da [**qadın**] ona meyl salmışdı..."** *– cümləsi ilə əvəz edilmişdir.*

*d. «Uca Allahın: «Səni şaşqın vəziyyətdə tapıb yol göstərmədimi?!» (Zuha, 93/7) ayəsinin anlamı» fəsli mündəricatda tamamilə yox idi.*

*e. «Təkcə Allah bəs edər» fəslinin mündəricatdakı tərtibi isə digərlərilə qarışıq salınmışdır.*

*5) Mətnin daxilindəki izahlar (red.), sətiraltı qeydlər isə, «R» rəmzi ilə işarələnmişdir.*

***Ramil Həsənov***

# *Tərcüməçinin qeydləri*

*Şükr və tərif Allaha məxsusdur, biz Ona şükr edir, Onu tərif edirik, Onu köməyə çağırır, Ondan bağışlanma diləyirik, nəfslərimizdəki şərlərdən, əməllərimizdəki bədxahlıqlardan qorunmaq üçün Allaha pənah aparırıq. Allahın haqq yoluna yönəltmiş olduğu şəxs yolunu azmaz. Allahın azdırdığı şəxs isə haqq yolunu tapmaz. Şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan tanrı yoxdur, Onun şəriki, tayı-bərabəri yoxdur. Şahidlik edirəm ki, Məhəmməd (sallallahu əleyhi və səlləm) Onun qulu və elçisidir.*

***«Ey iman gətirənlər! Allahdan layiqincə qorxun. Yalnız müsəlman olduğunuz halda ölün». (Ali-İmran, 102)***

***«Ey insanlar! Sizi tək bir şəxsdən xəlq edən, ondan zövcəsini yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! [**Adı ilə**] bir-birinizdən istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizin üzərinizdə gözətçidir!» (ən-Nisa, 1)***

***«Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin! [**Əgər belə etsəniz Allah**] əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə [**Cənnətə**] nail olar». (əl-Əhzab, 70-71)***

*Hörmətli oxucu! İslam alimi möhtərəm Məhəmməd Cəmil Zeynunun türk dilində nəşr edilmiş **«Quranı necə anlamalı?»** adlı son dərəcə qiymətli əsəri ilə yaxından tanışlıq məndə onu Azərbaycan dilinə çevirib xalqımızın cəfakeş və fədakar insanlarına çatdırmaq tələbi oyatdı. Mövzu, öz aktuallığı və ona olan ehtiyaca görə, məni ondan əvvəl nəzərdə tutduğum bütün digər planlarımı arxa cərgəyə keçirməyə vadar etdi.*

*Belə bir əsərin Azərbaycan dilinə tərcüməsi zəruri olduğu qədər həm də xeyli məsuliyyətli bir iş idi. M.C. Zeynunun «Quranı necə anlamalı?» əsəri indiyədək ana dilimizdə işıq üzü görməmiş mövzuya həsr edilmiş zəngin İslam xəzinəsinin nümunələrindən hesab edilə bilər. Kitabda özünəməxsus bir dillə Qurani Kərimin şərh və dərk edilməsi metodologiyası, üsulları və formaları əksini tapmışdır. Lakin mənim bir tərcüməçi kimi etdiyim qeydlərdən məqsəd heç də İslam aliminin əsərini oxuculara xülasə şəklində ərz etmək deyil, onun türk dilindəki nəşrinin bəzi xüsusiyyətlərini nəzərə çatdırmaqdır.*

*Çevirdiyimiz kitabın özəlliklərindən biri – türk dilində verilmiş Quran ayələrinin qarşılığının Azərbaycan dilində 2004-cü ildə bir sıra təshihlərlə nəşr edilmiş «Qurani Kərim»ə müvafiq verilməsidir. Adətən, Türkiyə nəşriyyatlarında Quranın müxtəlif tərcümələrindən və yaxud izahlı çevirmələrdən istifadə olunur ki, bu da bəzən ayələrin mətnlərində əhəmiyyətli fərqlərin olmasını şərtləndirir. Kitabın hansı dildən tərcümə edilməsinə baxmayaraq onun orijinalın incəliklərini, bütün çalarlarını verməsi əsas amillərdən biridir. Tərcüməmizdə bu xüsusiyyətləri saxlamaq üçün müxtəlif vasitələrdən və mənbələrdən istifadə etmişəm. İstifadə etdiyim məxəzlər, söz və terminlərə verdiyim izahlar (belələri müəllif və türk tərcüməçisi tərəfindən edilmədiyi hallarda) «Σ» rəmzi ilə göstərilmiş və sətiraltı qeydlərdə işarələnmişdir.*

*Allahın Elçisi və Peyğəmbəri Məhəmmədin (sallallahu əleyhi və səlləm) adı çəkilərkən, səhabələrin, İslamın digər görkəmli şəxsiyyətlərinin adları qeyd edilərkən ehtiram əlaməti olaraq qəbul edilmiş müəyyən ifadələrin işlədilməsini dilimizin tələblərinə uyğun olaraq vahid bir qaydaya salmaq üçün mən bu kitabda, kitabın türk mətnindəkindən fərqli olaraq, aşağıdakı sözləri hərflərlə işarə verməyi lazım saydım: məs. «Allah ona rəhmət etsin» - (A. r. e.); «Allah ondan razı olsun» - (A. r. o.). Məhəmməd*

*Peyğəmbərin (sallallahu əleyhi və səlləm) adının qarşısında isə «sallallahu əleyhi və səlləm» deyimini qısaltmadan eynilə saxlamağı məqsədəuyğun bildim.*

*Tərcüməmizdəki xüsusiyyətlərdən biri də mətndə gedən ayə və Peyğəmbər (sallallahu əleyhi və səlləm) hədislərinin fərqləndirilməsi üçün birinci* ***qalın kursiv şriftlə****, ikinci isə adi kursiv şriftlə verilmişdir.*

*Yuxarıda bildirdiyim kimi, Quran ayələri Z. Bünyadov və V. Məmmədəliyevin tərcüməsində verilmiş Qurani Kərimdən iqtibas edilib. Lakin burada bir incəliyi qeyd etmək yerinə düşərdi ki, bu, həm də türk dilindən İslam ədəbiyyatını tərcümə edən digər mütərcimlər üçün də maraqlı ola bilər. Türk dilində verilmiş Quran ayələrinin meal formasında işlənməsi (tərcüməçi bu zaman ayələri özünün məqbul saydığı izahlı tərzdə çevirir) onların adekvat, optimal tərcüməsini ehtiva etmir. Məhz bu xüsusiyyət Azərbaycan dilinə türk mətnini çevirərkən müəyyən çətinliklər yaradır. Bəzən isə məcburiyyət qarşısında qalıb mətnə, Azərbaycan dilindəki ayəyə müvafiq olaraq, bəzi təshihlər etmək lazım gəlmişdir. Əks təqdirdə ərəb müəllifinin mətni ilə ayələrin mətnində uyuşmazlıq üzə çıxır ki, bu da, təbii ki, orijinala deyil, müraciət etdiyimiz türk tərcüməsinin xətası kimi qəbul edilməlidir.*

*Mənim bu qeydləri beləcə ətraflı yazmaqda məqsədim ondadır ki, tərcüməmizi əldə edə bilib onu diqqətlə oxuyanlar, maraqlanıb türk, ərəb mətnlərinə də baxmaq istəyə bilərlər. Bax, məhz belə hallar üçün kitabın türk mətnində getmiş bir sıra kiçik qüsurları (əgər belə demək mümkünsə) göstərməklə onların məsuliyyətini özümüzdən uzaqlaşdırmaq istədim. Məsələn, kitabın 112-ci səhifəsində: «Təğabun» surəsinin 11-ci ayəsi 64-cü surədə getdiyi halda, səhvən 66-cı surə kimi göstərilmişdir. Eynilə 164-cü səhifədə əş-Şura surəsinin 22/52-ci ayəsi göstərilsə də, əslində bu 42-ci surənin 52-ci ayəsidir. 167-ci səhifədə aşağıdan 3-cü abzasda «Furqan», 25/3 göstərilir və ayə*

*verilir. Lakin Quranın nə türk və nə də Azərbaycan tərcüməsində məzmunca oxşar ayə yoxdur. Bütöv surə Azərbaycan dilində olan Qurani Kərimdə diqqətlə oxunduqdan sonra, iqtibasın 25-ci surənin 63-cü ayəsinin fraqmenti olduğunu müəyyənləşdirmək imkanı tapdım.*

*Kitabın 114-cü səhifəsində isə əksinə, surə (Ali-İmran, 3) düzgün verildiyi halda, ayə № 86 səhvən 76 sayla verilib; kitabın 141-ci səhifəsində (axırdan ikinci abzasın sonu) verilmiş ayə səhvən (46/24) göstərilmişdir. Əslində (45/24) göstərilməliydi və s.*

*Həmin yanlışlıqlar, deyək ki, texniki səhvlərdir. Lakin belə ciddi və samballı əsərlərdə bu cür nöqsanlara yol vermək İslam dini baxışlarının, prinsiplərinin yayılmasında, mənimsənilməsində sözsüz ki, az da olsa, müəyyən narahatçılıq törədə bilər, müxalif təbliğatçılara əlavə bəhanələr verə, mötəbər İslam mənbələrinin nəşr edilməsində səhihliyin gözlənilməsi səviyyəsinə şübhə oyada bilər.*

*Xüsusilə son dövrdə ərəb və türk dillərindən çevirmələr etməyə təşəbbüs göstərən bir sıra gənc tərcüməçilərin də mənim təsadüf etdiyim çətinliklərlə rastlaşması istisna edilmir. Bu, əsasən, türk frazeologiyasının, türk yazı qaydalarının, bəzən olduğu kimi Azərbaycan dilinə şamil edilib işlədilməsi ilə bağlıdır. Halbuki ana dilimiz olan Azərbaycan türkcəsinin zəngin və gözəl dil qaydaları, qanunauyğunluqları var. Onları qəlbən sevmədən, kifayət qədər bilmədən hər hansı mükəmməl bildiyin xarici dildən ona «tərcümə» etməyə qurşanmaq olmaz. İslam ədəbiyyatını xalqımıza onun öz dilində çatdırırıqsa, buyurub onun ahənginə, sintaksisinə, frazeologiyasına və digər özəlliklərinə hörmətlə yanaşılmalıdır. Təbii ki, burada söhbət puritanizmdən, dilimizdə yüzillərlə işlədilmiş, indi də işlənən və artıq çoxdan vətəndaşlıq hüququ qazanmış qeyri-türk söz və ibarələrin qovulmasından getmir. Dilimizə yeni söz*

*gətirməzdən öncə zəngin lüğət fondumuza müraciət etmək daha yaxşı olardı. Bu isə vətənsevərliyimizin bir nişanəsidir.*

*Tərcümə üçün istifadə etdiyimiz əsərin xarici ölkədə nəşr olunması, onda mövcud olan bir sıra anlaşılmazlıqları araşdırıb üzə çıxarmağı çətinləşdirir. Bu baxımdan mətndə olan bəzi nöqsanları islah etmək özü problemli olur. Öz təcrübəmizdə qarşılaşdığımız bəzi məqamları qeyd etmək yerinə düşərdi. "İnsanın cin və şeytanlardan qorunması" ( müəllif V. Ə. Bali) və «İnsanların əhəmiyyət vermədiyi haramlar və onlardan çəkinmə» (müəllif M. S. əl-Münəccid) adlı kitabları dilimizə tərcümə edərkən və digər hallarda da rastlaşdığım tipik, səciyyəvi xüsusiyyətləri burada açıqlamağımın tərcümə işi ilə məşğul olan qardaş və bacılarımız üçün də faydalı ola biləcəyini güman edirəm.*

*Bir qayda olaraq, ərəb dilindən çevrilmiş türk tərcümə əsərlərində elə hallar olur ki, orijinalın müəyyən hissələri verilmir (çıxarılır) və yaxud bölmələrin, bəndlərin, sətirbaşıların sıralanmasında ardıcıllıq açıq-aşkar pozulur. Məsələn, növbəti say əvəzinə ondan sonrakı rəqəm yazılır və s. İş orasındadır ki, bunun səbəbləri müxtəlif, təsadüfi və məqsədyönlü ola bilər, yəni ya xüsusi qəsdlə edilə, ya səhvən (mexaniki) baş verə və yaxud da nəşriyyatın rəsmi qərarına əsaslana bilər. Bütün bunların məsuliyyətini, aydındır ki, sonuncu tərcüməçi öz üstünə götürə bilməz. Vicdanlı tərcüməçi ikinci, üçüncü (və s.) dillərdən çevirdiyi əsəri, imkan daxilində, müvafiq dilləri və fənləri bilənlərin yardımı ilə dəqiqləşdirmələr aparmalı və onu orijinala mümkün qədər adekvat şəklə salmalıdır. Mən həm bu və həm də digər tərcümlərimdə bu gerçək prinsipə riayət etməyi Allah qarşısında özümə borc bilirəm.*

*Bir-neçə vacib məsələyə toxunmamaq da mümkün deyil. Bunlar türk nəşrlərindəki iqtibaslarla (sitatlarla) bağlıdır. Türk naşirləri və tərcüməçiləri, nəinki tərcüməçiləri, hətta bəzi təfsirçilər də, iqtibasların mətində verilməsinə olduqca sərbəst yanaşır, ayələri verərkən onların tamlığını*

*və ya fraqmentarlığını göstərmirlər. Bu, mənə elə gəlir ki, türk qardaşların tərcümə etdikləri orijinallarda de eyni səpgidədir. Göstərilir ki: "filan ayə"dir. Əslində isə, bu çox vaxt ayənin ancaq bir fraqmenti olur. Fraqmentar iqtibasın verilməsi qaydası artıq çoxdan dilçilik qaydalarına uyğun rəsmiyyətə salınmışdır (çatmayan hissə üç nöqtə ilə işarələnir ki, oxucu da ayənin və ya hər hansı bitmiş bir cümlənin natamam olduğunu, baxan kimi, yəqinləşdirə bilsin. Məsələn, kitabın türk mətninin 63-cü səhifəsində 1 və 2 saylı sətiraltı qeydlər verilmişdir. Bundan sonra ta 137-ci səhifəyədək sətiraltı qeydlər yoxdur. Lakin 138-ci səhifədə 2 № li sətiraltı qeyd verilmişdir. Bu isə qeydlər sırasının nömrələnməsinin müəyyən qaydalara uyğun olmadığını göstərir.*

*Bəzi hallarda müəllifin şərh etdiyi ayənin fraqmentinin mənim tərəfimdən sətiraltı qeydlərdə tam mətində verməyimdən məqsəd (bax: Σ138) Allahın müqəddəs buyruğunun kontekstdə tam mənada dərk edilməsindən ötrüdür.*

*Aydın məsələdir ki, bir tərcüməçi kimi, məqsədim heç də bu istiqamətdə geniş izahat vermək deyil, məhz kitabın mətni üzrə onun mahiyyətini doğru-düzgün anlamaq üçün bəzi qeydləri oxuculara çatdırmaqdır. Bu baxımdan, bir qeydi etməyə bilmərəm. Axırıncı gətirəcəyim nümunə:* ***"Baldırın açılacağı o gündə…" (Qələm, 68/42)*** *ayəsinə aiddir. Bu ayənin fraqmenti kitabda türk dilində verilmiş variantın tərcüməsidir. Türk variantını tərcümə etməyimin səbəbi isə ayənin Azərbaycan dilində olan Qurani Kərimdəki ayəylə adekvat olmaması idi. Bu ayəni əvvəlcə bəyan etdiyimiz sistem üzrə çevirmiş olsaydıq, müəllifin mətninə anlaşılmazlıq gətirilmiş olardı ki, bu da qətiyyən yolverilməzdir. Bu və digər türkdilli kitablarda belə hallar nadir deyil.*

*Qüsurlardan və səhvlərdən Uca Allaha sığınıram!*

*Daha sonra, iri mətn parçalarında saysız-hesabsız işarə və şəxs əvəzliklərinin bir cümlədə, təkrar-təkrar və «bolluca» işlədilməsi müəllifin əsil niyyətinin anlaşıqlığını dumanlandırır və son dərəcə mürəkkəbləşdirir. Türk dilində bu hallar təbii qəbul olunsa da, Azərbaycan dilinin lüğət tərkibi, frazeoloji vahidləri və bir sıra digər üstünlükləri imkan verir ki, bu ibtidai forma tərzindən qaçınaq və Ana dilimizin bənzərsizliyini imkan daxilində nümayiş etdirək.*

***Fərahim Sələfi***

## *Bismilləhirrahmənirrahim!*

*Şübhəsiz ki, həmd Allaha məxsusdur. Ona həmd edir, Ondan yardım istəyir, bağışlanmaq diləyirik. Nəfslərimizin şərindən, əməllərimizin pisliklərindən Allaha sığınırıq. Allahın doğru yola yönəltdiyini kimsə o yoldan çıxarda bilməz. Onun yoldan çıxartdığını da kimsə düz yola qaytara bilməz.*

*Şahidlik edirəm ki, Allahdan başqa heç bir tanrı yoxdur. O, bir və təkdir. Onun şəriki yoxdur. Yenə şahidlik edirəm ki, Məhəmməd Onun qulu və elçisidir.*

*Uca Allah Qurani Kərimi bəşəriyyətə onu başa düşsünlər, üstündə yaxşıca düşünsünlər və lazımınca əməl etsinlər deyə endirmişdir. Uca Allah belə buyurur:*

***"…onun ayələrini düşünüb dərk etsinlər və ağıl sahibləri də** [ondan] **ibrət alsınlar!" (Sad, 38/29)***

*Yenə də, Uca Allah bu Kitabdan faydalanmaq istəyən kimsələrə onu başa düşməyi asanlaşdırmışdır. O belə buyurur:*

***"And olsun ki, Biz Quranı** [ondan] **ibrət almaq, öyüd-nəsihət qəbul etmək üçün belə asanlaşdırdıq. Amma hanı ibrət alan, öyüd-nəsihət qəbul edən?!" (Qəmər, 54/17)***

*Uca Allah bu Kitabı ərəbcə nazil etmişdir ki, ərəblər onu ağılla dərk etsinlər, ona iman gətirsinlər, onu digər millətlər arasında təbliğ etsinlər:*

***"**[Ey Məkkə əhli!] **Biz onu ərəbcə bir Quran olaraq nazil etdik ki, bəlkə,** [mənasını] **anlayasınız" (Yusif, 12/2)***

*Quranı anlaya bilmək bəzən onun təfsirini də açıqlamağı zəruriləşdirir. Xüsusilə, təfsir edilməsi və açıqlanması lazım gələn bəzi ayələrdə bu vacibdir.*

*Mən oxucuya Qurani Kərimi anlamağa və açıqlamağa yardımçı ola biləcək tərzdə təfsirin bəzi növlərini əsas götürəcəyəm. Daha sonra, təfsirinə və açıqlamasına ehtiyac duyulan bir sıra ayələrin xülasə şəklində şərhini verəcəyəm. Bunu edərkən zamana bağlılıqla birgə təfsirçilərin bəyənilən baxışlarını araşdıracağam.*

*Allahdan bu zəhmətimlə müsəlmanları faydalandırmasını və onu Öz səxavətli sifəti xatirinə ixlaslı etməsini arzulayıram.*

***Məhəmməd b. Cəmil Zeynu***
***Məkkəyi-Mükərrəmə şəhəri,***
***Dərul hədis əl-Xeyriyyə***
***Mərkəzində müəllim***



# *TƏFSİRİN NÖVLƏRİ*

## *Quranı Quranla təfsir etmək*

*Quranın Quranla təfsir edilməsi müxtəlif təfsir növlərinin ən üstünüdür. Çünki Quranın bir hissəsi başqa bir hissəsinə aydınlıq gətirir.*

*1. Buna misal Uca Allahın bu buyruğudur:*

***"And olsun göyə və gecə gələnə*[Σ1]*! Sən nə bilirsən ki, gecə gələn nədir?! O, parlaq ulduzdur!" (Tariq, 86/1-3)***

*Burada "O, parlaq ulduzdur" ifadəsi "gecə gələnin" nə olduğunu aydınlaşdırır.*

*2. Bir başqa misal Uca Allahın bu buyruğudur:*

***"Səndən içki və qumar haqqında sual edənlərə söylə: "Onlarda həm böyük günah, həm də insanlar üçün mənfəət vardır. Lakin günahları mənfəətlərindən daha böyükdür…" (Bəqərə, 2/ 219)***

---

[Σ1] Yəni, *(Gecə peyda olub, gündüz qeyb olana),* Qurani-Kərim (Z.M. Bünyadovun və V.M. Məmmədəliyevin tərcüməsində), Bakı, səh. 590. "Quranı necə anlayaq" əsərinin Azərbaycan dilinə edilən bu tərcüməsində bilavasitə ayələrin mətnilə bağlı (yuxarıdakı nəşrdə verilmiş) əlavə izahlar oradan iqtibas edilir (Yığcamlıq üçün Azərbaycan dilindəki bu tərcümə qısaca: (Z.B. və V.M.) işarəsi ilə göstəriləcək) Bundan sonra Azərbaycan dilinə tərcümə edənin qeydləri və araşdırmaları ([Σ]) rəmzi (və müvafiq sıra nömrələri) ilə sətiraltında işarə ediləcəkdir. Əsərin müəllifinin və türk tərcüməçisinin qeyd və izahları isə onların adıyla göstəriləcək.

*Bir başqa ayədə isə qeyd-şərtsiz olaraq içki barəsində varid olan günahın haram edildiyi bildirilir. Bu da Uca Allahın aşağıdakı buyuruğudur:*

***"De ki,"Rəbbim yalnız aşkar və gizli alçaq işləri, hər cür günahı, haqsız zülmü… haram buyurmuşdur" (Əraf, 7/33)***

***"Günah (ism)"-*** *(«sə» hərfi ilə yazılan - red.) onu qazanmağa səbəb olan hər cür asiliyi özündə ehtiva edir. Xüsusilə, meyin (şərabın) günah mənasını daşıdığı da söylənilir. Şairin aşağıdakı beytində bu məna vardır:*

*«Ağlım çaşanadək içdim şərabı və o beləcə də apardı ağlı».*

*Bununla belə, "ism (günah)" sözünün yalnız şərab olması kimi işlədilməsinə dair hər hansı bir sübut tapılmayıb. Hərçənd, o, barəsində "günah" deyilməsi mümkün olan məsiyyətlərdən*[Σ2] *biridir.*

*əs-Sihah adlı lüğətdə belə deyilir: Bəzən də xamra (şəraba) ism (günah) deyilir (Bax: əş-Şəvkani, Fəthul-qadir-II, 200)*

*3. Bir başqa misal Uca Allahın aşağıdakı buyruğudur:*

***"Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər" (Yunus, 10/62)***

*Bu ayədəki "vəlilər"*[Σ3] *kəlməsi* ***"O kəslər ki, iman gətirmiş və pis əməllərdən çəkinmişlər…" (Yunus, 10/63)*** *ayəsi ilə təfsir edilmişdir.*

*Bu şərh, yəni Uca Allahın Özünün etdiyi təfsir "vəli qeybi bilən və yaxud bir sıra kəramətlərə malik olan və yaxud da qəbri üstə qübbə tikilmiş ya da ki, buna bənzər*

---

[Σ2] Məsiyyət – günah.

[Σ3] Vəli – dost deməkdir.

*batil inancların haqqında bəhs etdiyi şəxsdir" deyənlərin nəzər nöqtələrini birmənalı şəkildə rədd edir.*

*Buna görə, Allahın əmrlərinə itaət edən və Allahın haramlarından çəkinən hər bir mömin Allahın vəliləri sırasındadır. Kəramət isə vəli sayılmaq üçün bir şərt deyildir. Həmən kəramət bəzən aydın görünə, bəzən də gizli qala bilər.*

*Bəzi sufilər və bidətçilər tərəfindən bir sıra qeyri-adi şeylər nümayiş etdirilir. Bu isə Uca Allahın:* ***"…ona***[Σ4] ***elə gəldi ki, onların sehri nəticəsində kəndirləri hərəkətə gəlib sürünür" (Taha, 20/66)*** *buyurduğu ayədə bildirilən sehrlər qəbilindəndir.*

*Buna bənzər işlər Hindistanda və başqa ölkələrdə atəşpərəstlər tərəfindən də nümayiş etdirilir.*

*4. Digər bir misal: Abdullah b. Məsud (A. o. r.) demişdir ki, Uca Allahın:*

***"İman gətirib imanlarını zülmə qatışdırmayanlar əmin-amanlıqdadırlar…" (Ənam, 6/82)*** *ayəsi nazil olduqda bu müsəlmanlara ağır gəldi və dedilər ki, hansı birimiz öz nəfsinə zülm etmir ki? Buna cavab olaraq Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur: "Xeyir, belə deyil. Nəzərdə tutulan şey şirkdir. Siz Loğmanın oğluna:*

***«Oğlum! Allaha şərik qoşma. Doğrudan da, Allaha şərik qoşmaq böyük zülmdür!» (Loğman, 31/13) -*** *dediyini eşitməmisinizmi?" (Buxari və Muslim)*

*Hafiz İbn Həcər Fəthul-Bəridə: "Qarışdırmayanlar – qatmayanlar, bulaşdırmayanlar deməkdir" deyir.*

*Bu ayə ilə hədisin ifadə etdiyi xüsusiyyətlər aşağıdakılardır: Zülmün dərəcələri bir-birindən fərqlidir.*

---

[Σ4] Musaya (ə) işarədir.

*Günahlara "şirk" deyilmir. Allaha heç bir şeyi şərik qoşmayan hər bir şəxsin təhlükəsizliyi təmin olunur və o doğru yola çatmış adamdır (Bu açıqlamanı Hafiz İbn Həcər Fəthul-Bəridə vermişdir).*

*5. Uca Allah belə buyurmuşdur:*

***"Həqiqətən, insan çox həris*[Σ5] *yaradılmışdır!" (Məaric, 70/19)***

*Bu ayənin təfsiri belə verilmişdir:*

***"Ona bir pislik üz verdikdə fəryad qopardar. Ona bir xeyir nəsib olduqda isə xəsis olar" (Məaric, 70/20-21)***

*6. Uca Allah belə buyurmuşdur:*

***"Adəm Rəbbindən bəzi xüsusi kəlmələr öyrənərək*[Σ6] *tövbə etdi. O, tövbələri qəbul edəndir və mərhəmətlidir" (Bəqərə, 2/37)***

*Burada Allahın bildirdiyi kəlmələrin təfsiri yenə də Uca Allahın:*

***"…Ey Rəbbimiz! Biz özümüzə zülm etdik…" (Əraf, 7/23)*** *buyrduğundakı kimi şərh edilir.*

*7. Uca Allah bir başqa yerdə belə buyurmuşdur:* ***"Siz*** *[ey insanlar!]* ***üç zümrəyə ayrılacaqsınız…" (Vaqiə, 56/7)***

*Burada əsas məsələ olan "üç zümrə"nin təfsiri Uca Allahın aşağıdakı ayələrində verilmişdir:*

***"Sağ tərəf sahibləri. Kimdir onlar?!*[Σ7] *Sol tərəf sahibləri. Kimdir onlar?!*[Σ8] *Və bir də öndə olanlar, öndə olanlar!*[Σ9] *(Vaqiə, 56/8-10)***

---

[Σ5] Tamahkar və kəmhövsələ

[Σ6] Həvva ilə birlikdə o kəlmələr vasitəsilə

[Σ7] Onların əməl dəftərləri sağ əllərinə veriləcək, mələklər onları sağ tərəfə – Cənnətə dəvət edəcəklər. Xoş onların halına!

[Σ8] Onların əməl dəftərləri sol əllərinə veriləcək, özləri də sol tərəfə – Cəhənnəmə sürüklənəcəklər. Vay onların halına!
[Σ9] Cənnətin ən yüksək təbəqələri onlara məxsusdur. Mühacirlər və ənsar bu zümrəyə daxildir. Onlar necə də xoşbəxtdirlər!

## *Qurani Kərimin səhih hədislə təfsiri*

*Quranın səhih hədislə təfsiri olduqca əhəmiyyətlidir. Çünki Allahın Peyğəmbəri (sallallahu əleyhu və səlləm) Allahın məqsədinin nə olduğunu bütün insanlardan daha yaxşı bilir. O, Uca Allahın Özü haqqında buyurduğu kimidir:* ***"O, kefi istəyəni danışmır. Bu, ancaq*** *[Allah dərgahından]* ***nazil olan bir vəhydir" (Nəcm, 53/3-4)***

*Uca Allah bu Kitabı Ona (sallallahu əleyhi və səlləm) insanlara izah edib çatdırması üçün göndərmişdir:* ***"…Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni*** *[hökmləri, halal-haramı]* ***izah edəsən və bəlkə, onlar da düşünüb dərk edələr!" (Nəhl, 16/44)***

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) də belə buyurmuşdur: "Bunu da bilin ki, mənə Quran və onunla birgə onabənzəri də verilmişdir" (Hədis səhihdir. Əbu Davud)*

*1. Buna misal: Uca Allah buyurur ki:*

***"… kafirlərə qarşı bacardığınız qədər qüvvə və döyüş atları tədarük edin…" (Ənfal, 8/60)***

*Ayədəki "qüvvə" kəlməsinin təfsiri Allahın Peyğəmbəri (sallallahu əleyhi və səlləm) tərəfindən üç dəfə təkrar edilərək: "Xəbəriniz olsun ki, qüvvə atmaqdır"- deyə, buyurmuşdur (Muslim)*

*Qurtubi deyib ki, qüvvənin ox atmaqdan başqa həm də bir sıra hərbi ləvazimatın hazırlanması ilə başa gəlməsinə baxmayaraq Peyğəmbərin (sallallahu əleyhi və səlləm) qüvvəni (ox) atması ilə izah etməsi oxatmanın düşmənə daha ağır itkilər verməsinə, hazırlanmasının daha asan olmasına işarədir. Çünki bəzi hallarda ordunun komandanı ox atəşinə tutulduqda qorxuya düşürsə, onun ardıyca gedən*

*döyüşçülərin də səfləri pozulur və pərən-pərən olurlar. (Bu açıqlamanı Hafiz Fəthul-Bəridə vermişdir)*

*İndi də belə müasir döyüş vasitələrinin təsiri onların atəş imkanları ilə bağlıdır. Buna görə, İslam gəncləri xüsusilə atıcılıq peşəsinə yiyələnmək ruhunda tərbiyə etmişdir. Yaxşı olardı ki, bunlarla məşğul olmaqdan özlərini uzaq tutan və digər kütləvi oyunlara həvəs göstərənlər atıcılığı və onunla bərabər üzgüçülüyü öyrənəydilər. Allahın Peyğəmbəri (sallallahu əleyhi və səlləm) buyurmuşdu ki:*

*"Kim ki, ox atmağı öyrənərək sonra onu unudarsa, bizdən deyil (ya da asi olmuşdur)" (Muslim)*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) əsləmlilərdən bir-biriləri ilə oxatma yarışına çıxan bir dəstənin yanından keçərkən belə buyurmuşdur:*

*"Ey İsmail oğulları, ox atın. Çünki sizin atanız oxatan idi. Ox atmaqla məşğul olun və mən filankəsin oğulları ilə birlikdəyəm. (Hədisin ravisi) deyir ki, bundan sonra iki tərəfdən biri ox atmağı dayandırdı. Allahın Peyğəmbəri (sallallahu əleyhi və səlləm): Niyə bəs ox atmırsınız – deyə, soruşduqda, belə cavab verdilər: Sən onlarla birlikdə olduğun halda, biz necə ata bilərik? Onda Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurdu: "Tez olun ox atın. Mən hamınızla birlikdəyəm" (Buxari)*

*2. Uca Allah belə buyurmuşdur:*

***"Rəbbiniz buyurdu: "Mənə dua edin, Mən də sizin dualarınızı qəbul edim!***[Σ10] ***Mənə ibadət etməyi təkəbbürlərinə sığışdırmayanlar Cəhənnəmə zəlil olaraq girəcəklər!" (Mumin, 40/60)*** *Burada "Mənə ibadət" mənə dua et mənasındadır.*

---

[Σ10] Məni çağırın, harayınıza yetişərəm, yaxud yalnız Mənə ibadət edin, sizi mükafatlandıraram!

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) də buradakı "ibadət" sözünü təfsir edərək belə buyurmuşdur: "Dua ibadətin lap özüdür" (Tirmizi rəvayət edərək onu yaxşı və səhih adlandırmışdır)*

*3. Bir başqa misal Uca Allahın aşağıdakı buyruğudur:*

***"Yaxşı işlər görənləri Cənnət və daha artıq mükafatlar*[Σ11] *gözləyir…" (Yunus, 10/26)***

*Allahın Peyğəmbəri (sallallahu əleyhi və səlləm) "daha artıq" ifadəsi barədə: "Uca Allah bu buyruğu ilə Allahın camalına tamaşa etməyi nəzərdə tutur" – deyə, təfsir etmiş və sonra buyurmuşdur:*

*"Buna görə (Rəbb) hisabını açacaq. Onlara Rəblərinə baxmaqdan daha çox arzulaya biləcəkləri hər hansı bir şey qismət edilməmişdir". Sonra isə bu:*

***"Yaxşı işlər görənləri Cənnət və daha artıq mükafatlar gözləyir…" (Yunus, 10/26)*** *ayəsini oxudu (Muslim)*

*4. Digər bir misal: Uca Allah buyurur ki:* ***"Baldırın açılacağı o gündə…" (Qələm, 68/42)*** [Σ12]*.*

*Buxari təfsir bölməsində bu ayə ilə bağlı olaraq aşağıdakı hədisi qeyd edir: Allahın Peyğəmbəri (sallallahu əleyhi və səlləm) buyurdu ki: "Rəbbimiz baldırını açacaq, bütün kişi və qadın möminlər Ona səcdə edəcək. Dünyada özünü kiməsə göstərmək və eşitdirmək üçün səcdə edən şəxslər isə eləcə də yerlərində quruyub qalacaqlar. Səcdəyə getmək istədikdə kürəkləri quru taxta parçasına dönəcəkdir" (Buxari, VI, 72)*

*Bu açıqlamalara görə Allahı yaradılmışlara bənzətmək (təşbih etmək) və ya Ona hər hansı maddi varlıq*

---

[Σ11] Allahın camalına tamaşa etmək.

[Σ12] Bu ayə, burada istisna olaraq, kitabın türk dilindəki mətninin iqtibasından tərcümə edilmişdir.

*formması vermək (təcsim etmək) yaramaz. Çünki* ***"…Ona bənzər heç bir şey yoxdur…" (Şura, 42/11)*** *Bu səbəb üzündən Sünnə və cəmaat əhli Uca Allahın Öz zatı haqqında bəhs etdiyi əllər, üz, eşitmək, görmək kimi sifətləri Peyğəmbərin (sallallahu əleyhi və səlləm) Ona aid etdiyi baldır, barmaqlar və ayaq kimi vəsfləri Uca Allahın zatına və cəlalına yaraşan bir şəkildə qəbul edər və lakin, biz bunların necə olduğunu bilmərik deyərlər.*

## *Hədisin Qurana görə yeri*

*1. Hədis Qurani Kərimdəki hökmlərə müvafiq olur. Bu vəziyyətdə Quran və hədisdə əksini tapmış hökmlər dəlillərin eyni mövzu ətrafında ardıcıllıqla dayanaraq bir-birini təsdiq edir. Məsələn, namaz qılmaq, zəkat vermək, ramazan orucunu tutmaq, Allah Evini ziyarət etmək kimi məsələlər buraya daxildir. Eyni formada, Allaha şərik qoşmağ, yalan şahidlik etməyi, ata-anaya qarşı çıxmağı qadağan etmək, Allah yolunda mübarizə və bir sıra başqa məsələlər də bu qəbildəndir.*

*2. Hədis Qurani Kərimdə verilmiş bir hökmü bəyan və ya izah edən ola bilər. Məsələn, namaz vaxtlarının, rükət saylarının, zəkatın ölçüsü və vaxtının, zəkatı verilən şeylərin açıqlanması. Oruc və həcc ibadətlərinə dair hökmlər və Qurani Kərimdə yığcam (qısa və dolğun ifadələrlə) verilmiş digər oxşar hökmlər də belələrindəndir.*

*3. Hədis Qurani Kərimin toxunmadığı bir hökmü təsbit edə bilir. Məsələn, qadının bibisi və ya xalası ilə birgə nikahlanmasının haram edilməsi, yırtıcı heyvanlardan köpək dişi olanlarının, quşlardan isə caynaqlı olanlarının ətinin haram edilməsi və bunlara bənzər Sünnənin özünün qanunileşdirdiyi digər hökmlər də buraya daxildir.*

*4. Hədisin Qurandakı ümumi ifadələri dəqiqləşdirməsi. Məsələn, oğrunun əlinin haradan kəsiləcəyinin izah edilməsi.*

*5. Qurandakı anlayışların hədislə açıqlanması. Məsələn, oğrunun əlini kəsməyi zəruri edən oğurlanmış şeyin miqdarının təyin edilməsi.*

## *Quranın səhabələrin sözləri ilə təfsiri*

*İbn Abbas, İbn Məsud və daha bir sıra başqa əshabi kiramın təfsirləri olduqca böyük əhəmiyyət kəsb edir. Çünki onlar Peyğəmbərə (sallallahu əleyhi və səlləm) yoldaş olmuş, elmi Ondan öyrənmişlər.*

*1. Məsələn, Uca Allahın* ***"Rəhman ərşə ucaldı" (Taha, 20/5)*** [Σ13] *buyruğu ilə əlaqədar olaraq Hafiz İbn Həcər Fəthul-Béridə bunları söyləyir: Sünnəni canlandıran imam Bəğəvinin İbn Abbasdan və təfsirçilərin bir çoxundan rəvayət etdiyinə görə, bunun (istiva istilahının) anlamı – «yüksəldi» deməkdir.*

*Sonra isə Um Sələmə, Rabiə, Malik və başqalarının aşağıdakı sözləri nəql edilmişdir:*

*"İstiva naməlum bir şey deyildir. Lakin necə olduğunu ağılla dərk etmək mümkün deyil. Bunu qəbul etmək imandır. Onu inkar isə küfrdür" (Fəthul-Bəri, 13/406)*

*2. Digər bir misal isə Üca Allahın* ***"… yaxud qadınlara toxunmuş olduqda…" (Nisa, 4/43)*** *buyruğudur.*

*İbn Kəsir öz Təfsirində bu barədə İbn Abbasın: "Məqsəd cimadır*[Σ14]*, dediyini rəvayət etmişdir.*

*Yenə də İbn Abbas belə demişdir: Toxunma, məss (əl vurmaq) və bədənlərin bir-birinə dəyməsi cinsi əlaqədə olma anlamını bildirir. Lakin Uca Allah anlayışlara istədiyi adı verir.*

---

[Σ13] Əsərin türk dilindəki tərcüməsində bu ayə ***"Rəhman ərşə istiva etdi"*** (yəni, ucaldı) kimi verildiyindən, onun təfsiri də həmin tərcüməyə müvafiqdir. Bu həm forma və həm də məzmunun yaxınlığı baxımından Azərbaycan tərcüməsinə (Z.B. və V.M.) az uyğun olduğuna görə, ayənin türk tərcməsi tərəfimizdən sərbəst çevrilmişdir.

[Σ14] Cinsi əlaqənin olması

*İbn Kəsir deyib ki, Abdullah b. Abbasdan bu sözlərin bir-neçə yolla səhih olaraq söyləndiyi rəvayət edilmişdir.*

*Daha sonra İbn Məsudun: "Toxunma (əl vurma), cima deyil" şəklində öz sözünü bildirmişdir.*

*Ondan sonra İbn Kəsir öz təfsirində İbn Cəririn aşağıdakı şərhini qeyd etmişdir:*

*"Bu məsələ haqqında iki nəzər nöqtəsindən həqiqətə daha yaxın olanı, Uca Allahın:* ***"… yaxud qadınlara toxunmuş olduqda…" (Nisa, 4/43)*** *buyruğunda əl vurmanın bütün mənaları kənara qoyularaq, ancaq "cinsi əlaqədə olma nəzərdə tutulmuşdur" deyənlərin sözləridir. Çünki Allahın Elçisinin (sallallahu əleyhi və səlləm) xanımlarından birisini opdükdən sonra dəstəmaz almadan namaz qıldığına dair xəbər səhihdir (İbn Kəsir, 1, 502)*

*Hədisin bir ayə ilə bağlı təfsiri səhabələrdən və ya tabeinlərdən birinin təfsiri ilə ziddiyyət təşkil edərsə, hər iki təfsiri bir-biriləri ilə tutuşdurub oxumalıyıq. Ona imkan olmadıqda, etməli olduğumuz şey, Peyğəmbərin (sallallahu əleyhi və səlləm) təfsirini başqalarının təfsirindən (onlar kim olursa olsun) üstün tutmaqdır. Çünki Peyğəmbər (sallallahu əleyhi və səlləm) Allahın məqsədini başqalarından daha yaxşı bilir. Özündən danışmayan təkcə Odur. Xüsusilə, Uca Allah belə buyurmuşdur:*

***"Ey iman gətirənlər! Allahın və Peyğəmbərinin qabağına keçməyin…" (Hucurat, 49/1)***

*Bu, sözlə və ya əməllə qabağa keçməyin deməkdir. İzahı İbn Kəsir vermişdir.*

*Buna misal aşağıdakı ayə göstərilə bilər. Uca Allah buyurur ki:* ***"Baldırın açılacağı o gündə…" (Qələm, 68/42)*** [Σ15]

---

[Σ15] Bax: [Σ13]

*Bu ayəni Buxari aşağıdakı hədislə təfsir edir:*

*"Rəbbimiz baldırını açacaq, kişili-qadınlı bütün möminlər Ona səcdə edəcəklər…" (Buxari və Muslim)*

*İbn Abbasın da bu ayənin təfsiri ilə bağlı belə dediyi rəvayət edilir: "O çox böyük kədər və sıxıntı günüdür" (İbn Abbasın bu nəzər nöqtəsinin zəif olduğunu Səlim əl-Hilali, əl-Mənhəlur-Raqraq adlı əsərində bildirir. Çünki rəvayətlər bir-biri ilə uyğun gəlmirlər.*

*Elə buna görə, əgər ondan gələn bu hekayə mötəbərdirsə, şərif ayəni hər hansı bir bənzətmənin (təşbih) müzakirə mövzusu etmədən "Allahın ayağı" deyə… təfsir edən hədislə bir ziddiyyəti yoxdur. Rəbbimiz qiyamət günündə ayağını açacaqdır və o gün çətin və qəmli bir gün olacaqdır.*

*Deyilə bilər ki, ola bilsin ayəni təfsir edən Əbu Səid əl-Xudrinin rəvayət etdiyi bu hədis İbn Abbasa çatmamışdır. Belə ki, Səhihdəki sabitliyinə görə Əbu Musa içəri girmək üçün Ömərdən (A.o.r.) üç dəfə icazə istəsə də, o cavab almayaraq geri dönüb çıxıb getmişdir. Sonra isə Ömər: Mən Abdullah b. Qeysin icazə istəyən səsini eşitmədimmi? Ona icazə verin deyirdi. Onu axtardıqda, getmiş olduğunu bildilər. Daha sonra Əbu Musa gəldikdə Ömər ona: Niyə qayıdıb getdin? – deyə soruşdu. Əbu Musa belə demişdi: Mən üç dəfə icazə istədiyim halda, mənə izn verilmədi. Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurarkən eşitmişəm:*

*"Hər hansı biriniz üç dəfə icazə istədiyi halda ona izn verilməzsə, geri qayıtsın".*

*Buna cavab olaraq Ömər (A.o.r.) dedi ki, ya buna dair mənə bir sübut gətirəcəksən, ya da canını ağrıdacaq qədər səni döyəcəyəm. Əbu Musa ənsarlardan olan bir dəstə adamın yanına getdi. Onlara Ömərin (A.o.r.) dediklərini başa*

*saldı. Onlar da belə söylədilər: Sənin xeyrinə (nəinki böyüklərimiz) lap kiçiklərimiz də şahidlik edəcək. Onunla birlikdə Əbu Səid əl-Xudri də qalxdı və Ömərə (A.o.r.) bunu bildirdi. O isə belə dedi:*

*Bazar-dükanda alışverişlə məşğul olduğumdan bunu eşitməmişəm (Buxari və Muslim)*

*İbn Abbasa:*

*"Əbu Bəkir və Ömər ikisi də (A.o.r.) ifrad həccinə getdilər" deyilincə, belə söyləmişdir:*

*Mənim bildiyimə görə (mənə bu tərzdə etiraz edənlər) həlak olacaqlar. Çünki mən Peyğəmbərin dediyini deyirəm, onlarsa: "Əbu Bəkir və Ömər demişdir" deyirlər (Əllamə Əhməd Şakir səhih olduğunu bildirmişdir).*

## *Tabeinlərin sözləri ilə Quranın təfsiri*

*Qurani Kərimin tabeinlərin sözləri ilə təfsir edilməsi də eynilə çox əhəmiyyətlidir. Çünki onlar bu bilikləri Peyğəmbərdən (sallallahu əleyhi və səlləm) öyrənmiş möhtərəm səhabələrdən almışlar.*

*Mücahid b. Cəbr demişdir ki, mən Qurani Kərimi İbn Abbasa üç dəfə başdan axıradək söylədim. Hər bir ayənin sonunda dayanır və onun nəyin barəsində nazil edildiyini və onunla bağlı nələrin olduğunu soruşurdum.*

*Səid b. Cübeyr, İbn Abbasın azad etdiyi İkrimə, Ata b. Əbi Rabəh, Həsən əl-Bəsri, Məsruq b. əl-Əcdə, Səid b. əl-Museyyib, Qatadə, əd-Dahhak b. Muzəhim və tabeinlərdən olan başqalarının da vəziyyəti belədir.*

*1. Buna misal olaraq Buxarinin tövhid bəhsində verdiyi bu rəvayəti göstərə bilərik:*

*Əbul-Aliyə demişdir ki:* ***"Sonra səmaya istiva etdi" (Bəqərə, 2/29)*** *Yəni yüksəldi (Buxari, VIII, 175)*

*Mücahid isə: "İstiva – ərşin üstünə yüksəldi deməkdir" söyləmişdir (Buxari, VIII, 175)*

*Təbəri isə bir çox nəzər nöqtələrini qeyd etdikdən sonra "istiva" sözünü yüksəltmək kimi təfsir edərkən bunları deyir:*

*Uca Allahın:* ***"Sonra səmaya istiva etdi"*** *buyruğu – "Uca Allah səmaların (göylərin) üzərinə yüksəldi, qüdrəti ilə onları bərqərar etdi və onları yeddi səma formasında yaratdı" deməkdir.*

*Təbəri öz təfsirində ər-Rabi b. Ənəsdən:* ***"Sonra səmaya istiva etdi"*** *buyruğu barəsində bunları söylədiyini rəvayət edir: Səmaya yüksəldi deməkdir (Təbəri, VIII, 175)*[1]*.*

*2. Uca Allah belə buyurmuşdur:* ***"Növbənöv meyvələr və ot, ələf yetişdirdik" (Əbəsə, 80/31)***

*Dahhak demişdir ki, meyvədən başqa yerdə qalan hər şey "əbb"dir. O da ot deməkdir ki, heyvanların yediyi yem mənasını verir.*

## *Quranın ərəb dilinə görə təfsiri*

*Quranın ərəb dilinə uyğun olaraq təfsir edilməsi də əhəmiyyət kəsb edir. Çünki Uca Allah:* ***"Biz onu ərəbcə bir Quran olaraq nazil etdik ki, bəlkə, anlayasınız" (Yusif, 12/2) –*** *deyə buyurur.*

---

[1] Bu yerin mənbə olaraq göstərilməsi səhvdir. Çünki göründüyü kimi bundan əvvəlki mətndə Buxariyə aid (VIII, 175) verilən cild və səhifə nömrəsi eynilə təkrarlanmışdır. Buxarinin Təbəridən belə bir rəvayət götürməsinə imkan olmayıb. Bu ifadələr Təbərinin təfsirində verilmişdir (Təbəri təfsiri, Darul-Fikr, 1408/1988 tarixli nəşr, I, 191) Çevirən.

*1. Buna misal olaraq Hafiz İbn Həcərin Fəthul-Bəridə İbn Battaldan rəvayət etdiyi aşağıdakı şərhləri göstərə bilərik:*

*"Burada, yəni:* ***"Sonra səmaya istiva etdi" (Bəqərə, 2/29)*** *ayəsində getmiş "istiva"-nın mənası haqqında bir-birindən fərqlənən nəzər nöqtələri mövcuddur.*

*Mötəzilə tərəfdarları bunun qəhr etmək və qalib gəlmək yolu ilə işğal etmək mənasını verdiyini söyləmişlər və bir şairin aşağıdakı beytini dəlil kimi göstərmişlər:*

*"Bişr İraqa istiva etdi*

*Qələbəyə qılıncsız, qansız yetdi"*[Σ16].

*Daha sonra bu şərhi belə sözlərlə rədd edir: "Mötəzilə tərəfdarının bu açıqlaması əsassızdır". Çünki Uca Allah əzəldən əbədiyyətə qədər qəhredən olmuş, qələbə çalmış və istila etmişdir. O, hər növ çatışmazlıqlardan uca və uzaqdır. Bir çox nəzər nöqtələrini nəzərdən keçirdikdən sonra bunları deyir:*

*"İstiva"nın ucaldı, yüksəldi kimi təfsir edilməsinə gəlincə, bu səhih olan bir açıqlama tərzidir. Doğru olan nəzər nöqtəsi məhz bu olduğuna görə Sünnə əhlinin baxışları da buna əsaslanır. Çünki uca şan-şöhrətli Allah Özu Özunu ən üstün və ən yüksək keyfiyyətlərlə təsvir etmiş və belə buyurmuşdur:* ***"Allah Özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır!" (Yunus, 10/18)*** *Bu sifət Ona məxsus olan sifətlərdəndir (Fəthul-Bəri, XIII, 406)*

*Qeyd etməliyəm ki, bu məsələdə doğru olan: İstiva etmək Uca Allahın zatına xas olan əməli sifətlərindəndir. Daha doğrusunu ən yaxşı bilən Allahdır (Bax: əl-Hərrəs, Şərhul-əqidətil-vasitiyyə, s. 91)".*

---

[Σ16] Şer Türkcədən Azərbaycan dilinə Fərahim Sələfi tərəfindən tərcümə edilmişdir.

*Daha sonra Hafiz İbn Həcər Fəthul-Səridə bunları deyir: Əbu İsmail əl-Hərəvi "əl-Faruq" adlı kitabında sənədi ilə Davud b. Ali b. Xələfdən onun belə dediyini rəvayət edir: "Biz Abdullah b. əl-Ərəbinin, yəni lüğət mütəxəssisi Məhəmməd b. Ziyadın yanında idik. Bir nəfər:* ***"Rəhman ərşə istiva etdi" (Taha, 20/5)*** *nə deməkdir? – deyə, sual verdi. Abdullah dedi ki: "O, bildirdiyi kimi ərşin üzərindədir". Həmin adam: "Ey Abdullahın atası, bunun mənası istila etdi şəklindədir" dedi. Abdullah ona: "Sus, dedi. Bir şeyi istila etdi o vaxt demək olardı ki, Onun qarşısında duran şey Onun ziddinə gedəydi".*

*Bir başqası da belə demişdir: "Əgər bu, "istila etdi" anlamında olsaydı, bu ifadənin xüsusilə ərş haqqında işlədilməsinə lazım gəlməzdi. Çünki O, Öz mahiyyəti etibarı ilə bütün yaradılmışlara qalib gələndir" (Fəthul-Bəri, XIII, 406)*

*Təəccüb ediləsi odur ki, əşarilər "istiva" sözünü "istila etmək" mənasında təfsir edilməsini mötəzilə tərəfdarlarından götürüblər və bu, bəzi təfsir və tövhid kitablarında, habelə müxtəlif şəxslərin baxışlarında yayılmışdır. Beləliklə, onlar ayələrin, səhih hədislərin, səhabələrin, tabeinlərlə müctəhid imamların sözlərinin sübuta yetirdiyi Uca Allah haqqındakı "uluvv – ucalığı və yüksəkliyi" inkar etmiş oldular. Hətta Qurani Kərimin nazil olduğu ərəb dilinə qarşı çıxdılar.*

*İbn Qeyyim (A. r. e.) belə deyirdi: "Allah yəhudilərə "Hitta" demələrini əmr etdi. Onlar isə o sözü təhrif edərək "Hinta" dedilər. Uca Allah da bizə ərşin üzərinə "istiva" etdiyini söylədiyi halda, təfsirçilər onu "istila etdi" kimi yozdular. İndi bunların əlavə etdiyi "ل " (ləm) hərfinin yəhudilərin əlavə etdiyi "ن" (nun) hərfinə nə qədər bənzədiyinə diqqət edin (Bax: İbn Qeyyim, əl-Qasidətul-Nuniyyə)*

*2. Ərəb dilinə görə təfsir edilən nümunələrdən biri də Uca Allahın İbrahim əleyhissəlam haqqında buyurduqlarının açıqlanmasıdır:*

***"[İbrahim] atasına və tayfasına: "Sizin tapınıb durduğunuz bu heykəllər*[Σ17] *nədir?…" (Ənbiya, 21/52)***

*"Timsal" ərəbcə büt deməkdir (Şəvkaninin "Fəthul-Qadir" adlı təfsirində də bildirdiyi kimi) O, belə deyir: "Timsallar bütlər deməkdir. Timsalın əsil mənası Uca Allahın yaratdıqlarından olan hər hansı bir şeyə oxşar düzəldilən bir şeydir. Məsələn, bir şeyi bir başqasının oxşarı kimi göstərdiyimiz halda, filan şey filan şeyi təmsil edir (filan şeyə bənzəyir) deyirik. Məhz təmsil edilən belə varlıq timsal (oxşar) adlanır (Fəthul-Qadir, III, 413)*

*Müşriklərin sığındıqları bütlər də bir sıra görkəmli şəxsləri təmsil edirdilər. Buna sübut:*

*a. Buxari İbn Abbasdan (A.o.r.) Uca Allahın:* ***"Və dedilər: "Öz tanrılarınızı tərk etməyin, Vəddi, Suvanı, Yəğusu, Yəuqu və Nəsri atmayın!" (Nuh, 71/23)*** *buyruğunu şərh edərkən bunları söylədiyini rəvayət etmişdir: "Nuhun tayfasının sitayiş etdikləri bütlər ərəblərə keçdi… Bunlar Nuh tayfasından olan bir sıra saleh insanların adları idi. O adamlar öldükdən sonra şeytan onların qohum-əqrabasına təlqin etdiki onlara, vaxtilə iştirak etdikləri məclislərdə daşlar ucaldın və daşlara onların adını verin. Onlar da bu işi gördülər. O vaxt bu daşlara ibadət edilmirdi. Lakin bu tayfa ölüb getdikdən və elm yox olduqdan sonra o bütlərə sitayiş edilməyə başlandı". Burada "yox olduqdan sonra" ifadəsinin məqsədi, xüsusilə, o surətlərə, heykəllərə aid biliklərin yox olmasını bildirməkdir (Buxari, VI, 73)*

*b. Yenə də Buxari İbn Abbasdan Uca Allahın:* ***"Bir deyin görək Lat və Üzza nəyə qadirdir?!" (Nəcm, 53/13)*** [Σ18]

---

[Σ17] "***Heykəllər***" – ərəb (və türk) mətnində "timsallar" sözü ilə verilmişdir.

*buyruğu haqqında bunları söylədiyini rəvayət edir: Lat hacc ziyarətinə gələnlər üçün sevik (xurma yoğrulmuş çörək) hazırlayan bir adam idi (Buxari, VI, 51).*

*Mən deyərdim ki, məhz bundan ötrü Uca Allah bir çox şərif ayələrdə bunlara "vəlilər" adını vermişdir. Bu ayələrdən biri də:* ***"Yoxsa onlar özlərinə Allahdan başqa hamilər götürdülər…" (Şura, 42/9)*** *buyruğudur.*

*Yuxarıda verilən bu şərhdən "Qurani Kərimdə nəzərdə tutulan müşriklər daşdan düzəldilmiş bütlərə sitayiş edirdilər və onlar övliya deyildilər" – deyə zənn edən bir çox müsəlmanların xəta etdikləri aşkara çıxır. Bunun xəta olması ondadır ki, bütlər və heykəllər, bir az əvvəl də qeyd edildiyi kimi, bir sıra saleh insanları təmsil edirdi.*

*3. Ərəb dilinə görə təfsirin bir başqa nümunəsi də Uca Allahın:* ***"Bil ki, Allahdan başqa heç bir tanrı yoxdur" (Məhəmməd, 47/19)*** *buyruğudur. "Tanrı" məbud*[Σ19] *mənasındadır. Buna görə, buyuruq – "Allahdan başqa məbud yoxdur" deməkdir. Allahdan kənarda məbudların çoxluğundan, məsələn, Hindistanda hindlilər inəklərə sitayiş edir, xristianlar Məsihə ibadət edir, bəzi müsəlmanlar isə, təəssüflər olsun ki, övliyalara pənah aparır və Allahdan başqasına dua edirlər. Şərafətli hədisdə: "Dua ibadətin lap özüdür" deyilmişdir (Hədisi Tirmizi rəvayət etmiş, "həsən və səhih bir hədisdir" demişdir). Bu səbəbdən də açıqlamaya "haqq" sözünün əlavə edilməsi qaçılmaz olmuşdur. Buna görə, mənaca aşağıdakı kimi verilir:* ***Allahdan başqa haqq məbud yoxdur****. Beləliklə, bütün batil məbudlar anlayışın əhatə dairəsindən kənarda qalırlar. Bu formada təfsirin dəlili Uca Allahın:* ***"Bu ona görədir ki, Allah haqq, Ondan qeyri ibadət etdikləri isə batildir…" (Loğman, 31/30)*** *buyruğudur.*

---

[Σ18] Əl-Nəcm surəsinin həmin ayənin sayı səhvən 13 göstərilmişdir. Əslində 19-dur.

[Σ19] ***"Məbud"*** – ibadət, sitayiş edilən.

*"Tanrı" ("ilah") məfhumunun mənasına dair bu təfsirdən əziz və cəlil olan Allahın ərşinin üstündə olmasını inkar edən əksər müsəlmanların xəta etdikləri açıq-aydın üzə çıxır. Onlar bu nəzər nöqtələrini əsaslandırmaq üçün Uca Allahın:* ***"Göydə də tanrı, yerdə də tanrı Odur…" (Zuxruf, 43/84)*** *buyruğunu dəlil kimi göstərirlər. Əgər bunu dəlil göstərənlər "ilah"ın nə demək olduğunu bilsəydilər bu ayəni dəlil gətirməzdilər. Çünki bir az bundan əvvəl qeyd etdiyimiz kimi, "ilah" məbud deməkdir. Bilavasitə isə ayənin mənası belədir: O, səmada da məbud olandır, yerdə də məbud olandır.*

*Bundan başqa, Uca Allahın ərşin üstündə olmasını isbat edən ayələr olduqca çoxdur. Bunlardan biri aşağıdakıdır:*

***"…Sonra ərşə istiva etdi…" (Əraf, 7/54)*** [Σ20].

*Bu isə ucaldı və yüksəldi deməkdir.*

*Daha sonra, "Lə iləhə illəllah" Allahdan başqa yaradan və ruzi verən yoxdur deməkdir, deyən bir çox şəxslərin xəta etdikləri məlumdur. Çünki müşriklər əsasən bunu qəbul edirlər. Lakin onlar "ilahın" da məbud olduğunu bilirdilər. Məhz buna görə onlar "lə iləhə illəllah" deməyi təkəbbürlərinə sığışdırmadılar. Beləliklə, Uca Allah onlardan beləcə bəhs edir:* ***"Onlara: "Allahdan başqa heç bir tanrı yoxdur!" – deyildiyi zaman təkəbbür göstərirdilər. Və: "Biz heç divanə bir şairdən ötrü tanrılarımızı tərk edərikmi?!" - deyirdilər" (Saffat, 37/35-36)***

---

[Σ20] Bu ayə, burada istisna olaraq, kitabın türk dilindəki mətnə əsasən tərcümə edilmişdir. Yuxarıda qeyd etdiyimiz kimi, yazıçı M.C. Ziynunun türk dilinə tərcümə edilmiş əsərində verilmiş ayələrin qarşılığı, Quranın Azərbaycan dilinə Z. Bünyadov və V. Məmmədov tərəfindən hazırlanmış ilk tərcüməsindən iqtibas olunur.

*4. Təfsirdə yardımçı olan məsələlərdən biri də ərəb dilinin normaları ilə əlaqədar ifadələrdə təqdim və təxirlə bağlı qaydaları bilməkdir. Buna misal Uca Allahın:* ***"Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!" (Fatihə, 1/5)*** *buyruğudur.*

*Burada məful*[Σ21] *olan (və feldən sonra gəlməsi zəruri olan) "iyyəkə (yalnız sənə)" birində "ibadət edirik" mənasındakı feldən, digərində isə "kömək diləyirik" mənasındakı feldən əvvəl gəlmişdir. Bundan məqsəd isə ibadəti və kömək diləməyi yalnız bir olan Allaha həsr etməkdir. Yəni biz Səndən başqa kimsəyə ibadət etmərik, Səndən başqa bir kimsədən kömək istəmərik. İbadəti və kömək diləməyi yalnız Sənə məxsus hesab edirik.*

***"Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!"*** *buyruğu haqqında İbn Qeyyim "Mədəricus-Səlikin" adlı əsərdə bunları söyləmişdir:*

*"Yaratmağın və əmr etməyin, kitabların və şəriətlərin, savabın və əzabın sirri bu iki kəlmədə ifadə edilmişdir:* ***"Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!"*** *Bunlar ubudiyyətin*[Σ22]*və tövhidin əksəriyyətini təşkil edirlər. Belə ki:*

*"Uca Allah yüzdörd kitab nazil etmişdir. Bunların hamısının mənalarını Tövrat, İncil və Quranda cəmləşdirmişdir… Quranın bütün mənasını da Fatihədəki:* ***"Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!"*** *ayəsində bir yerə cəm etmişdir (Bax: İbn Qeyyim, Mədəricus-Səlikin, ixtisarla)*

*Ayənin ifadə etdiyi bəzi mənalar:*

---

[Σ21] ***Məful*** – ərəb dili qramatikasında – təsirlik, yönlük, çıxışlıq və yerlik halları bildirir.

[Σ22] ***Ubudiyyət*** – ibadət etmə, qulluq etmə.

*1. Namaz, təvaf, hökm vermək və dua etmək kimi ibadətlərin yalnız Allah üçün yerinə yetirilməsidir. Çünki Peyğəmbər (sallallahu əleyhi və səlləm): "Dua ibadətin özüdür" (həsən və səhih hədisdir) – deyə, buyurmuşdur.*

*2. Allahdan diləmək, Ondan kömək istəmək. Xüsusilə xəstələrə şəfa vermək, ruzi tələb etmək, hidayət və buna oxşar şeyləri, Ondan başqa kiminsə verə bilməyəcəyini, yalnız Ondan istəmək. Çünki Peybəmbər ağamız (sallallahu əleyhi və səlləm): "Diləyirsənsə – Allahdan dilə. Kömək istəyirsənsə – Allahdan kömək istə" – deyə buyurmuşdur (Hədisi Tirmizi rəvayət edib, ona həsən və səhih demişdir)*

# *QURANI ANLAMAQ ÜÇÜN KÖMƏKÇİ VASİTƏLƏR*

## *Mahiyyətə varma*

*Məsələnin mahiyyətinə varmaq yolu ilə əldə edilən bilik ayənin mənasından çıxarılan incə bir anlayışdır.*

*1. Misal üçün Uca Allahın aşağıdakı buyruğunu nəzərdən keçirək:*

***"Allahın köməyi və zəfər gəldiyi zaman; insanların dəstə-dəstə Allahın dininə daxil olduqlarını gördüyün zaman" (Nəsr, 110/1-2)***

*Buxarinin rəvayətinə görə İbn Abbas belə demişdir: "Ömər məni Bədrdə iştirak edən yaşlı əshabi kiramla birlikdə söhbətlərində iştirak etməyə çağırırdı. Yəqin ki, onlardan biri daxilən bundan narahat olduğuna görə soruşmuşdu ki: Bizim də bunun kimi uşaqlarımız olduğu halda, niyə məhz onu bizimlə birlikdə hüzuruna gətirdirsən? Ömər demişdi ki, bunun səbəbini siz də bilirsiniz. Bir gün Ömər İbn Abbası çağırdı və səhabələrlə birlikdə öz hüzuruna dəvət etdi. (İbn Abbas deyir ki): Zənnimcə, məni, yalnız onlara (məni aralarında oturtmaq) məqsədini bildirmək üçün çağırmışdı. Uca Allahın:* ***"Allahın köməyi və zəfər gəldiyi zaman…"*** *buyruğu haqqında nə bilirsiniz? – deyə soruşdu. Bəziləri: "Allah bizə yardım edib, bizə qələbəni nəsib etdiyinə görə Ona həmd etmək, Ondan bağışlanma diləmək buyurulmuşdur" dedilər, bəziləri isə heç bir şey deməyib susdular. Mənə müraciət edərək: "Sən də mi belə düşünürsən, İbn Abbas? - dedi. Mən: Xeyr dedim. Bu, Peyğəmbərin (sallallahu əleyhi və səlləm) əcəli haqqındadır. Allah ona (sallallahu əleyhi və səlləm) əcəlini bildirmişdi: :* ***"Allahın köməyi və zəfər gəldiyi zaman…"*** *buyruğuyla "bax*

*bu sənin əcəlinin əlamətidir" demişdi.* ***"Rəbbini həmd-səna ilə təqdis et və Ondan bağışlanmağını dilə. Həqiqətən O, tövbələri qəbul edəndir!" (Nəsr, 110/3)***

*Ömər onda dedi ki, mənim də bu barədə bildiyim sənin söylədiyindən başqa bi şey deyil" (Buxari, VI, 94)*

*2. Bir başqa misal İbn Kəsirin imam Şafiidən Uca Allahın aşağıdakı buyruğu ilə bağlı söylədiyi rəvayətdir:*

***"Heç bir günahkara başqasının günahı yüklənməz. İnsana ancaq öz əməli, öz zəhməti qalar!" (Nəcm, 53/38-39)*** Σ23

*Yəni, kimsəyə başqasının günah yükü yüklənməyəcəyi kimi, insanın şəxsən özünün qazandıqlarından başqa şeylərin əcrini də əldə etməsi baş tutan iş deyil. Məhz bu şərif ayədən imam Şəfii (A.r.e.) bu hökmü çıxarmışdır (istinbat etmişdir): Quran oxunmanın savabı hədiyyə kimi ölülərə çatmaz. Çünki bu nə ölülərin əməli, nə də onların qazancıdır. Bundan ötrü Peyğəmbər (sallallahu əleyhi və səlləm) bu işi görməyə təşviq etmədiyi kimi, hər hansı məna kəsb edən iqtibasla və ya işarə ilə onları belə bir işə yönəltməmişdir. Hər hansı bir səhabədən də belə şey rəvayət edilməmişdir. Əgər bunun bir xeyri olsaydı şübhəsiz ki, onlar bizdən əvvəl bunu edərdilər. Digər tərəfdən Allaha yaxınlaşdıran əməllərlə bağlı olaraq yalnız ayə və hədislərdən götürülmüş iqtibaslara önəm verilir. Müxtəlif müqayisələr vasitəsilə və nəzər nöqtələri ilə bu məsələlərdə hər hansı bir qənaətə gəlmək mümkünsüzdür.*

*Dua və sədəqəyə gəlincə, bunların (savablarının) ölüyə çatacağı haqqında alimlərin ümumi rəyi vardır və şəriətdə bu haqda ayə və hədislər mövcuddur.*

---

Σ23 Bu iki ayənin birinci hissəsində (alınan məxəzə nisbətən) tərəfimizdən bir sıra kiçik redaktə təshihləri edilmişdir (Birinci hissə belə verilmişdi: ***"Heç bir günahkar başqasının günahına yüklənməz!"***)

*Muslimin Səhihində rəvayət etdiyi hədisə görə Əbu Hureyrə belə demişdir:*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) buyurmuşdur ki:*

*"İnsan ölən kimi, aşağıdakı üç şey istisna olmaqla, ona aid əməli kəsilir: ona dua edən əməlisaleh övlad və ya savabı kəsilməyən sədəqə və yaxud da qoyduğu elmdən istifadə edilməsi".*

*Məhz bu üç şey onun öz zəhməti, səyi və əməlinin nəticəsidir. Beləliklə, şərafətli hədisdə belə buyurulmuşdur:*

*"İnsanın ən rahatlıqla yediyi şey qazancıdır və şübhəsiz ki, onun övladı da onun qazancı sırasındadır" (Hədisi Tirmizi və Əbu Davud rəvayət etmiş, Camiul-Usulu tədqiq edən isə onun səhih olduğunu bildirmişdir)*

*Cari sədəqə isə, vəqf və başqa oxşar şeylər kimi, insanın davam edən əməllərinə aiddir. Onun vəqf etdiyi*[Σ24]*şeylərdir. Uca Allah da belə buyurmuşdur:*

***"Həqiqətən, ölüləri dirildən, onların [**dünyada**] nə etmiş olduqlarını və qoyub getdiklərini yazan Bizik…" (Yasin, 36/12)***

*Bir nəfərin insanlar arasında yaydığı və ondan sonra insanların ardıyca getdikləri elm də eynilə onun sədəqəsinin bir hissəsidir. "Səhih"də qeyd olunduğuna görə: "Kim ki, insanları hidayət yoluna dəvət edərsə, onun dəvət etdiklərinin qazandıqları əcirlərindən azaldılmadan, özünə də əcr düşər" (Bax: İbn Kəsir, Təfsir, IV, 258)*

## *Nüzulun*[Σ25] *səbəbləri haqqında bilik*

Σ24 ***Vəqf etmək*** – savab bir iş üçün ayrılmış mülk, mal.

Σ25 ***Nüzul*** – aşağı enmə, nazil olma.

*Şübhəsiz ki, nüzulun səbəbləri haqqında bilik Qurani-Kərimi anlamağa kömək edən biliklər sırasındadır.*

*1. Uca Allahın bu buyruğunu nümunə kimi göstərək:*

***"De ki, "Allahdan başqa tanrı güman etdiklərinizi çağırın. Onlar sizi nə möhnətdən qurtarmağa, nə də onu dəyişməyə qadir deyillər! Onların tapındıqları tanrıların özlərindən hər hansı biri daha yaxın olsun deyə, Rəbbinə vəsilə axtarır, Onun rəhmətini umur, əzabından qorxur. Həqiqətən, Rəbbinin əzabı qorxuludur!" (İsra, 17/56-57)***

*İbn Məsuddan belə dediyi rəvayət edilmişdir: "Bir qrup insanlar cinlərdən olan bir qrupa ibadət edirdilər. Cinlərin bir qismi İslama daxil oldular, digərləri (insanlar) isə onlara (cinlərə) ibadət etməkdə davam edirdilər. Buna görə:* ***"Onların tapındıqları tanrıların özlərindən hər hansı biri daha yaxın olsun deyə, Rəbbinə vəsilə axtarır"*** *buyruğu nazil oldu (Buxari və Muslim)*

*Hafiz İbn Həcər demişdir ki, cinlərə ibadət edən insanlar cinlərə ibadəti davam etdirirdilər. Cinlər isə müsəlman olduqlarına görə bu ibadətə razı olmurdular. Rəblərinə daha yaxın olmaq üçün yol axtaranlar məhz onlar idi. Təbəri bir başqa isnadla İbn Məsuddan etdiyi rəvayətdə bunları da əlavə edir: "O cinlərə ibadət edən insanlar onların müsəlman olmasına məhəl qoymamışdılar". Bu ayənin təfsirində etibarlı açıqlama məhz budur (Fəthul-Bəri, VIII, 397)*

***"Onların tapındıqları..."*** *özlərini Rəblərinə yaxınlaşdıracaq şeyləri diləyərək Allaha yalvarıb-yaxardıqları*

***"Rəbbinə vəsilə axtarır"*** *yəni, ona itaətlə, onu razı salacaq işləri görməklə yaxınlaşırlar.*

***"Hansı biri daha yaxın olsun deyə"*** *yəni, xeyirxah əməllərlə Allaha hansıları daha yaxın olacaq deyə.*

***"Onun rəhmətini umur, əzabından qorxur".*** *Çünki ibadət ancaq qorxu (xof) və ummaqla (ümidlə) birgə tamamlanır.*

***"Həqiqətən, Rəbbinin əzabı qorxuludur"*** *qulların ondan çəkinmələri və qorxmaları lazımdır.*

*Bu şərif ayə ilə Allahdan başqa peyğəmbərlərə və övliyalara dua edən və onların şəxsiyətini vasitəyə çevirənlərin gəldiyi qənaət rədd edilir. Əgər onlar o peyğəmbərlərə olan imanlarını və onlara bəslədikləri sevgilərini vasitə etsəydilər, məqbul olardı.*

*2. Daha bir misal: Abdullah b. Məsud (A.o.r.) demişdir ki,* ***"İman gətirib imanlarını zülmə qatışdırmayanlar…" (Ənam, 6/82)*** *gəlincə, bu ayə nazil olduqda Peyğəmbərin (sallallahu əleyhi və səlləm) bir əsabəsi: hansı birimiz öz nəfsinə zülm etmir ki? – dedi. Buna cavab olaraq:* ***"Allaha şərik qoşma. Doğrudan da Allaha şərik qoşmaq böyük zülmdür!" (Loğman, 31/13)*** *ayəsi nazil oldu. (Buxari)*

*Hafiz İbn Həcər "Fəthul-Bəri"də "qarışdırmayanları" sözünün mənasını məhfuma uyğun açıqlamışdır.*

*3. Digər bir misalı Buxari Urvənin aşağıdakı sözləri ilə qeyd edir:*

*Əz-Zübeyr ənsarlardan olan bir nəfərlə əl-Hərradakı su ilə əlaqədar mübahisə etmişdi. Buna cavab olaraq Peyğəmbər (sallallahu əleyhi və səlləm): "Ey Zubeyr, sən əkinini suvar, sonra isə suyu qonşuna tərəf burax". Ənsarlardan olan bir şəxs: "Ey Allahın Elçisi, o sənin bibin oğlu olduğuna görəmi (belə deyirsən)? – dedi. Peyğəmbərin (sallallahu əleyhi və səlləm) rəngi dəyişdi. Sonra belə buyurdu: "Ey Zubeyr, əkinini suvar, sonra da suyu mərzlərə qayıdana qədər qoy axsın. Sonra suyu qonşuna tərəf döndər!" Peyğəmbər (sallallahu əleyhi və səlləm) ənsarlardan olan şəxs onu əsəbləşdirdikdə verdiyi açıq-*

*aydın hökmü ilə Zübeyrə tam haqqını vermişdi. Halbuki, bundan öncə verdiyi hökmündə mübahisə edənlərin hər ikisi üçün daha geniş yol göstərmişdi.*

*Zübeyr demişdir ki, qənaətimə görə bu:* ***"Amma, xeyr! Sənin Allahına and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə iman gətirmiş olmazlar" (Nisa, 4/65)*** *ayəsi məhz bu hadisə ilə əlaqədar nazil olmuşdur (Buxari, V, 180)*

*4. Huzeyfədən digər bir misal:* ***"Allah yolunda xərcləyin. Öz əlinizlə özünüzü təhlükəyə atmayın, yaxşılıq edin!.." (Bəqərə, 4/195)*** *ayəsi malı zəruriyyət olduqda (infaq) sərf etmək və bu zəruriyyəti unutmamaq haqqında nazil edilmişdir (Buxari)*

*Əbu Davudun rəvayətində də deyilir ki, Mədinədən Konstantiniyə getmək məqsədilə döyüşə yollandıq. Komandan Abdurrahman b. Xalid b. Valid idi. Bizanslılar arxalarını şəhərin divarlarına dayamışdılar. Bir nəfər düşmənə həmlə etdi. İnsanlar: "Yazıq, yazıq! Lə iləhə illəllah! Bu özünü öz əllərilə təhlükəyə atır" dedilər. Onlara cavab olaraq Əbu Əyyub əl-Ənsari bunları söylədi: Deyəcəyim ayə biz ənsarlar haqqında nazil olmuşdur. Allah Peyğəmbərinə (sallallahu əleyhi və səlləm) qələbə nəsib edərək İslamın zəfər çalmasını təmin edincə bizlər belə dedik: Gəlin mallarımızın üstündə dayanaq və onları bir qaydaya salaq. Buna cavab olaraq Uca Allah:* ***"Allah yolunda xərcləyin. Öz əlinizlə özünüzü təhlükəyə atmayın!.." (Bəqərə, 4/195)*** *ayəsini nazil etdi. Buna görə də "öz əlimizlə özümüzü təhlükəyə atmağımız" ifadəsi, bizim, mallarımızın üstündə dayanaraq, onları qaydaya salmaq istəyi ilə cihadı tərk etməyimiz deməkdir.*

*Əbu İmran demişdi ki, Əbu Əyyub Allah yolunda cihada davam etdirdi və nəhayət, Konstantiniyyədə dəfn*

*edildi. (Hədisi Əbu Davud səhih bir sənədlə rəvayət etmişdir. Bax: Camiul-Usul, II, 32)*

## *Nasix və mənsux*[Σ26] *haqqında*

*Qurani Kərimi başa düşməkdə kömək göstərən xüsusiyyətlərdən biri də nasix və mənsux haqqında biliyə malik olmaqdır. Bunun dəlili Uca Allahın bu buyruğudur:* ***"Biz hər hansı bir ayənin hökmünü ləğv edir və ya onu unutdururuqsa***[Σ27]***, ondan daha yaxşısını, yaxud ona bənzərini gətiririk…" (Bəqərə, 2/106)***

***Nəsx*** *– bir şəriət hökmünün daha sonra gələn başqa bir şəriət dəlili ilə qüvvədən düşməsidir.*

*Qüvvədən düşmüş hökmə –* ***mənsux*** *deyilir. O hökmü qüvvədən salan dəlilə* ***nasix*** *deyilir, hökmün qüvvədən düşməsinə isə* ***nəsx*** *adı verilir.*

*Nasix*[1] *adı bu ayədə olduğu kimi, Allaha aid edilir. Ayə haqqında da deyilə bilər. Məsələn: bu ayə, o ayə nəsixdir (nəsxedicidir) – deyilərək, bir başqa hökmü qüvvədən salan hökm haqqında da işlədilə bilər.*

*1. Buna misal: Sələmə b. əl-Əkvanın (A.o.r.) belə dediyi rəvayət edilmişdir:*

*"Uca Allahın:* ***"…Oruc tutmağa taqəti olmayanlar isə bir yoxsulu***[Σ28] ***doyuracaq qədər fidyə verməlidirlər" (Bəqərə, 2/184)*** *buyruğu nazil olduqda oruc tuta bilməyən fidyə verdi.*

---

[Σ26] ***Nasix*** – ləğv edən; ***mənsux*** – qüvvədən düşmüş.

[Σ27] Burada söhbət əvvəlki qanunların (ayələrin) ləğv olunmasından gedir.

[1] Uca Allahın haqqında "nasix" adını işlətmək əsassızdır. Çünki Uca Allahın adları tövqifidir (yalnız Quranın və Peyğəmbərin (Sallallahu əleyhi və səlləm) vasitəsilə bilinir) M.C. Zeynu

[Σ28] Hər gün əvəzində.

*Sonra isə, ondan sonrakı ayə nazil edilərək, onu qüvvədən saldı.*

*Bir başqa rəvayətdə:* ***"Ramazan ayına yetişən şəxslər bu ayı oruc tutmalıdırlar"*** *(Bəqərə, 2/185) ayəsi nazil oluncaya qədər yuxarıdakı ayə (Bəqərə, 2/184) qüvvədə olmuşdur. (Buxari və Muslim)*

*Abdullah b. Ömər (A.o.r.)* ***"…Oruc tutmağa taqəti olmayanlar isə bir yoxsulu doyuracaq qədər fidyə verməlidirlər" (Bəqərə, 2/184)*** *ayəsini oxuyaraq, onun qüvvədən salındığını bildirmişdir. (Buxari)*

*İbn Abbas isə ayənin mənsux deyil, möhkəm olması qənaətindədir.*

*Buxarinin Ətadan rəvayət etdiyinə görə, o İbn Abbası (A.o.r.) Uca Allahın* ***"…Oruc tutmağa taqəti olmayanlar isə bir yoxsulu doyuracaq qədər fidyə verməlidirlər" (Bəqərə, 2/184)*** *ayəsini oxuduqdan sonra: "Bu, nəsx olunmuş deyildir. Bu, oruc tuta bilməyən, çox qocalmış qadın və kişi haqqındadır. Bunlar hər gün bir yoxsulu yedirməlidirlər" – deyə izah etmişdir. Buna görə "****yutıqunəhu*** *– gücü çatanlar" sözünün mənası "gücləri bu işə çatanlar" demək deyil. Bunun mənası "böyük çətinlik və məşəqqətlə oruc tuta bilənlər" deməkdir.*

*2. Bir başqa misal Uca Allahın:* ***"… Siz ürəyinizdə olanı zahirə çıxarsanız da, çıxarmasanız da, Allah ona müvafiq sizinlə haqq-hesab çəkər…" (Bəqərə, 2/284)*** *buyruğudur. Bu hökm Uca Allahın:* ***"Allah heç kəsi gücü çatmayan işə vadar etməz…" (Bəqərə, 2/286)*** *ayəsi ilə qüvvədən salınmışdır.*

*3. Uca Allahın:* ***"Qadınlarınızdan zina edənlərə qarşı öz aranızdan[Σ29] dörd şahid tutun! Əgər onlar şəhadət verərlərsə, həmin qadınları ölənə qədər, yaxud Allah onlar***

---

[Σ29] Möminlərdən.

***üçün bir yol açanadək evlərdə həbs edin! İçərinizdən belə bir qəbih iş görənlərin hər ikisinə əziyyət verin. Əgər tövbə edib özlərini düzəltsələr, onları incitməkdən vaz keçin!.." (Nisa, 4/15-16)*** *ayəsi Nur surəsində verilmiş evlənməmiş subaylar üçün çubuq cəzasını nəzərdə tutan ayə ilə quvvədən salınmışdır. Belə ki:*

***"Zinakar kişiyə və zinakar qadına yüz çubuq vurun…" (Nur, 24/2)***

*Nur surəsindəki 2-ci ayə (subayları çubuqla cəzalandırılması haqqında) və Sünnədə evliləri daşqalaq etmək cəzası Nisa surəsindəki 15-16-cı ayələrin hökmünü qüvvədən salmışdır.*

*"…Subay subayla zina edərsə yüz cubuq və bir il sürgün, evli evli ilə zina edərsə yüz çubuq və daşqalaqla cəzalandırılır". (Hədisi Muslim rvayət etmişdir)*

*4. Uca Allahın:* ***"…İçərinizdə iyirmi səbrli kişi olsa, iki yüz kafirə …qalib gələr…" (Ənfal, 8/65)*** *buyruğu Uca Allahın:* ***"İndi Allah yükünüzü yüngülləşdirdi. Çünki O, sizdə bir zəiflik olduğunu bilirdi. Artıq aranızda yüz səbrli kişi olsa iki yüz nəfərə… Allahın izni ilə qələbə çalar…" (Ənfal, 8/66)*** *ayəsi ilə qüvvədən düşmüşdür.*

*5. Uca Allah buyurur ki:* ***"Biz sənin üzünün göyə tərəf çevrildiyini görürük, ona görə də səni razı olduğun qibləyə tərəf döndərəcəyik. İndi üzünü Məscidülhərama[Σ30] tərəf çevir!.." (Bəqərə, 2/144)***

---

[Σ30] M ə s c i d ü l h ə r a m *(əl-Məscid əl-Həram)* "toxunulmaz məscid" deməkdir. Məkkədə Kəbədə yerləşən camenin adıdır. Quranda Məscidülhəramın adı çox yerdə çəkilir: müşriklərin, xalqa bu məscidə girməsini qadağan etmələri böyük günahdır (*Quran,* 5/2). Yeni qiblə Məscidülhəram istiqamətindədir (2/142) Əhdlər də ancaq Məscidülhəramda təsdiq olunur (9/7)

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) Mədinəyə gəldiyi zaman on altı və ya on yeddi ay Beytülmüqəddəsə doğru üzünü tutaraq namaz qılırdı. Bununla birgə Peyğəmbər Kəəbəyə doğru üzünü çevirməyi arzu edirdi. Elə buna görə:* ***"Biz sənin üzünün göyə tərəf çevrildiyini görürük…" (Bəqərə, 2/144)*** *ayəsi nazil oldu və o da üzünü Kəbəyə çevirdi.*

## *Nəsxin hikməti*

*1. Qulların islahına diqqət vermək.*

*2. Dəvətin və insanların vəziyyətinin tərəqqisinə bərabər olaraq şəriətin təkmilləşdirilmiş səviyyəyə doğru yuksəlməsi.*

*3. Əmri icra etmək və ya etməmək baxımından mükəlləf olanın sınaqdan keçirilməsi və yoxlanılması.*

*4. İslam milləti üçün xeyir istəmək və onun işlərinin asan başa gəlməsini təmin etmək. Çünki nəsx daha ağır bir hökmə doğru yönəlmişdirsə, burada savabın artması güdülür. Əgər daha mülayim hökm nazil edilmişsə, burada asanlaşdırma niyyəti vardır (Bax: əl-Qattan, Məbəhis fi Ulumil-Quran)*

## *Quranın Məkkə və Mədinəyə aid hissələri*

*Şübhəsiz ki, Quranı anlamağa və onu (düzgün) təfsir etməyə kömək edə bilən məsələlərdən biri də Quranın*

---

Yuxarıda göstərdiyimiz surələrdə Məscidülhəram, sonralar olduğu kimi, yalnız bir bira deyil, sadəcə müqəddəs bir yer sayılan Məkkə nəzərdə tutulur.

Hədisə görə Məscidülhəramda qılınan namaz xüsusilə qiymətlidir (bax: *Buxari,* əs-Salət fi məscid Məkkə, 1-ci bab)

*Məkkə və Mədinə hissələrinə mənsubluğunu bildirən ayələri tanımaqdır. Bundan ötrü əshabi kiram və onlardan sonra gələnlər buna xüsusi əhəmiyyət vermişlər. Hətta İbn Məsud (A.o.r.) belə demişdir: "Ondan başqa heç bir tanrı olmayan Allaha and içirəm ki, Allahın kitabında nazil olmuş hər bir surənin, mən, harada endirildiyini bilirəm. Allahın kitabında nazil olmuş hər bir ayənin həqiqətən nəyə dair endirildiyini də bilirəm. Əgər Allahın kitabını hər hansı bir kimsənin məndən daha yaxşı bildiyini eşitsəm və dəvə belində ona çatacağımı güman etsəm hökmən dəvənin belinə minər və həmin şəxsin yanına gedərəm". (Buxari)*

*Əshabi kiram (A.o.r.) Qurandan öyrəndiklərinə lazımi qədər əməl edirdilər. Bundan ötrü İbn Məsud belə demişdir: "Bizdən hər hansı bir kəs on şərəfli ayə öyrəndikdə, onların mənalarını və onlara lazımi qədər əməl etməyi bilməsəydi, başqalarını öyrənməyə başlamazdı" (Əhməd Şakir sənədinin səhih olduğunu bildirir)*

*Bunun təcrübədə həyata keçirilməsi isə aşağıdakıları buyuran Peyğəmbərin (sallallahu əleyhi və səlləm) göstərişlərinin yerinə yetirilməsinin zəruriliyidir:*

*"Quranı oxuyun və ona uyğun əməl edin. Fəqət, onun vasitəsilə yeməyin…" (Səhih bir hədis kimi imam Əhməd rəvayət etmişdir)*[R1]

*Bu Qurani Kərimə əməl etmələrinə görə Uca Allah Peyğəmbərinə (sallallahu əleyhi və səlləm) və ondan sonra onun səhabələrinə kömək etmiş, qələbələr qazandırmışdır. Bu gün müsəlmanlar Qurani Kərimə lazımi qədər əməl etmədikcə Allahın köməyi onlara gəlib yetişmir. Belələrinin*

---

[R1] İmam Əhmədin "Musnəd" (3/428, 444) əsərində *"...və ona uyğun əməl edin.."* sözlərini tapa bilmədik. Hədisi bu əlavə ilə əl-Beyhəqi "Şubəl-imən" (2/532, hədis 2624) kitabında rəvayət etmişdir. Şeyx Əlbani (Allah ona rəhmət etsin) "Səhih hədislər silsiləsi" əsərində (1/522, hədis 260) imam Əhmədin rəvayət etdiyi hədisin səhih olduğunu bildirmişdir.

*həmin vəziyyətdə qalması onların Rəblərinin kitabını öyrənməyə və ona lazımınca əməl etməyə qayıdacaqları zamana qədər davam edəcəkdir. Qayıdarlarsa, Allahın ardı kəsilmiş köməyi də onlara qayıdar.*

## *Məkkə və Mədinə hökmlərini tanımaq*

*Elm adamları Məkkə və Mədinə hökmlərini bir-birindən ayırmaq barədə iki təməl metoda əsaslanmışlar:*

*1. Eşitmə və nəqletmə metod. Bu, vəhyə müasir olan, vəhyin nazil olmasıyla tanış olan əshabi kiramdan bilik alan və onlardan Qurani Kərimin nüzul keyfiyyətini, yerlərini, hadisələrini öyrənən tabeinlərdən gələn səhih rəvayətlərə istinad edir. Məkkə və Mədinə ayələri haqqında varid olmuş rəvayətlərin böyük çoxluğu bu qəbildəndir. Çünki bu barədə Peyğəmbərdən (səlləllahu əleyhi və səlləm) hər hansı bir rəvayət gəlməmişdir. Fəqət, ona bunu açıqlamaq barədə hökm verilməmişdi.*

*Bunun nümunəsi oxucunun surənin başllığı altında gördüyü "Məkkə surəsi" və yaxud "Mədinə surəsi" şəklində təsbit edilməsidir.*

*2. Qiyas və ictihad metodu. Bu metod Məkkə və Mədinə buyuruqlarının özünəməxsus xüsusiyyətlərinə əsaslanır. Əgər Məkkə surəsində Mədinədə nazil olan buyuruqların səciyyəsini daşıyan və yaxud da Mədində nazil olan buyuruqların hadisələrindən hər hansı bir şeyi ehtiva edən bir ayə olarsa, bu ayə Mədinə ayəsidir deyilir. Əgər Mədinə surəsində Məkkədə nazil olan buyuruqların hadisələrindən hər hansı bir şeyi ehtiva edən bir ayə olarsa, bu ayə Məkkə ayəsidir deyilir. Surədə Məkkədə nazil edilmiş Quranın özəllikləri olduqda surəyə Məkkə surəsi, Mədinədə endirilmiş Quranın özəlliyi olduqda isə, Mədinə surəsi deyilir. Məsələn, peyğəmbərlərin və keçmiş millətlərin hekayətləri*

*ilə bağlı əksini tapdığı hər bir surə Məkkə surəsidir. Fərz və yaxud cəza haqqında olan hər hansı bir surə Mədinə surəsidir.*

## *Quranın Məkkə və Mədinə hissələrinin tanınması*

*1. Quranın Məkkəyə aid hissələri. Onlar Məkkədən kənar bir yerdə nazil edilmiş olsalar da Peyğəmbərə (sallallahu əleyhi və səlləm) hicrətdən əvvəl endirilmiş vəhylərdir.*

*2. Quranın Mədinəyə aid hissələri. Cəbrail əleyhissəlamın Məhəmmədə (sallallahu əleyhi və səlləm) hicrətdən sonra endirdiyi göstərişlərdir. Vida həccində nazil olan buyuruqlarda olduğu kimi (istər Məkkədə endirilmiş olsa da)*

*Buna misal Uca Allahın:* ***"…Bu gün dininizi kamala yetirdim, sizə olan nemətimi tamamladım və sizin üçün din olaraq İslamı bəyənib seçdim…" (Maidə, 5/3)*** *buyruğudur.*

*Yəhudilərdən bir nəfər Ömər b. əl-Xəttabın yanına gələrək: Ey möminlərin əmiri! – dedi. – Kitabınızda oxuduğunuz bir ayə vardır. Əgər o biz yəhudilərə nazil edilmiş olsaydı, o günü bayram edərdik. Ömər (A.o.r.): "Bu hansı ayədir?" – deyə soruşdu. Yəhudi:* ***"…Bu gün dininizi kamala yetirdim, sizə olan nemətimi tamamladım və sizin üçün din olaraq İslamı bəyənib seçdim…"*** *ayəsidir dedi.*

*Ömər (A.o.r.) ona: "Mən bu ayənin endiyi günü və onun endiyi yeri çox yaxşı bilirəm. Bu ayə Peyğəmbərə (sallallahu əleyhi və səlləm) Ərəfatda və cümə günü nazil olmuşdur. (Buxari)*

*Mən deyərdim ki, bu ayədə İslamda gözəl bidət olduğunu söyləyənlərin nəzər nöqtələri rədd edilir. İmam Malik isə belə demişdir: Kim ki, İslamda gözəl olması iddiası ilə ortaya bir bidət atarsa, heç şübhəsiz ki, o, Məhəmmədin (sallallahu əleyhi və səlləm) risalətinə xəyanət etmişdir. Çünki Uca Allah:* ***"…Bu gün dininizi kamala yetirdim…"*** *– deyə buyurmuşdur.*

*O zaman, o gün üçün dinə aid olmayan bir şey bu gün də dinə aid olmaz.*[R2]

## Quranın Məkkədə nazil olan hissələrinin səciyyəvi xüsusiyyətləri

*Quranın Məkkədə nazil olmuş hissələri mövzu baxımından aşağıdakı xüsusiyyətlərə malik olduqlarına görə əhəmiyyət kəsb edir:*

*1. Müşriklərin inkar etdikləri mütləq tanrının tövhidinə dəvət. Belə ki, Uca Allah onların barəsində belə buurmuşdur:* ***"Onlara: "Allahdan başqa heç bir tanrı yoxdur!" – deyildiyi zaman təkəbbür göstərirdilər. Və: "Biz heç divanə bir şairdən ötrü tanrılarımızı tərk edərikmi?!" – deyirdilər." (Saffat, 37/35-36)***

*Çünki ərəblər "Allahdan başqa tanrı yoxdur" sözünün mənasını və bu sözü söyləyənin Allahdan başqasına ibadət etməməsinin lazım gəldiyini başa düşürdülər. Bu gün isə bəzi müsəlmanlar bunun mənasını anlamırlar. O ifadə "Allahdan başqa haqq məbud yoxdur" deməkdir. Bundan ötrü onlar öz dilləri ilə bu kəlməni işlədərkən, əməlləri ilə ona qarşı zidd hərəkət edirlər. Bu da, Allahdan başqasına dua etdikləri, Allahın şəriətindən uzaq olan "hökmlərə" baş*

---

[R2] İbn Həzmin əl-İhkəm (6/225) əsərinə bax!

*əydikləri, Allahdan başqası üçün qurban nəzir etdikləri və buna bənzər şirk əməllərinə yol verdikləri zaman meydana gəlir.*

*2. Allahdan başqasına dua etmək kimi şirkdən çəkinmək. Uca Allah belə buyurmuşdur:*

***"Allahdan başqa, sənə nə bir xeyir, nə də zərər verə bilən** [tanrılara və bütlərə] **ibadət etmə! Əgər belə etsən, şübhəsiz ki, özünə zülm edənlərdən olarsan" (Yunus, 10/106)***

*Burada zalimlər dedikdə müşriklər nəzərdə tutulur.*

*3. İbadət edənləri Allaha yaxınlaşdırırlar iddiası ilə övliyalara ibadəti, Allahın yanında onların şəfaətini diləməyi təkzib etmək (rədd etmək) Bununla əlaqədar Uca Allah belə buyurmuşdur:*

***"… Allahı qoyub** [bütləri] **özlərinə dost tutanlar: "Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!" – deyirlər. Şübhəsiz ki, Allah ixtilafda olduqları məsələlər barəsində** [qiyamət günü] **onların arasında hökm edəcəkdir. Allah yalançı, nankor olan kimsəni doğru yola müvəffəq etməz!" (Zumər, 39/3)***

***"Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də zərər verə bilən bütlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!" – deyirlər. De ki: "Allaha göylərdə və yerdə** [Özünə şərik] **bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah Özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır!" (Yunus, 10/18)***

*Beləliklə, Uca Allah dua kimi hər hansı ibadəti Allahdan başqası üçün edən şəxslər haqqında küfr və şirk hökmünü vermişdir. Bunları edərkən həmin şəxsin Allaha yaxınlaşmaq və Allahın yanında olanlardan şəfaət istəmək məqsədinin heç bir fərqi yoxdur. Belə düşüncələr çağdaş zamanımızda bir çox müsəlmana, təəssüf ki, sirayət*

*etmişdir. Müsəlmandan soruşanda ki, sən bu övliyalara niyə dua edirsən? Cavab verir ki, mən onların vasitəsi ilə Allaha yaxınlaşmaq və Allah yanında onların şəfaətini istəyirəm.*

*4. Axirət gününə, haqq-hesab üçün insanların qəbirlərdən dirildiləcəklərinə iman gətirməyə dəvət etmək. Məkkədəki müşriklər bunu inkar edirdilər. Uca Allah isə onların bu niyyətini aşağıdakı buyruqları ilə rədd etmişdir:*

***"Kafir olanlar öldükdən sonra əsla dirilməyəcəklərini iddia edirlər.** [Ya Peyğəmbər!] **De ki: "Bəli, Rəbbimə and olsun ki, siz mütləq diriləcəksiniz. Sonra da etdiyiniz əməllər sizə xəbər veriləcəkdir. Bu, Allah üçün çox asandır!" (Təğabun, 64/7)***

*5. Bəlağətli danışıq qabiliyyətləri olmasına baxmayaraq ərəblərə bu Qurani Kərimə bənzər bir surə üzə çıxarmaları üçün meydan oxumaq. Uca Allah onlara:* ***"Yoxsa: "**[Peyğəmbər]* ***onu özündən uydurdu!" – deyirlər. De ki: "Əgər doğru deyirsinizsə, ona bənzər bir surə gətirin…" (Yunus, 10/36)*** *buyruğu ilə onlara meydan oxumuşdur.*

*6. Nuh qövmü, Hud qövmü, Saleh qövmü, Şueyb və Musa ilə daha başqa keçmiş və peyğəmbərəlirini yalançı sayan qövmlərin hekayətini yada salmaq. Uca Allah Məkkə müşriklərini təhdid edərək belə buyurmuşdur:*

*"[Ya Peyğəmbər!]* ***Məgər görmürsənmi ki, Rəbbin nələr etdi Ad qövmünə?! Sütunlar sahibi İrəm camaatına?! Elə bir qövm ki, məmləkətlər arasında onun kimisi yaradılmamışdı. Vadidə qayaları oyan Səmud qövmünə?! Eləcə də saysız-hesabsız ordular sahibi Firona?! O kəslər ki, məmləkətlərdə tüğyan edir. Oralarda çoxlu fitnə-fəsad törədirdilər. Nəhayət, Rəbbin onlara əzab qamçısı endirdi. Şübhəsiz ki, Rəbbin baxıb görür" (Fəcr, 89/6-14)***

*7. Səbrli olmağa dəvət etmək. Uca Allahın: "[Ya Peyğəmbər!]* ***Onların***[Σ31] ***sənə deyəcəklərinə***[Σ32] ***səbr et. Onlardan gözəl tərzdə ayrıl!" (Muzzəmmil, 73/10)*** *buyurduğu kimi.*

*8. Müşriklərə qarşı Quran ilə cihad etmək və ən gözəl üsulla onlarla mübarizə aparmaq. Uca Allahın aşağıdakı buyuruqlarında olduğu kimi: "[Ya Məhəmməd!]* ***Kafirlərə itaət etmə və onlara qarşı*** *[Quranla]* ***böyük bir cihad et!" (Furqan, 25/52), "…onlarla ən gözəl surətdə mübahisə et…" (Nəhl, 16/125)***

*9. Uluhiyyət tövhidini zəruri edən və rübubiyyət tövhidinə aid olan yaradılışla bağlı və əqli dəlillər tapmaq. Uca Allahın aşağıda gətirdiyimiz buyruğları buna misaldır:*

***"Məgər dəvəyə baxmırlar ki, necə yaradılmışdır? Göyə baxmırlar ki, necə ucaldılmışdır? Dağlara baxmırlar ki, necə dikəldilmişdir? Və yerə baxmırlar ki, necə döşədilmişdir? (Ğaşiyə, 88/17-20)***

*10. Məkkədə nazil olan Quran hissələri üslub etibarı ilə təhdid və əzab işarəsi ilə qulaqların diqqətlə dinləməsinə yönəldilmiş ağır kəlmələrin işlədilməsi ilə ayrı bir özəlliyə malikdir. Misal üçün Uca Allahın bu buyuruqlarına baxaq:*

***"Ürəkləri dəhşətə salan qiyamət" (Qariə, 101/1);***

***"Nəhayət, qulaqları kar edən o dəhşətli səs***[Σ33] ***gələndə…" (Əbəsə, 80/33);***

*[Ya Peyğəmbər! Dəhşəti aləmi]* ***bürüyəcək qiyamətin xəbəri sənə gəlib çatdımı? (Ğaşiyə, 88/1);***

***"Qiamət vaqe olacağı vaxt" (Vaqiə, 56/1);***

---

Σ31 Məkkə müşriklərinin.
Σ32 Batil söz və iftiralarına.
Σ33 İsrafil surunu çalanda.

***"Yox, yox!*** *[Əbu Cəhl bu yaramaz əməllərinə son qoysun]. **Əgər son qoymasa, and olsun ki, Biz onu kəkilindən yapışıb** [Cəhənnəmə] **sürükləyəcəyik…" (Ələq, 96/15)***

*Buradakı "yox, son qoysun" ibarəsi kəskin tənbeh və törədiləcək bir işdən qəti şəkildə çəkindirmək üçündür.*

## *Mədinədə nazil olan hissələrin səciyyəvi xüsusiyyətləri*

*Mədinədə nazil olan Quran hissələri mövzu etibarı ilə əksəriyyətcə aşağıdakı xüsusiyyətlər üzrədir:*

*1. Allah yolunda cihada və şəhidliyə dəvət. Çünki müsəlmanlar Mədinəyə köçüb hicrət etmiş, orada İslam dövlətini qurmuşdular. Bilavasitə öz dinlərini və dövlətlərini müdafiə etmək ehtiyacı yaranmışdı. Buna görə Qurani Kərimin Mədinədə nazil olan hissələrinin mühacirləri savaşa sövq etdiyini görürük. Məsələn, Uca Allah belə buyurmuşdur:*

***"Allah, şübhəsiz ki, Allah yolunda vuruşub öldürən və öldürülən möminlərin canlarını və mallarını Tövratda, İncildə və Quranda haqq olaraq vəd edilmiş Cənnət müqabilində satın almışdır. Allahdan daha çox əhdə vəfa edən kimdir?..." (Tövbə, 9/111)***

*2. İslam əhkamını açıqlamaq. Uca Allahın tərk etməyənlərə qarşı savaş elan etdiyi faiz haqqında hökm ilə bağlı buyuruq buna misaldır. Uca Allah belə buyurmuşdur:*

***"Ey möminlər! Əgər, doğrudan da, iman gətirmişsinizsə, Allahdan qorxub sələmdən qalan məbləğdən** [faizdən] **vaz keçin! Əgər belə etməsəniz, o zaman Allaha və Onun Peyğəmbərinə qarşı müharibəyə girişdiyinizi bilin! Yox,***

***əgər tövbə etsəniz, sərmayəniz** [mayanız] **sizindir. Beləliklə, nə siz zülm edərsiniz, nə də sizə zülm olunar!" (Bəqərə, 2/278-279)*.***

*3. Cəza tədbirləri ilə bağlı hökm vermək. Cəmiyyətdə təhlükəsizlik və sabitliyin təmin edilməsi – zinakarlığa, oğruluğa və bu qəbildən olan cinayətlərə qarşı müəyyənləşdirilmiş tədbirlər kimi. Məsələn, Uca Allah zina edənin cəzalandırılması haqqında belə buyurmuşdur:*

***"Zinakar kişiyə və zinakar qadına yüz çubuq vurun. Allaha və axirət gününə inanırsınızsa, Allahın dini barəsində ürəyiniz onlara***[Σ34] ***yumşalmasın və möminlərdən bir dəstə də onların əzabına şahid olsun"***[Σ35] ***(Nur, 24/2)***

*Oğruluğa qarşı cəza tədbirləri barədə Uca Allah belə buyurmuşdur:*

***"Oğru kişi ilə oğru qadının gördükləri işin əvəzi kimi Allahdan cəza olaraq əllərini kəsin. Allah yenilməz qüvvət və hikmət sahibidir!" (Maidə, 5/38)***

*4. Münafiqləri zəlil etmək və iç üzlərini ifşa etmək, mənəvi keyfiyyətlərini üzə çıxarmaq. Məsələn, Uca Allah onların münafiqliyini aşkar etmək barədə bunları söləmişdir:*

*"[Ya Peyğəmbər!]* ***münafiqlər*** *[riyakarlar]* ***sənin yanına gəldikləri zaman: "Biz sənin, doğrudan da, Allahın Peyğəmbəri olduğuna şəhadət veririk!"- deyirlər. Allah sənin Onun həqiqi peyğəmbəri olduğunu bilir. Allah həm də***

---

* Təkcə bu ayələr bəs edir ki, qərb-şərq "demokratlarının" İslama qarşı mübarizəsində nə qədər aciz və insan hüquqlarının "müdafiəçiləri" kimi saxtakar olduqları özü-özünü ifşa etsin!!! (F.S.)

Σ34 Zinakarlara.

Σ35 Bu cəza, subay kişiyə və ərsiz qadına aiddir. Evli kişi və qadın zinakarlıq etdikdə isə onların cəzası daşqalaq edilməkdir.

***münafiqlərin xalis yalançı olduqlarına şəhadət verir" (Munafiqun, 63/1)***

*5. Yəhudiləri və digər kitab əhlini susdurmaq və onlara qarşı dəlil qoymaq məqsədilə onlarla mübahisəyə girmək. Uca Allahın bu buyuruqlarında olduğu kimi:*

***"Kitab əhlinin zülm edənləri***[Σ36] ***istisna olmaqla, onlarla ən gözəl tərzdə mücadilə edin!..." (Ənkəbut, 29/46)***

*6. Möminlərin düşmənləri ilə apardıqları döyüşlərdə qələbənin həqiqətlərini üzə çıxarmaq. Uca Allahın bu buyruğunda göründüyü kimi:*

***"****[Ya Məhəmməd!]* ***Həqiqətən, siz Bədrdə az və zəif olduğunuz halda, Allah sizə yardım etdi…" (Ali-İmran, 3/123),*** *(Bax: Mənnə əl-Qattan, Məbəhisu fi Ulumil-Quran)*

[Σ36] Cizyə verməyənləri, sizinlə vuruşmaq istəyənləri.

## *Məkkə və Mədinə ayələrini bilməyin faydaları*

*1. Quranın təfsirində bu biliklərdən yararlanmaq. Şübhəsiz ki, bu ayələrin endirildiyi yeri bilmək, kərim ayəni tam şəkildə anlayıb şərh etməyə kömək edərdi. Hikmət ayənin hansı səbəbdən nazil olmasında deyil, məhz kəlmənin daşıdığı ümumi mənadadır. Təfsirçi iki ayənin mənası arasında bir ziddiyyət gördüyü təqdirdə bunun təsiri altında onların hansı birinin nəsxedici, hansınınsa mənsux olduğunu ayırd edə bilir. Çünki sonradan gələn buyuruq əvvəlki buyruğu nəsx edəndir.*

*2. Quranın üslublarının gözəlliyinə varmaq və Uca Allaha dəvət üslubunu işləyib hazırlayarkən bundan faydalanmaq. Çünki hər bir vəziyyətdə özünə görə söz demə tərzi vardır. Vəziyyətin tələb etdiyini nəzərə çapdırmaq isə danışıq qabiliyyətinin ən incə sahələrindən biridir. Qurani Kərimdə Məkkə və Mədinədə nazil olan buyuruqların xüsusiyyəti onları tədqiq edən şəxslərə Uca Allaha dəvət yolunda sözlə müraciət edilənin ruhi vəziyyətinə uyğun olaraq təsir üsullarının seçilməsi üçün vasitə rolunu oynayır. Çünki dəvətin hər bir mərhələsinin özünə görə mövzuları və üslubları mövcuddur. Bu xüsusiyyət, Qurani Kərimin möminlərə və yaxud müşriklərə, riyakarlara və kitab əhlinə müraciəti əsnasında işlətdiyi müxtəlif üslublarda özünü aydın biruzə verir.*

*3. Quran ayələri işığında Peyğəmbər sallalahu əleyhi və səlləmin həyat tarixini öyrənmək. Çünki Qurani-Kərim Peyğəmbər sallalahu əleyhi və səlləmin həyat tarixinin əsil mənbəyidir. (Bax: Məbəhis fi Ulumil-Quran)*

*4. Məkkə surələrinin sayı – 82 surədir.*

*Mədinə surələri isə iyirmidir. Məkkə və Mədinəyə aidiyyətinə dair müxtəlif rəy söylənən surələr 12-dir. Cəmi 114 surə vardır. Quran ayələrinin sayı 6236-dır.*

## *Məkkə surələrində Mədinə ayələri və Mədinə surələrində Məkkə ayələri*

*Mədinə surələrində olan Məkkə ayələri. Hər hansı bir surənin Məkkə və ya Mədinə surəsi olmasını deməkdən məqsəd onun heç də bütövlükdə belə olduğunu demək deyildir. Bəzi hallarda bir Məkkə surəsində Mədinə ayələri olduğu kimi, Mədinə surəsində də Məkkə ayələri olur. Belə hallarda, bu, həmin surənin ayələrinin çoxluğu ilə bağlı olan bir keyfiyyətdir. Buna görə surənin adı ilə birgə filan surə Məkkə surəsidir və bu ayələr isə Mədinə ayələridir, filan surə Mədinə surəsidir, ancaq bu ayələr Məkkədə nazil olmuşdur deyilir. Beləliklə, mushaflarda (Quran nüsxələrində) bunun belə olduğunu görürük.*

*Bir Mədinə surəsində Məkkə ayələrinin olmasına misal. "Ənfal" surəsi Mədinə surəsidir. Lakin elm adamlarının əksəriyyəti Uca Allahın aşağıdakı buyuruğunu istisna etmişdir:*

***"****[Ya Rəsulum!]* ***Yadına sal ki, bir zaman kafirlər səni həbs etmək və ya öldürmək, yaxud da*** *[Məkkədən]* ***çıxardıb qovmaq üçün*** *[Darunnədvədə]* ***sənə qarşı hiylə qururdular. Allah da***[Σ37] ***tədbir tökdü. Allah tədbir tökənlərin ən yaxşısıdır" (Ənfal, 8/30)***

*Muqatil demişdir ki, bu kərim ayə Məkkədə endirilmişdir. Bu, ilk nəzərdən də belə görünür. Çünki bu kərim ayə hicrətdən əvvəl məkkəli müşriklərin Dərun-Nədvədə Peyğəmbərə (sallallahu əleyhi və səlləm) sui-qəsd hazırlanmasını yada salır. (Bax: Məbahis fi Ulumil-Quran)*

---

Σ37 Onların hiyləsinə qarşı.

## *Qurani Kərimin Məkkədə və Mədinədə nazil olmuş hökmləri nə vaxt tətbiq edilir?*

*Şeyxülislam İbn Teymiyyə, əziyyətlərə qarşı səbr etməyə dəvət edən, kafirlərə qarşı cəbhə yaratmamağı istəyən Qurani Kərimin Məkkədə nazil olan ayələrinin müsəlmanlar zəif halda olarkən tətbiq ediləcəyi fikrindədir. Cihada və güc göstərməyə çağıran və Qurani Kərimin Mədinədə nazil olann ayələri isə müsəlmanlar güclü olacaqları zaman tətbiq ediləcəyini qəbul edir. O, bu fikirlərini aşağıdakı sözlərlə aydınlaşdırır:*

*"Artıq bu ayələr Allahın və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) dininə əli və dili ilə kömək etməyə imkan tapmayan hər bir məzlum mömin bəndə haqqındadır. Belə bir vəziyyətdə olan hər kəs, gücü necə çatırsa, qəlbi ilə və bu kimi digər yollarla Allahın dininə kömək edir. Əhd bağlamışlar (zimmilər[Σ38]) haqqındakı zəlillik ayəsinin (bax: ət-Tövbə, 9/29) Allahın və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) dininə əli ilə və yaxud dili ilə kömək etməyə özündə güc tapan bütün möminlər haqqında (tətbiq edilməsi) istənilir. Müsəlmanlar bu və buna bənzər ayələrə Peyğəmbərin (sallallahu əleyhi və səlləm) həyatının son dövrlərində və Raşid xəlifələrinin dövründə əməl edirdilər. Qiyamətin qopacağı günə qədər bu belə olacaqdır. Bütün zamanlarda Allahın və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) dininə tam mənasıyla kömək edən və haqq tərəfdarı olan bir təbəqə bu millətdən olacaqdır. Möminlərin məzlum olduqları bir yerdə və yaxud da məzlum olacaqları bir zamanda yaşayacaq bir şəxs isə, kitab əhlindən və müşriklərdən Allaha və Peyğəmbərə (sallallahu əleyhi və səlləm) əziyyət verənləri əfv edərək bağışlamaq və səbr*

---

[Σ38] ***Zimmilər*** – müsəlman olmayıb müqavilə əsasında müsəlman ölkəsində yaşayan şəxs (Bax: Ömer Sevincgül, "Özel lüğat", İstanbul, 2003, ZAFER yayınları, Birinci nəşr, səh. 925.)

*etməklə bağlı ayələrə əməl etsin. Güc və qüdrət sahibi olan şəxslər isə dinə hücum edən küfr başçılarıyla, döyüş ayəsində nəzərdə tutulan kitab əhli ilə cizyəni, onlar, alçaldılmışlar kimi, öz əlləri ilə verincəyə qədər, onlarla döyüşməyi əmr edən ayəyə əməl etsin. (əs-Sarimul-Məslul, s. 221)*

*Qeyd etməliyəm ki, şeyxulislam İbn Teymiyyənin bu sözünü Uca Allahın aşağıdakı ayəsi təsdiq edir:*

***"[Ya Peyğəmbər!] İman gətirənlərə de ki, Allah etdiyi əməllərə görə hər hansı bir qövmün cəzasını versin deyə, Allahın [əzab] günlərindən qorxmayanları[Σ39] bağışlasınlar![Σ40] (əl-Casiyə, 45/14)***

*Uca Allah Peyğəmbərinə (sallallahu əleyhi və səlləm) möminlərə, hicrətdən əvvəl Məkkədə müsəlmanların hələ zəif olduqları günlərdə belə deməsini əmr etmişdi:* ***Kafirlərdən sizə əziyyət verənləri əfv edin, bağışlayın. Sizə edilən əziyyətin əvəzini eynilə verməyin.*** *Məhz bu, müsəlmanların zəif olduqları zaman kafirlərə qarşı İslamın dözümlə davranma şərtlərinə dəlildir.*

*Yaxşı olardı ki, özünü İslam millətinə[Σ41] aid firqələr Allahın köməyi gəlincəyə qədər səbr edib əfv etməyə çağıran və Qurani Kərimin Məkkə dövründə nazil olmuş buyruqlarını tətbiq edəydilər.*

---

[Σ39] *Əzab günlərinə, qiyamətə inanmadıqları üçün gözləməyənləri* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 553.)

[Σ40] *Bu ayənin hökmü hökmü sonralar cihad haqqındakı ayə ilə ləğv edilmişdir* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 553.

[Σ41] ***İslam milləti*** – burada: milli mənsubiyyətindən asılı olmayaraq, İslam dinini qəbul etmiş insanlar məcmusudur.

## *Biz müsəlmanların vəzifəsi*

*1. Şəriət qanunlarına birinci özümüz riayət etməliyik. Çünki bəziləri şəriət hökmlərini özləri yerinə yetirmədikləri halda cihada və İslamın hökmran olmasına çağırdıqlarını görürük.*

*2. Müsəlman rəhbərlərini və onların köməkçilərini hikmət, gözəl nəsihət və mehriban sözlərlə İslam qanunlarını tətbiq etməyə çağırmalıyıq. (Musa və Harunun Firona müraciət etdikləri kimi)*

*3. Zəif olduğumuz zaman edəcəyimiz cihad Peyğəmbərin (sallallahu əleyhi və səlləm) bu əmrinə əməl edilərək malla və dillə olmalıdır:*

*"Müşriklərlə mallarınızla, canlarınızla və dillərinizlə cihad edin" (Hədis səhihdir, Əbu Davud tərəfindən rəvayət edilmişdir)*

*4. İslam millətini ayrı-ayrılıqda bir fərd və bütöv cəmiyyət kimi İslam qanunlarını birinci olaraq elə özlərinin yerinə yetirməsinə dəvət etməliyik ki, İslam qayda-qanunlarını qəlbən istəyərək və öz torpağlarında onu tətbiq etməyi arzulamaqla kamala yetişsinlər.*

*Müasir İslam dəvətçilərindən biri belə demişdir: "İslam dövlətini qəlblərinizdə qurun ki, sizin üçün o, yer üzündə də qurulsun".*

*4. Əvvəlcə əqidədir, yoxsa hakimiyyət? Görkəmli dəvətçi Məhəmməd Qutub bu suala Darul-Hədis əl-Məkkiyyədə keçirdiyi bir konfransda cavab vermişdir. Həmin sual və cavab budur:*

*Sual: Bəziləri deyir ki, İslam hakimiyyət yolu ilə qayıdacaqdır. Bəziləri də, İslam əqidənin təhriflərdən təmizlənməsi və ictimayi tərbiyə vasitəsiylə geri qayıdacaqdır deyirlər. Bunların hansı biri doğrudur?*

*Cavab: Əgər əqidəsini saflaşdıran və ona doğrudan da iman gətirən, dini uğrunda əzablara məruz qalıb səbr edən, Allah yolunda cihad edən dəvətçilər tapılmayacaqsa, bu din hakimiyyətə necə gələ bilər, Allahın hökmü yer üzündə necə hökm sürəcək? Həqiqətən, bu çox aydın bir məsələdir. Hökm göydən enmir. Hökm göydən endirilmir. Bəli, hər şey səmadan gəlir. Fəqət, bu, Uca Allahın insanların yerinə yetirmələrini vacib bildiyi səylərin nəticəsində olacaqdır. Necə ki:*

***"…Əgər Allah istəsəydi onlardan intiqam ala bilərdi. Lakin O sizi bir-birinizlə imtahana çəkmək üçün (****vuruşmağınızı əmr etdi****) (Məhəmməd, 47/4)***

*Əqidəni saflaşdırmaq və pak əqidəylə tərbiyə almış bir nəsil yetişdirmək üçün işə başlamamız qaçınılmazdır. Bu nəsil bəlalara məruz qalacaq. Lakin birinci nəsil necə səbr etmişdisə, o da beləcə bəlalara səbr edəcək.*

## *Quranın hissə-hissə endirilməsi və bunun hikmətləri*

*Qurani Kərim müxtəlif hadisə və münasibətlərə uyğun olaraq Peyğəmbərə (sallallahu əleyhi və səlləm) hissə-hissə nazil edilmişdir. Bunun çox böyük hikmətləri vardır:*

*1. Peyğəmbərin (sallallahu əleyhi və səlləm) qəlbini sabitləşdirmək. Kafirlərin Qurani Kərimin hissə-hissə endirilməsinə etiraz etmələrinə də Uca Allah, həmin hikməti bir də göstərərək, aşağıdakı cavab hökmünü vermişdir:*

***"Kafirlər: "Quran ona [****Məhəmmədə****] bütöv, birdəfəltk endirilməli idi!" – dedilər. [****Ya Peyğəmbərim!****] sənin ürəyinə***

***səbat, qətiyyət vermək üçün Biz onu ayə-ayə, tədriclə nazil etdik"***[Σ42] ***(Furqan, 25/32)***

*Görkəmli elm xadimi Əbu Şamə deyir ki, əgər Quranın hissə-hissə endirilməsindəki sirr nədədir? Nə üçün digər kitablar kimi o birdəfəlik nazil edilmədi? – deyə soruşularsa, cavabımız –Uca Allahın cavab verdiyi bu sualdır. Uca Allah belə buyurmuşdur:* ***"Kafirlər: "Quran ona*** *[Məhəmmədə]* ***bütöv, birdəfəlik endirilməli idi!" – dedilər" (Furqan, 25/32)*** *Onlar bu sözləri ilə niyə bundan əvvəlki peyğəmbərlərə nazil edildiyi kimi (birdəfəlik) endirilmədi demək istəyirlər. Uca Allah onlara bu buyruğu ilə cavab verir:* ***"Biz onunla"*** *yəni onu hissə-hissə nazil etməklə Peyğəmbərin (sallallahu əleyhi və səlləm) "…****ürəyinə səbat vermək üçün Biz onu ayə-ayə nazil etdik"*** *ürəyini bərkidək deyə belə etdik. Çünki vəhy hər bir hadisə ilə yeniləşdikcə, risalət verilən qəlbi daha da çox möhkəmlədir və ona daha çox diqqət yetirilir. Bu vəziyyət mələyin onun yanına tez-tez gəlməsini və onunla təkrar-təkrar görüşməsini zəruriləşdirir. Uca Allahın yanından gələn mələk özü ilə gətirdiyi risalətə Peyğəbərin (sallallahu əleyhi və səlləm) qovuşmasını təmin edir. Bunun nəticəsində O (sallallahu əleyhi və səlləm) ifadə edilməyəcək qədər böyük sevinc hissi keçirirdi. Elə buna görə də, Peyğəmbərin (sallallahu əleyhi və səlləm) ən çox səxavətli olduğu dövrlər Ramazan ayına təsadüf edirdi. Çünki bu ayda Cəbrail ilə tez-tez qarşılaşırdı" (Bax: Suyuti, İtqan, 1/42)*

*2. Dəvət etmə və icaz (aciz qoyma). Kafirlər Quranın onlar haqqında bildirdiyi kimi, onun hissə-hissə nazil edilməsi ilə razılaşmırdılar. Onlar Quranın hissə-hissə endirilməsinə təəccüb etdiklərinə görə Uca Allah da onları*

---

[Σ42] *Quranın az-az endirilib, ağır-ağır oxunması onun əzbərlənməsini və mənalarının anlaşılmasını asanlaşdırır* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 419)

*dəvət etdi ki, onun kimi bir surə meydana çıxarsınlar. Onlar isə Allahın bu çağırışı qarşısında aciz qaldılar. Hissə-hissə halında nazil edilmiş Quranla onlara göndərilən dəvət, birdəfəlik nazil edilmişlə müqayisədə daha güclü və üstün bir dəlildir. Çünki hissə-hissə endirilmiş halda olan Quranın bir surəsinə oxşarını araya çıxarağa aciz qalanların bütöv halda nazil edilmişə bərabər bir şey icad edə bilmələri daha da mümkünsüzdür.*

*Beləcə İbn Abbasın Quranın nazil olması ilə bağlı rəvayət etdiyi hədisin hekayətlərindən birində məhz bu hikmətə işarə edilmişdir: "Müşriklər ortaya yeni bir şey atanda Uca Allah da onlara yeni bir cavab verirdi" (İbn Əbi Hatim)*

*3. Quranı əzbərləməyin və anlamanın asanlaşdırılması:*

*Qurani Kərimin hissə-hissə nazil edilməsi insanların onu əzbərləməsini və başa düşməsini asanlaşdırır. Xüsusilə də, əgər onlar, Quranın dili ilə desək "ərəblər kimi savadsız bir topluma məxsusdurlarsa". Buna görə Quranın hissə-hissə nazil edilməsi onlar üçün, Quranı əzbərləmək və başa düşmək baxımından, daha böyük kömək və asan idi. Bir və ya bir neçə ayə nazil olduqca möhtərəm əshabələr onu əzbərləyir, başa düşmək üçün düşünür və lazımınca əməl edirdilər. Bundan başqa Ömər (A.o.r.) belə demişdir: "Quranı beş ayə, beş ayə öyrənin. Çünki Cəbrail əleyhissəlam Peyğəmbərə (sallallahu əleyhi və səlləm) Quranı beş ayə, beş ayə nazil edirdi" (Beyhəqi, Şuabul-İmanda rəvayət etmişdir, sənədi səhihdir)*

*4. Quranı Kərimdə vəhy edilmiş hökmləri qəbul etməyə və onlara lazımınca əməl etməyə möminlərdə ruh yüksəlikliyi yaratmaq.*

*Müsəlmanlar ayələr nazil olanda rüh yüksəkliyi duyurdular. Xüsusilə də, böhtan (məsələn, anamız Aişəyə*

*iftira) və lənətləmə (ərin şahid gətirmədən arvadının zinakarlıq etməsini bildirməsi kimi edilən lənətləmə) ilə bağlı ehtiyac duyulan ayələr olduqda.*

*5. Hökmvermədə hadisələrin axınını və ardıcıllığını nəzərə çarpdırmaq.*

*Qurani Kərimin nazil edilməsində bir tədricilik məqamı var idi. Quran daha əhəmiyyətli olanı əhəmiyyətli olandan qabağa çəkirdi.*

*a. Qurani Kərim ilk növbədə Allaha, mələklərinə, kitablarına, peyğəmbərlərinə, axirət gününə, axirət günündə əhəmiyyət kəsb edəcək ölümdən sonrakı dirilməyə, hesab, cənnət, cəhənnəm kimi imanın əsaslarına dair dəlilləri (müşriklərin qəlblərindəki yanlış etiqadları kökündən çıxartmaq və o qəlblərə İslam əqidəsini aşılamaq üçün) araşdırmağı vacib saydı.*

*b. Daha sonra gözəl əxlaqlı olmağa həvəsləndirdi, həyasızlıqlara və inkar edilən şeylərə qadağa qoydu. Belə vasitələrlə pisliyin və şərin köklərinin kəsilməsini nəzərdə tutdu. Namus, can, mal, yemək, içmək və buna bənzər şeylərin halal və ya haram olmasına dair qaydaları elan etdi.*

*c. Qurani Kərim, müsəlmanların Uca Allahın kəlməsini ucaltmaq üçün girişdikləri davamlı bir mübarizə dövründə üz-üzə qaldıqları hadisələrə uyğun olaraq nazil edilir və bu yöndə onları ruhlandırırdı. (Bax: Məbəhis fi Ulumil-Quran)*

## *Qurani Kərimin tədriclə nazil edilməsinə dair nümunələr*

*1. Məkkə dövrünə aid "Ənam" surəsi imanın əsaslarını, tövhidin dəlillərini açıqlamq, şirkdən çəkindirmək,*

*halal və haram olan şeyləri bəyan etmək üçün nazil olmuşdur. Uca Allah belə buyurur:*

*"[Ya Rəsulum!]* ***De: "Gəlin Rəbbinizin sizə nələri haram etdiyini deyim: Ona heç bir şərik qoşmayın; ata-anaya yaxşılıq edin; kasıblıq üzündən uşaqlarınızı öldürməyin. Sizin də, onların da ruzisini Biz veririk…" (Ənam, 6/151)***

*Bundan sonra bu hökmlər Mədinədə nazil edilmiş ayələrdə geniş şəkildə açıqlandı. Borclu olma və faizin haram hesab olunması haqqında ayələr kimi. Zinakarlıq əsas etibarilə Məkkədə haram edilmişdi. Uca Allah buyurur ki:*

***"Zinaya da yaxın düşməyin. Çünki o, çox çirkin bir əməl və pis bir yoldur!" (İsra, 17/32)***

*Bununla bağlı cəzalar isə Mədinədə nazil olmuşdur.*

*2. Hökmlərin verilməsində tədricliyin ən aydın nümunələrindən biri də içkinin haram edilməsidir. Uca Allah:* ***"Siz xurma ağaclarının meyvəsindən və üzümündən şərab və gözəl ruzi düzəldirsiniz…" (Nəhl, 16/67)*** *ayəsi ilə ruzini gözəl adlandırmaqla bərabər şəraba və sərxoşluğa belə qiymət verməmişdir. Bu da şərabın bəyənilməməsinə bir işarədir. Sonra isə Uca Allahın:*

*"[Ya Rəsulum!]* ***Səndən içki və qumar haqqında sual edənlərə söylə: "Onlarda həm böyük günah, həm də insanlar üçün mənfəət vardır. Lakin günahları mənfəətlərindən daha böyükdür!.." (Bəqərə, 2/219)*** *ayəsi nazil oldu. Kərim ayə şərabın keçici faydaları ilə birgə, içki içmənin günahını və ondan doğan cismani və ruhi pozuntuları, malı israfla xərcləməyi, abırsızlıq və qarşıdurmaya aparan səbəbləri qızışdırması şəklində üzə çıxan zərərləri birgə müzakirə mövzusu etdi. Sonra da zərərlərin mənfəətdən daha çox olduğunu bildirərək kərim ayə içkiyə nifrət təlqin edərək onu*

*müsəlmanlardan uzaqlaşdırdı. Sonradan Uca Allahın bu ayəsi nazil oldu:*

***"Ey iman gətirənlər! Sərxoş ikən nə dediyinizi anlamayana qədər… namaza yaxınlaşmayın…" (Nisa, 4/43)***

*Beləliklə, namaz vaxtlarında içkinin haram olduğu bilindi. Sonradansa Uca Allahın bir başqa ayəsi nazil oldu.*

***"Ey iman gətirənlər! Şərab da, qumar da, bütlər də, fal oxları da Şeytan əməlindən olan murdar bir şeydir. Bunlardan çəkinin ki, bəlkə, nicat tapasınız!" (Maidə, 5/90)***

*3. Bu hikmətə Aişənin (A.o.r.) aşağıdakı sözləri aydınlıq gətirir:*

*"Şübhəsiz ki, ilk nazil olan (Quranın) Müfəssəl kimi tanınan hissələrindən bir surədir. O surədə cənnət və cəhənnəmdən bəhs edilir. Nəhayət, insanlar İslam tərəf üz tutduqda halal və haram hökmləri nazil edildi. Əgər ilk növbədə şərab içməyin qadağan edilməsi haqqında ayə nazil edilmiş olsaydı, "biz qəti surətdə şərabı tərk etmərik" deyərdilər və yenə də, əgər zinakarlıq etməyin qadağan olması haqqında (hökm əvvəlcədən) nazil olsaydı, onda da, "heç vaxt zinakarlıqdan əl çəkmərik" deyərdilər" (Buxari)*

## *Qurani Kərimin bəzi xüsusiyyətləri*

*1. Quran Peyğəmbərimiz Məhəmmədə (sallallahu əleyhi və səlləm) nazil edilmiş Fatihə surəsi ilə başlanmış və Nəs surəsi ilə tamamlanmış Allah sözüdür.*

*2.Namazda və namazdan kənar Quran oxumaqla ibadət edilir. Quranın oxunması üçün savab verilir. Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurur:*

*"Kim ki, Allahın Kitabından bir hərf oxusa, onun üçün o hərfin əvəzində bir savab vardır. Hər bir savab da on misli ilə mükafatlandırılır. Mən sizlərə "əlif, ləm, mim" bir hərfdir demirəm. Fəqət, əlif bir hərf, ləm bir hərf və mim də bir*

*hərfdir" (Səhih hədis olaraq Tirmizi tərəfindən rəvayət edilmişdir)*

*Qurani Kərimin müxtəlif surələrinin oxunmasına dair səhih hədislər vardır. Bəqərə, Ali-İmran, Mülk və muavvizlər (Fələq, Nas) ilə daha başqa surələr haqqında varid olmuş hədislər kimi.*

*3.Quran oxunmadan namaz səhih olmaz. Çünki Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur:*

*"Kitabın Fatihəsini oxumayanın namazı yoxdur" (Buxari və Muslim)*

*4. Quran təhrif və təbdil edilməmişdir. Çünki Uca Allah belə buyurur:* ***"Şübhəsiz ki, Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu[Σ43] qoruyub saxlayacağıq" (Hicr, 15/9)***

*Tövrat və İncil kimi digər səmavi kitabları isə yəhudilər və xristianlar təhrif ediblər.*

*5. Qurani Kərimdə ziddiyyət yoxdur. Uca Allah belə buyurur:*

***"Onlar Quran barəsində[Σ44] düşünməzlərmi? Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət tapardılar" (Nisa, 4/82)***

*6.Quranın əzbərlənməsinin asanlaşdırılması. Uca Allah belə buyurur:* ***"And olsun ki, Biz Quranı ibrət almaq üçün belə asanlaşdırdıq. Amma heç bir ibrət alan varmı?!" (Qəmər, 54/40)***

*7. Qurani Kərim möcüzədir (aciz qoyur). Kimsə heç vaxt onun kimi bir surə yarada bilməz. Uca Allah ərəblərə*

---

Σ43 *Hər cür təhrif və təbdildən; artırıb-əksiltmədən* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 320)

Σ44 *Onun Allah kəlamı olması haqqında* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 184)

*belə çağırış yollamış, onlar isə aciz qalmışlar. Uca Allah belə buyurur:*

***"Yoxsa: "[****Peyğəmbər****] onu özündən uydurdu!" – deyirlər. De: "Əgər doğru deyirsinizsə, ona [****Qurana****] bənzər bir surə gətirin…" (Yunus, 10/38)***

*8. Qurani Kərimi oxuyanlara sükunət (rahatlıq və sakitlik) və mərhəmət nazil olur. Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur:*

*"Əgər bir dəstə insan Allahın evlərindən birində bir yerə yığışıb Allahın kitabını oxusalar və öz aralarında onu öyrənsələr, mütləq onlara sükunət (rahatlıq və sakitlik) nazil olur. Rəhmi onları bürüyür, mələklər ətraflarını əhatəyə alır, Allah onları Öz dərgahında olanların arasında anır" (Muslim və başqaları rəvayət etmişlər)*

*9.Quran dirilər üçündür, ölülər üçün deyil. Uca Allah Qurani Kərim haqqında belə buyurur:*

***"Onunla diri olanları[Σ45] qorxutsun və o deyilən söz[Σ46] kafirlər barəsində gerçək olsun" (Yasin, 36/70)***

***"İnsana ancaq öz zəhməti qalar!" (Nəcm, 53/39)***

*İmam Şafii bu kərim ayədən Quranın oxunmasının savabının ölülərə bağışlanmasının onlara çatmayacağı nəticəsinə gəlmişdir. Çünki belə bir iş onların zəhməti deyildir.*

*Övladın öz ata-anası üçün Quran oxumasına gəlincə, onun savabı onlara çatır. Çünki uşaq, şərif hədisdə deyildiyi kimi, atanın zəhmətidir (əməlidir): "...Şübhəsiz ki, insanın övladı öz qazancıdır" (Camiul-Usulun tədqiqatçısı bu hədisin səhih olduğunu bildirmişdir)*

---

[Σ45] *Ağıl və bəsirət sahiblərini* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 499)

[Σ46] *Əzəldən buyurduğumuz əzab hökmü* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 499)

*10. Quran şirk, münafiqlik və buna oxşar digər xəstəliklərdən qəlblərə şəfa verir. Onun bəzi kərim ayələri və surələri bədən üçün bir əlacdır*[Σ47]*. Fatihə surəsi, Fələq və Nəs surələri, bunlardan başqa səhih Sünnə ilə sabitləşmiş bir sıra başqa buyruqlar da buraya daxildir. Uca Allah belə buyurur:*

***"**[Ey insanlar!]* ***Sizə Rəbbinizdən bir öyüd-nəsihət, ürəklərdə olana**[Σ48]* ***bir şəfa, möminlərə hidayət və mərhəmət gəlmişdir!" (Yunus, 10/57)***

***"Biz Qurandan möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik…" ((İsra, 17/82)***

*11.Quran onu oxuyana şəfaət edəcək. Çünki Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur:*

*"Quran oxuyun, çünki o qiyamət günündə onu oxuyanlara şəfaətçi olaraq gələcəkdir" (Muslim)*

*12. Quran özündən əvvəlki kitablara münasibətdə hakim rolundadır. Uca Allah belə buyurur:*

***"Biz** [Quranı]* ***sənə haqq olaraq, özündən əvvəlki kitabı**[Σ49]* ***təsdiq edən və onu qoruyan olaraq endirdik…" (Maidə, 5/48)***

*İbn Kəsir buradakı* ***"… təsdiq edən və onu qoruyan…"*** *buyruğuna aydınlıq gətirərkən müxtəlif nəzər nöqtələrinə toxunduqdan sonra aşağıdakıları deyir:*

*"Bütün bu sözlər məna baxımından bir-biri ilə yaxındır. Çünki "muheymin (şahid)" bütün bunları əhatə edir. O özündən əvvəlki bütün kitablardan etibarlı bir şahid və hakimdir. Kitabların sonuncusu və bitdiyini bildirən bu*

---

[Σ47] Şəfa tapmaq, müalicə olunmaq vasitəsidir.

[Σ48] *Cəhalətə, şəkk-şübhəyə, nifaqa* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 277)

[Σ49] *Bütün ilahi kitabları* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 201)

*əzəmətli Kitab bütün səmavi kitabların ən əhatəlisi, ən böyüyü və ən mükəmməlidir. Məhz bu Kitabda ondan əvvəlki bütün gözəlliklər toplandığı kimi, digərlərində olmayan bir çox kamillik xüsusiyyətləri vardır. Buna görə, Uca Allah onu qorumağı Öz üstünə götürmüşdür" (İbn Kəsir, Təfsr, II, 65)*

*13. Qurani Kərimin verdiyi xəbərlər doğru, hökmləri də ədalətlidir. Uca Allah belə buyurur:*

*"[Ya Rəsulum!]* ***Rəbbinin sözü düzgün və ədalətli şəkildə tamam oldu…" (Ənam, 6/115)***

*Qatadə demişdir ki, o Kitabın sözləri doğru, hökmləri ədalətlidir. Verdiyi xəbərlərdə həqiqəti söyləyir, qayələri də alidir. O, nədən xəbər verirsə, haqqdır. Onda hər hansı mübahisə və tərəddüdə yer yoxdur. Hər hansı bir məsələ haqqında hökm verərsə, onun ədalətli olacağı qədər başqa ədalət yoxdur. Nəyi qadağan edərsə, o – batildir. Çünki o, ancaq pisliyi və pozğunluğu qadağan edir. Beləliklə, Uca Allah belə buyurur:*

***"O kəslər ki, … ümmi peyğəmbərə tabe olurlar…*** *[O,]* ***onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər, təmiz nemətləri halal, murdar şeyləri haram edər…" (Əraf, 7/157)*** *(Bax: İbn Kəsir, II,167)*

*14. Qurani Kərimdəki hekayətlər xəyal deyil, həqiqətdir. Məsələn, Musa əleyhissəlamın Firon ilə olan əhvalatı gerçək bir hadisədir. Uca Allah belə buyurur:*

***"Biz inanan bir tayfa üçün sənə Musanın və Fironun hekayətindən*** *[bir qismini]* ***olduğu kimi söyləyəcəyik" (Qəsəs, 28/3)***

*Mağarada gizlənmiş gənclərlə bağlı hekayət də bu qəbildəndir. O da bir həqiqətdir. Uca Allah belə buyurur:*

*"[Ya Rəsulum!]* ***Biz onların xəbərini sənə doğru söyləyirik" (Kəhf, 18/13)***

*Qısası, Uca Allahın Qurani Kərimdə anlatdığı bütün hekayətlər əsil həqiqətdir. Uca Allah belə buyurur:*

***"Əlbəttə, doğru olan xəbər budur" (Ali-İmran, 3/62)***

*15. Qurani Kərim dünyada və axirətdə tələb olunacaq şeyləri bir yerdə yada salır. Uca Allah belə buyurur:*

***"Allahın sənə verdiyindən özünə axirət qazan. Dünyadakı nəsibini də unutma[Σ50]. Allah sənə yaxşılıq etdiyi kimi, sən də[Σ51] yaxşılıq et" (Qəsəs, 28/77)***

*16. Qurani Kərimdə insanlara zəruri olacaq əqidə, ibadət, əhkam, mübadilə, əxlaq, siyasət, iqtisadiyyat və cəmiyyət həyatı üçün vacib olan digər istənilən məsələlər vardır. Uca Allah belə buyurur:*

***"…Biz Kitabda heç bir şeyi nəzərdən qaçırmadıq*** *[əksiltmədik]* ***…" (Ənam, 6/38)***

*Uca Allah bir başqa yerdə belə buyurur:*

***"…Biz Quranı sənə hər şeyi[Σ52] izah etmək üçün, müsəlmanalara da bir hidayət, mərhəmət və müjdə olaraq nazil etdik!" (Nəhl, 16/89)***

*a. Qurtubi Uca Allahın:* ***"…Biz Kitabda heç bir şeyi nəzərdən qaçırmadıq*** *[əksiltmədik]* ***…" (Ənam, 6/38)*** *buyruğunu izah edərkən aşağıdakıları söyləyir: Bu, (Allah*

---

Σ50 *Malını Allah yolunda sərf et. O maldan qismətinin ancaq bir kəfən olduğunu bil. Pulunu mənasız yerə sağa-sola səpləmə: səhhətinin, sərvətinin, gəncliyinin qədrini bil. Sabah səni Allahın əzabından qurtara biləcək yaxşı əməllər et* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 452)

Σ51 *Varından yoxsullara, qohum-əqrabaya xərcləməklə* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh.452)

Σ52 *Dini hökmləri, halal-haramı, günahı və savabı* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 334)

*dərgahında) Hifzedilən Lövhədə bir şeyi nəzərdən qaçırmadıq deməkdir. Şanı Uca Allah orada baş verə biləcək bütün hadisələri təsbit etmişdir. Daha bir açıqlamaya görə, bu ifadə, "Quranda heç nəyi nəzərdən qaçırmadıq" mənasındadır. Yəni, Qurani Kərimdə dinlə bağlı dəlil gətirmədiyimiz bir şey qalmamışdır. Gətirdiyimiz bu sübutlar ya geniş şəkildə açıqlanmış və ya cəm halında ifadə edilmiş, ona dair şərh ya Peyğəmbərdən (sallallahu əleyhi və səlləm), yaxud da alimlərin yekdil rəyi ilə və ya da Kitabdan iqtibas etməklə sabitləşmiş müqayisə yolu ilə öyrəniləcəkdir (VI, 420) Daha sonra (Qurtubi) bunları deyir: Beləliklə, Uca Allahın Kitabda, ya onun təfsilatı, ya da ona dair əsas hökmlərin mövcudluğu baxımından olsun, "heç bir şeyi nəzərdən qaçırmadıq" kəlamına dair xəbəri əsil həqiqətdir.*

*b. Təbəri də Uca Allahın:* ***"…Biz Quranı sənə hər şeyi izah etmək üçün, … nazil etdik!" (Nəhl, 16/89)*** *ayəsini şərh edərkən bunları söyləyir:*

*Ey Məhəmməd! Bu Quran sənə, insanlara zəruri olan hər şeyi izah etmək üçün, nazil edilmişdir. Onu, halal və harama dair bilik, mükafat və cəza, yolundan çıxanlara* ***"...bir hidayət"*** *kimi, onu təsdiq edən, Allahın ondakı hüdudları, əmrləri və qadağalarına lazımınca əməl edərək, halalını halal, haramını haram qəbul edən insanlar üçün* ***"...bir mərhəmət"*** *kimi göndərdik.*

***"...müsəlmanalara da bir ... müjdə olaraq..."*** *buyruğunda Uca Allah bildirir ki: Ona itaət edən və tövhidlə baş əyən, əmrlərinə sadiq qalan insanları axirətdə bol-bol mükafatlar verəcəyi və hədsiz mehribanlıq göstərəcəyi ilə müjdələyəcək. (VIII, 161)*

*17. Qurani Kərim insanlara və cinlərə güclü təsir qüvvəsinə malikdir.*

*a. İslamın ilk dövrlərində müşriklərdən olan bir çox adamlar Qurani Kərimlə təsiri altında İslam daxil olmuşlar.*

*Bugünkü günümüzdə də, məsələn, mən şəxsən İslamı qəbul etmiş bir xristian gənclə rastlaşmışam. O mənə kasetdən dinlədiyi Qurani Kərimin təsiri altında bu qərarı qəbul etdiyini söylədi.*

*b. Cinlərə gəlincə, onlardan bir qismi belə deyib:*

*"[Ya Peyğəmbər!]* ***De: "Mənə vəhy olundu ki, bir dəstə cin[Σ53] dedilər: "Biz çox qəribə, təsəvvür edilməz dərəcədə gözəl olan bir Quran eşitdik. O, haqq yolu göstərir. Biz ona iman gətirdik və biz bir daha heç kəsi Rəbbimizə şərik qoşmayacağıq" (Cinn, 72/1-2)***

*c. Müşriklərə gəlincə, onların lap çoxu Quranı dinlədikdə onun təsiri altına düşmüşlər. Hətta, Valid b. Muğirə belə demişdir: "Allaha and olsun! O nə şerdir, nə sehirdir, nə də dəlilərin hədyanı! Şübhəsiz ki, onun sözləri Allahın kəlamlarındandır. Onun özünəməxsus bir şirinliyi, bir parlaqlığı vardır. O tamamilə yüksəkliklərdədir. Ondan yuxarı qalxmaq olmaz" (Bax: İbn Kəsir, IV, 443)*

*18. Qurani Kərimi öyrənən və insanlara öyrədən Peyğəmbərin (sallallahu əleyhi və səlləm) bu buyruğu bilavasitə onların ən xeyirlisidir:*

*"Sizin ən xeyirliniz Quranı öyrənən və öyrədəndir" (Buxari)*

*19. "Quranı məharətlə oxuyan şəxs ən yüksək dərəcəli və xeyirli mələklərlə birlikdədir" (Buxari və Muslim)*

*20. Uca Allah Qurani Kərimi hidayət verən və müjdələyən bir kitab kimi nazil etmişdir:*

---

[Σ53] *Məkkə və Taif arasında sübh namazı vaxtı Quranı dinləyib öz həmcinslərinin yanına qayıtdıqları zaman* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 630)

***"Həqiqətən, bu Quran ən doğru yola yönəldir, yaxşı işlər görən möminlərə böyük bir mükafata nail olacaqları ilə müjdə verir" (İsra, 17/9)***

*21. Qurani Kərim ürəklərə rahatlıq və sakitlik verir, yəqinliyi möhkəmlədir. Möminlər onun yəqinliyinin verdiyi rahatlıqla ürəklərə sakitləşdirən ən böyük möcüzə olduğunu çox yaxşı bilirlər. Uca Allah buyurur ki:*

***"O kəslər ki, Allahı zikr etməklə ürəkləri rahat olduğu halda iman gətirmişlər. Bilin ki, qəlblər yalnız Allahı zikr etməklə aram tapar" (Rəd, 13/28)***

*Müsəlman hər hansı bir kədərə, qəmə ya da bir xəstəliyə düçar olarsa, Munşəvi və digərləri kimi avazı gözəl olan mahir bir qiraətçinin Qurani Kərimi oxumasına qulaq asmalıdır. Çünki Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur: "Quranı səsinizlə gözəlləşdirin. Gözəl avazla oxuyan insan Quranın gözəlliyini artırır" (Səhih bir hədisdir. Bax: əl-Əlbani, Səhihul-Cami)*

*22. Qurani Kərim surələrinin əksər hissələri tövhidə çağırır. Xüsusilə, ibadət, dua və kömək diləməkdə Uca Allah Üluhiyyə tövhidinə dəvət edir. Fatihə surəsinin başlanğıcında:* ***"Yalnız Sənə ibadət edir, yalnız Səndən yardım diləyirik"*** *deyə buyurulduğunu görürük. Yəni Səndən başqasına ibadət etmir, Səndən başqasından kömək istəmirik.*

*Qurani Kərimin sonundakı surələr olan İxlas, Fələq, və Nəs surələrində tövhidin əsas mövzu olduğunu aydın şəkildə görürük:*

*"[Ya Peyğmbər!]*[Σ54] ***De: "O Allah birdir"; "De: "Pənah aparıram sübhün Rəbbinə!"; "De: "Pənah aparıram insanların Rəbbinə!"***

*Cinn surəsində də Uca Allah: "[Ya Peyğəmbər]* ***De: "Mən ancaq öz Rəbbimə ibadət edirəm və heç kəsi Ona şərik qoşmuram!" (Cinn, 72/20)*** *və* ***"Şübhəsiz ki,*** *[bütün]* ***məscidlər Allaha məxsusdur. Allahdan başqa heç kəsə ibadət etməyin!" (Cinn, 72/18)*** *– deyə buyurur.*

*Qurani Kərimin digər surələrində də tövhidə dair bir çox kərim ayələr vardır.*

*Təəccüb ediləsi budur ki, şeyxlərdən biri bu kərim ayəni məscidin qapısına yazılmış halda gördükdə belə demişdir: Bu, vahhabilərin ayəsidir. Çünki Allahdan başqasına dua etməyi qadağan edir.*

*Bir sufi doktor da mənə belə demişdi: "Yalnız sənə ibadət edir, yalnız səndən yardım dilərik" ayəsi vəhhabi ayəsidir. Çünki bu kərim ayə yalnız Allahdan kömək istəməyə çağırır.*

*23. Qurani Kərim İslam şəriətinin birinci qaynağıdır. Allah onu ağamız Məhəmmədə (sallallahu əleyhi və səlləm) insanları küfr, şirk və biliksizliyin qaranlıqlarından iman, tövhid və elmin nuruna çıxartsın deyə nazil etmişdir. Uca Allah belə buyurur:*

***"Əlif, Ləm, Ra!*** *[Ya Rəsulum! Bu Quran]* ***elə bir Kitabdır ki, onu sənə insanları öz Rəbbinin izni ilə zülmətlərdən nura, həm də yenilməz qüvvət sahibi və hər cür tərifə, şükrə layiq olan Allahın yoluna çıxartmaq üçün nazil etmişik" (İbrahim, 14/1)***

---

[Σ54] *Allahın zatı və sifətləri haqqında səndən soruşan müşriklərə* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 675)

*24. Qurani Kərim bilinməsi ancaq vəhylə mümkün olacaq və gələcəkdə baş verəcək bir sıra hadisələri də xəbər verir. Uca Allah buyurur:*

***"Bu dəstə[Σ55] mütləq məğlub olacaq və arxa çevirib qaçacağdır!" (Qəmər, 54/45)***

*Doğrudan da müşriklər Bədr günü məğlubiyyətə uğradılar və döyüşdən qaçdılar.*

*Qurani Kərim bundan daha əvvəl gerçəkləşən bir çox məsələlər haqqında xəbər vermişdir. Məsələn, Bizansların farslara qalib gələcəyini.*

*25. Uca Allahın bu buyruğuna görə, Qurani Kərimi oxumağa başladıqda istiazə[Σ56] edilməlidir:*

*"[Ya Rəsulum!]* ***Quran oxumaq istədiyin zaman məlun Şeytandan Allaha sığın!"[Σ57] (Nəhl, 16/98)***

*26. İmamla namaz qılan şəxslər üçün və cümə xütbələrində Quranı dinləmək və susmaq fərzdir. Çünki Uca Allah belə buyurur:*

***"Quran oxunan zaman onu dinləyin və susun ki, sizə rəhm olunsun!" (Əraf, 7/204)***

*Sizə Quran oxunduğu zaman, onu dinməzcə dinləyin ki, ayələrini başa düşə biləsiniz. Eşitdikdə susun ki, onu dərk edəsiniz və beləliklə də Rəbbiniz sizə rəhm etsin (Bax: Təbəri təfsiri)*

---

Σ55 *Bədr vuruşunda* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 586)

Σ56 ***İstiazə*** – qovulmuş şeytandan Allaha sığınma ("əuzu billəhi minəş-şeytanir racim" ifadəsi)

Σ57 *"Əuzu billəhi minəş-şeytanir-racim"* sözlərini de! (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 335)

## *Xülasə*

*Qurani Kərimin xüsusiyyətləri çoxdur. Şanı Uca Allah onu aşağıdakı ayələri ilə səciyyələndirmişdir:*

***"…O, şübhəsiz ki, çox dəyərli bir kitabdır. Nə öncə, nə də sonra batil ona yol tapa bilməz[Σ58] (Fussilət, 41/41-42)***

*Uca Peyğəmbər də (sallallahu əleyhi və səlləm) Quran haqqında belə buyurur: "Sizə iki şey verdim. Onlara sadiq qalacağınız müddətdə əsla yoldan azmayacaqsınız: Allahın Kitabı və mənim Sünnəm. İkisi də Cənnət həyatında mənimlə birgə olacaqları vaxta qədər bir-birlərindən ayrılmayacaqlar" (Hədis səhihdir. Hakim rəvayət etmişdir)*

*İngiltərənin sabiq baş naziri Qladstoun isə belə demişdir: Bu Quran mövcud olduqca Avropa müsəlman Şərqə hökmranlıq edə bilməyəcəkdir.*

## *Quran hər şeyi əhatə edən bir kitabdır*

*Qurani Kərim hökmlər, qadağalar, vəd, qorxu, hikmətlər, məsəllər, nəsihət, hekayətlər, qeyb məsələləri, yaradılışla bağlı biliklər, yaradılış, ölümdən sonra dirilmə və həşrin dəlilləri, habelə, digər əhəmiyyətli və çoxsaylı müxtəlif məsələləri özündə əks etdirir.*

*Quranın bütün bu mövzu və məsələləri üzərində düşünərkən, onların son dərəcədə yüksək bəlağətli, böyük məharətlə tərtib edildiyini, olduqca cazibədar, ahəngdar və bir-biri ilə mütənasib tərzdə uzlaşdırıldığını, əvvəlinin sonuna uyğun olduğunu, gözəlliyi etibarilə bir-birini tamamladığını, oxuyanı usandırmadığını, təcvidlə qiraət edənin ürəyini sıxmayadığını, üzərində diqqətlə düşünəni şübhəyə salmayadığını, təqva sahiblərinin hidayətini, möminlərin*

---

[Σ58] *Şeytan onun bir sözünü, bir hərfini belə dəyişə bilməz* (Qurani-Kərim, Bakı, VI nəşr, 2004, səh. 534)

*imanını artıran olduqlarını görürük. Bunun səbəbi isə, onların son dərəcə rabitəli, bir-biri ilə üzvi surətdə bağlı olmasından, əvvəlinin sonunu təsdiq edən səciyyə daşımasından irəli gəlir.*

*Şübhəsiz ki, Qurani Kərimin bildiyimiz şəkildəki bu quruluşu yazılmış kitabların strukturundan tamamilə fərqli olması ilə bərabər, həm də məna, forma və süjet baxımından ayə və surələr arasında aşkar bir qarşılıqlı bağlılıq münasibəti mövcuddur. Sanki o, bir-birini tamamlayan yeganə bir söz düzümüdür. Onun bu fövqəltəbii ecazkarlığı insan tərəfindən yaradılmış bəşər kitabı olmadığına açıq-aydın bir sübutdur. Bəşərə məxsus bir kitabı yazan şəxs əks etdirdiyi məsələlərə dair biliklər arasında məlum əlaqəsi olan hər bir biliklər sistemini müəyyən bir bölmədə toplayardı. Bu bölmələr ardıcıllıqla tərtib edilməklə kitabın bir hissəsi yazılıb meydana çıxarılardı. Quran belə qurulmamışdır. O, hikmətin zəruriləşdirdiyi və Allah tərəfindən vəhy edilmiş doğru yol göstərən bir dəmətdir*[Σ59]*. Onda hər hansı bir uyğunsuzluq və ziddiyyət yoxdur. Əksinə, sanki yeganə bir mövzu kimi, ayələr bir-birilə sarmaşıq kimi bağlaşmışlar (Bax: Şeyx Yasir Əhməd Əli əş-Şimali, Risalətu Muhimul-ixtilaf vət-tənaqud fil-Quranil-Kərim)*

*Şeyx Zərqani də belə deyir: "Hər bir surədə və yaxud hər bir bölmədə şahidi olduğumuz bu son dərəcə lətafətli daxili bağlaşıqlığın Quranı oxuyanın ləzzət duymasında, onu dinləyənin ehtizaza gəlməsində, ondan yararlananın müxtəlif formalarda faydalar görməsində hədsiz təsiri vardır. Qurani Kərimin hər bir hissəsi çox gözəl bir bağa nə qədər də bənzəyir! İnsan bu bağda qol-budaqlı ağaclar arasında gəzişərkən hər növ meyvələrdən istifadə edir. Qurani Kərimi müxtəlif çeşidli yeməklərlə dolu süfrəyə də bənzədə bilərik.*

---

[Σ59] Burada: "*Hikmətlər çələngi*" mənasında.

*Ac olan insanlar ehtiyacı olduğu istənilən hər hansı yeməkdən doyunca yeyə bilər" (Bax: Mənahilul-İrfan, I, 80)*

*Doktor Məhəmməd Abdullah Dərraz deyir ki, bir-biri ilə gözəl şəkildə uzlaşdırılmış uzun bir surə oxunulan zaman, biliksiz bir insan onun mənasız anlayışlarla, gəlişigözəl sözlərlə zahirən təmtəraqlı bir tərzdə dağınıq ifadələrin bir yerə təsadüfən toplandığını zənn edər. Lakin insan düşüncə sahibi olarsa, bu surənin hissələrinin bir-biriylə üzvi surətdə bağlı bir əsər olduğunu anlar. Bu əsər aydın əsaslar və prinsiplər üzərində ucaldılmış ali məqsəddən vücuda gətirilmişdir. Onun hər bir təməl daşı üzərində bir-çox bölmələr və hissələr inşa edilmişdir. Biz onun hissələri arasında gəzib dolaşarkən sanki eyni bir binanın mənzilləri və otaqları arasında keçid qapılarını aşkar etmiş oluruq. Bu binanın layihəsi bir anda yaradılmışdır. Böyük məharətlə tikilmiş bölmələrdən və onların arasındakı misilsiz uyğunluqlardan gözə çarpan mənzərə heç vaxt unudula bilməz. Bir hissədən digərinə keçərkən hər hansı bir fərq hiss edilmir. Əksinə, müxtəlif növlər arasında tam bir rabitə müşahidə edilir – eyni mənşəydən olan vahidlər arasında sonsuz bağlılıq və oxşarlıq kimi.*

*Bütün bunlardan başqa surənin ümumi mahiyyətinin məlum bir istiqamətə yönəldiyi və bütövlükdə konkret bir məqsəd daşıdığı üzə çıxır. Onun dəqiq bir əsər olması və üzvlərinin müxtəlif vəzifə daşımalarına baxmayaraq əsas niyyətin vahid bir məqsədi yerinə yetirməyə yönəldilməsi üzrə bir-biriylə həmrəy olması kimi (Bax: ən-Nəbəul-Azim, s. 155)*

## *Quranda uyğunsuzluq yoxdur*

*Uca Allah belə buyurur:*

***"Onlar Quran barəsində düşünməzlərmi? Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət tapardılar" (Nisa, 4/82)***

*Təbəri bu ayənin təfsirində belə demişdir: Şanı Uca Allahın:* ***"Onlar Quran barəsində düşünməzlərmi?"*** *kəlamını buyurmaqda məqsədi budur: Ey Məhəmməd! Sənin söylədiklərindən başqa şeyləri gecəylə planlaşdıranlar Allahın Kitabı üzərində yaxşıca düşünərək sənə itaət etmək və əmrlərinə tabe olmaq barədə Allahın onların qarşısına qoyduğu bu dəlili qəbul etməyəcəklərmi? Sənin, Rəbləri tərəfindən onlara gətirmiş olduğun, sənə nazil edilmiş bu Kitabın mənalarının uyğunluğu, hökmlərinin bir-biri ilə həmahəngliyi, bir hissəsinin digər bir hissəsini təsdiq etməsi, bir qisminin başqa bir qismini izah etməsini görmürlərmi? Heç şübhəsiz ki, əgər o, Allahdan başqası tərəfindən gətirilmiş olsaydı, hökmləri arasında fərqlər yaranar, mənaları bir-birilə ziddiyyət təşkil edər, bir bölməsi başqa bir bölməsinin naqisliyini, uyğunsuzluğunu aşkar edərdi.*

*İbn Cərir Qatadədən, sənədini göstərərək, bunları söylədiyini rəvayət edir: "Allahın sözləri arasında uyğunsuzluq olmaz. O haqdır, Onda batillik yoxdur. Əslində, insanların sözləri arasında məntiqsizlik, qeyri-ardıcıllıq olur".*

*İbn Zeydən də, sənədini göstərərək, bunları söylədiyini rəvayət edir: "Quranın bir bölməsi digər bölməsini təkzib etmir. Əgər insanlar hər hansı bir xüsusiyyətini müəyyənləşdirə bilmədikdə, şübhəsiz ki, bu onların ağıllarının çatışmazlığı və biliksizliklərindən qaynaqlandığındandır dedikdən sonra, Uca Allah:* ***"…Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət tapardılar" (Nisa, 4/82)*** *buyruğunu bəyan etdi.*

*(İbn Zeyd sözünə davam edərək) dedi ki, o halda mömininin vəzifəsi: "hər şey Allahdandır" deyərək oxşar*[Σ60] *olanına iman gətirməlidir. Onun bir bölməsi digər bölməsinə qarşı qoyulmamalıdır. Hər hansı bir xüsusiyyəti müəyyən edə bilmədikdə və ya başa düşülmədikdə, Allahın dediyi haqdır deməli, Onun dediyi sözün səhv ola bilməyəcəyini yada salmalı və Allahdan nazil olanın gerçəkliyinə iman gətirməlidir" (Təbəri təfsiri, VIII, 567)*

*2. Hafiz İbn Kəsir də ayənin təfsirində aşağıdakıları demişdir:*

*"Uca Allah onlara Qurani Kərim üzərində yaxşıca düşünmələrini əmr edərək, ondan üz çevirməmələrini, mükəmməl anlayışlarını, düzgün və yerində deyilmiş sözlərini qəbul etməkdən çəkinməyi qadağan edərək, Qurani Kərimin kəlmələri arasında hər hansı bir uyğunsuzluğun, ziddiyyətin və qarşıdurmanın olmayacağını xəbər verir. Çünki, o hikmət, sonsuz və hər cür həmdüsənaya layiq olanın tərəfindən nazil edilmişdir. O, bilavasitə Haqdan gələn bir haqdır. Buna görə Uca Allah:* ***"Onlar Quran barəsində düşünməzlərmi? Yoxsa ürəklərinə kilid vurulmuşdur?" (Məhəmməd, 47/24)*** *– deyə buyurur.*

*Daha sonra Uca Allah:* ***"…Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı…"*** *– deyə buyurur. Yəni, biliksiz bir müşrik və ya münafiqlərin büsbütün uydurduqları kimi bir kitab olsaydı, onda bir çox uyğunsuzluqlar, ziddiyyətlər, rabitəsiz ifadələr tapılardı. Beləlklə, Kitabın hər cür uyğunsuzluqlardan uzaq olması onun Allah tərəfindən nazil edilməsini sübut edir. Eynilə, Uca Allah elmdə qüvvətli olan insanlar haqqında:* ***"…Biz onlara iman gətirdik, onların hamısı***

---

[Σ60] ***Mütəşabih*** – dəqiq mənasını bilmək mümkün olmayan Quran ayələrinə deyilir. Qeyd etməliyəm ki, tərcümə etdiyim kitabın türk mətnində "mütəşabih" ifadəsi altında "mütəşabih ayə(lər) nəzərdə tutulduğu üçün mətnimizdə bunu, bir sıra hallarda "mütəşabih ayə(lər)" kimi verirəm (Σ)

***Rəbbimizin dərgahındandır" (Ali-İmran, 3/7)*** *dediklərəni bildirir. Yəni, möhkəmi*[1] *və mütəşabihilə*[2] *haqq olduğuna inanmışıq*[Σ61]*. Buna görə, mütəşabih buyruqları möhkəmin işığında anlayaraq doğru yol tapmışlar. Ürəylərində şək-şübhə olanlar isə möhkəm olanı mütəşabihin işığında anlamağa cəhd etdiklərindən düz yoldan azmışlar. Bu səbəbə görə Uca Allah elmdə qüvvətli olanları tərifləyərkən ürəylərində əyrilik olanları məhkum edir (Bax: İbn Kəsir, 1, 529)*

*2. Şatibi də*[Σ62] *bunları deyir: Qurani Kərim özündə uyğunsuzluq ehtiva etməməsinin sabitliyi münaqişəyə girən-*

---

[1] ***Möhkəm*** – kərim ayənin mənasının açıq və zahir olması deməkdir. Uca Allahın bu buyruğu kimi: ***"Allah alış-verişi halal etmişdir" (Bəqərə, 2/27)***.

[2] ***Mütəşabih*** iki növdür. 1. Gerçək mütəşabih. Bu, insanın bilməsi mümkün olmayan məsələdir (Allahın sifətlərinin həqiqəti və keyfiyyətini bilmək kimi) Fəqət, bunların mənaları məlumdur. Uca Allahın: ***"Rəhman ərşə istiva etdi"*** buyruğu kimi. İstivanın, imam Malikin də söylədiyi kimi, nə demək olduğu məlum bir şeydir. Buxari də tabeinlərin bunu "ucalmaq" və "üstünə yüksəlmək" kimi təfsir etdiklərini bildirir. İstivanın mahiyyəti isə ağılla dərk edilmir. 2. İkinci növ isə nisbidir. Bu da bir sıra insanlar üçün oxşar olmaqla bərabər, bəziləri üçün belə olmadığı deməkdir. Uca Allahın: ***"Ona bənzər heç bir şey yoxdur" (Şura, 42/11)*** buyruğu kimi. İnkar edənlər (Allahın sifətlərini qəbul etməyənlər) bu kərim ayədən Allahın sifətlərinin olmadığı mənasını çıxartmış və Allahın sifətlərinin olmasını qəbul etmənin Onun başqa varlıqlara bənzədilməsi anlamına gələcəyini iddia etmişlər. Uca Allahın sifətlərini təsbit edən ayələrdən üz döndərmişlər. Ancaq bunu bilməliyik ki, bu sifətlərin məna etibarilə Allah haqqında qərarlaşdırılmış olduğunu etiraf etmək heç də Allahın sifətləri ilə yaradılmışlara bənzəməsini zəruri etmir.

[Σ61] ***Möhkəm*** və ***mütəşabih*** istilahlarına verilən sətiraltı izahlar (1,2) bu əsərin müəllifinə məxsusdur. Kitabı Azərbaycan dilinə tərcümə edən bu qeydləri yalnız çevirmişdir (Σ)

[Σ62] Qeyd: Kitabın türk dilindəki bu bölməsinin ("Kuranda tutarsızlık yoktur") əsas sətirbaşıları (abzasları) bəndlərlə (1, 2… və s.) verildiyi halda mətndə 1-ci bənd (1) göstərilməmiş, 2-cidən sonra yenə də 2 verilmişdir. Bu uyğunsuzluqlar onu göstərir ki, öncəki tərcüməçi ya həmin mətnləri ixtisar edib, ya da mexaniki olaraq rəqəmlər səhv qoyulub (məs.: "2. Hafiz İbn

*lərin hamısına bəllidir. Çünki əslində o həqiqətdə də belədir. Haqq isə öz yaratdığının içində həqiqətə uyğun gəlməyən bir şey qoymaz. Bilavasitə məsuliyyət daşıyan şəxslər arasında meydana çıxan hər bir ixtilaf barədə Quran hökm verməyə qabildir. Uca Allah belə buyurur:*

***"…Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin! Bu, daha xeyirli və nəticə etibarilə daha yaxşıdır" (Nisa, 4/59)*** *Bax, bu buyruq bu Kitabda həqiqətin olduqca açıq-aydın olduğunun, ondakı şərhlərin hər cür narahatlığa müsbət təsir göstərəcəyinə, ondan kənarda onun yerini verə biləcək heç bir şeyin olmadığına aydın dəlildir. Kərim əshabələr də əsasən buna müvafiq olaraq davranmışlar" (əl-İtisam, II, 309)*[R3]

## *Quranın adları və keyfiyyətləri*

*1. Uca Allah Qurani Kərimə bir çox adlar vermişdir. Bunlardan bəziləri:*

*Quran, Furqan, Kitab, Tənzil… Bu adların Qurani Kərimdə dəlilləri var.*

*2. Uca Allah Qurani Kərimi müxtəlif ayələrdə bir sıra sifətlərlə təsvir etmişdir. Bu vəsflərin bəziləri bunlardır: nur, hidayət*[Σ63]*, nəsihət, şəfa, rəhmət*[Σ64]*, mübarək*[Σ65]*, aşkar,*

---

Kəsir…"; "2. Şatibi də şunları…" kimi) Mən də sətirbaşı saylarını eynilə saxladım (Σ)

[R3] Tərcüməçi F.S. Sələfinin (Σ62) sətiraltı qeyddə bildirdiyi iradlara aydınlıq gətirmək məqsədilə əsərin üçüncü buraxılışlı ərəb nəşrinə baxdıq. Nəticədə rəqəmlərin mexaniki olaraq səhv qoyulduğu aşkar edildi. Ərəb orijinalında "Təbəri bu ayənin təfsirində..." birinci bənd, "Hafiz İbn Kəsir də ayənin təfsirində..." ikinci bənd, "Şatibi də bunları deyir..." üçüncü bənddir.

[Σ63] Doğru yol

*müjdə, əziz, məcid*[Σ66]*, bəşir*[Σ67]*, nəzir*[Σ68]*, kərim*[Σ69] *və sözün ən gözəli.*

*Uca Allah əziz kitabını dəyərləndirərkən aşağıdakıları söyləmişdir:*

***"Allah sözün ən gözəlini bir-birinə bənzər, təkrarlanan bir kitab şəklində nazil etdi. Ondan*** *[Quranın təhdidlərindən]* ***Rəbbindən qorxanların tükləri biz-biz olar. Allahın zikrindən sonra ürəkləri yerinə gəlib qorxuları gedər. Bu Allahın hidayətidir. Onunla istədiyini doğru yola yönəldər…" (Zumər, 39/23)***

***"...sözün ən gözəli.."*** *– ən bəlağətli, ən doğru və ən mükəmməl olanı Qurandır.*

***"...bir-birinə bənzər"*** *– möcüzəliyi, doğru yola yönəltməsi və səciyyəvi xüsusiyyətlərinə görə gözəllikdə bir hissəsi digər hissəsinə bənzəyir.*

***"...təkrarlanan"*** *– onda hökmlər, nəsihətlər, hekayətlər və ədəb-ərkana dair hökmlər təkrar edilmişdir.*

***"...tükləri biz-biz olar".*** *Təhdidindən bədənlərin dərisi səyriyir və ehtizaza gəlir.*

***"...ürəkləri yerinə gəlib qorxuları gedər"*** *– rahatlıq və sakitlik gətirir, sakitlik yaradır, sıxıntı vermir (Bax: Həsəneyn Məhəmməd Maxluf, Kəlimətul-Quran)*

*3. Qurani Kərimin keyfiyyətlərinə dair müəyyən qədər zəifliklə birliktə mənaları baxımından mötəbər olan bir sıra hədislər də mövcuddur.*

---

[Σ64] Mərhəmət
[Σ65] Bərəkətli, xeyirli, uğurlu, xoşbəxt, bolluq mənbəyi olan.
[Σ66] Ulu
[Σ67] Müjdəçi, muştuluqçu, xoş xəbər verən
[Σ68] Təhlükədən çəkindirən
[Σ69] Kərəm sahibi, şərəfli, hörmətli, mərd, comərd, mülayim xoş davranan

*Peyğəmbərin (sallallahu əleyhi və səlləm) belə buyurduğu rəvayət edilmişdir:*

*a. "Şübhəsiz ki, bu Quran Allahın bir ziyafətidir*[Σ70]*. Onun ziyafətini gücünüz çatdığı qədər öyrənin. Doğrudan da bu Quran Allahın ipidir. O, aydın nurdur, faydaverici şəfadır. Ona möhkəm-möhkəm sarılan qorunar, ona əsaslanan xilas olar. O, hər hansı bir şəkildə təhrif edilə bilməz ki, sonradan doğruldulmalı olsun. Yolundan sapmaz ki, düz yola gətirilsin. Onun heyratamiz xüsusiyyətləri bitib-tükənməz. Çox oxunduğuna görə əskilib köhnəlməz. Onu oxuyun, çünki Allah onu oxumağınızdan ötrü hər bir hərfinə görə sizə on xeyirli mükafat verər. Mən "əlif, ləm, mim" bir hərfdir demirəm, çünki əlif üçün on, ləm üçün on və mim üçün də on əcr verilir" (Hakim hədisin səhih olduğunu bildirdiyi halda, Zəhəbi zəif olduğunu söyləmişdir)*

*b. "Bunu bilin ki, lap yaxında bir sıra fitnəkarlıqlar baş verəcəkdir. Mən, "yaxşı, o fitnələrdən necə xilas olmaq mümkündür?" – deyə soruşdum. Peyğəmbər (sallallahu əleyhi və səlləm): Allahın Kitabı ilə. – deyə buyurdu. Allahın Kitabında sizdən əvvəlkilərin biliyi, sizdən sonrakıların xəbəri, aranızdakı (anlaşılmazlıqların) hökmü vardır. O, haqqı batildən ayırır, o, əyləncə deyildir. O elə bir kitabdır ki, bir kimsə yekəbaşlığından onu tərk edərsə, Allah onun belini qırar. Kim ki, doğru yolu ondan başqa yerdə axtararsa, Allah onu azdırar. O, Allahın möhkəm ipidir. O, hikməti sonsuz olan zikrdir. O, doğru yoldur. O, istəklərin azdıra bilmədiyi və dillərin qarışdıra bilmədiyi bir kitabdır. Alimlər ondan doymazlar. Çox oxunduğuna görə köhnəlməz. Heyrətamiz xüsusiyyətləri bitib tükənməz. O, eşitdikləri vaxt cinlərin:* ***"…Biz çox qəribə bir Quran eşitdik…" (Cinn, 72/1)*** *deməkdən*

---

[Σ70] ***Ziyafət*** – sözünün lüğəti mənası: bolluca yeyib-içmə məclisi (Bax: Ömer Sevincgül, "Özel lüğat", İstanbul, 2003, ZAFER yayınları, 1-ci nəşr, səh. 926)

*özlərini saxlaya bilmədikləri bir sözdür. O elə bir Kitabdır ki, onun əsasında danışan doğru danışar, ona əsaslanaraq hökm verən ədalətli olar və ona layiqincə əməl savab qazanar. O Kitabı oxumağa dəvət edən doğru yola yönəldilir" (Tirmizi rəvayət etmişdir. Camiul-Usul əsərini tədqiq edən: "Sənədində naməlum (hədis rəvayətçisi kimi tanınmamış) bir ravi vardır" dediyi halda, əl-Əlbəni hədisin Peyğəmbərdən (sallallahu əleyhi və səlləm) deyil, Əli b. Əbu Talib tərəfindən deyilmiş olduğunu bildirmişdir).*

## *Quranın bəzi fəzilətləri*

*1. Uca Allah belə buyurur:* ***"Verdiyimiz kitabı layiqincə*** *[təhrif etmədən]* ***oxuyanlar həmin kitaba iman gətirənlərdir…" (Bəqərə, 2/121)*** *Kitabı layiqincə oxumaq, halalını halal, haramını haram qəbul etmək, onu nazil edildiyi kimi oxumaq deməkdir.*

*2. Peyğəmbər (sallallahu əleyhi və səlləm) buyurub ki: "Quranı oxuyun, çünki o qiyamət günündə onu oxuyanlara şəfaətçi olaraq gələcəkdir" (Muslim)*

*3.Yenə Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur: "Hər kim Quranı oxuyub ona layiqincə əməl edərsə, qiyamət günü onun ata-anasının başına dünyadakı günəş işığından da gözəl bir tac qoyulacaqdır. Yaxşı, ona əməl edən haqqında nə düşünürsünüz?" (Əbu Davud və sənədini səhih adlandıran Hakim rəvayət etmişlər)*[R4]

*4. Yenə Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur: "Şübhəsiz ki, Allahın insanlar arasından olan öz adamları vardır". Onlar kimlərdir, ey Allahın Elçisi? – deyə ondan soruşdular. O (sallallahu əleyhi və səlləm):*

---

R4 Hədisi Əbu Davud (Sünən, hədis №1453), Hakim (Müstədrək, 1/756, h. 2085), Əhməd (Müsnəd, 3/440), Təbərani (Mucam əl-Kəbir, 20/198, h. 445), Beyhəqi (Şuəbul iman, 2/329, h. 1948), Əbu Yəla (Müsnəd, 3/65, h. 1493) və başqaları Muaz ibn Ənəsdən (A.o.r.) rəvayət etmişlər. Hicrətin 807-ci ilində vəfat etmiş Hafiz Əli ibn Əbubəkr əl-Heysəmi (Məcmu əz-zəvaid 7/336, h. 11643) demişdir: «Hədisin isnadında Zəbən b. Fəid iştirak edir. O, zəifdir». Həmçinin şeyx Əlbani də (Zəif cami, Zəif sünən Əbu Davud və Zəif ət-tərğibdə) bu hədisin zəif olduğunu bildirmişdir.

Lakin Hakimin "Müstədrək"ində (1/756, h. 2086) Bureydədən (A.o.r.) rəvayət edilən oxşar bir hədis vardır. Onun mətni aşağıdakı kimidir: *"Hər kim Quranı oxuyub öyrənərsə və ona layiqincə əməl edərsə, qiyamət günü onun ata-anasının başına günəş işığına bənzər bir tac qoyularaq dünyadan da qiymətli paltar geyindiriləcək. Valideynlər: «Biz hansı səbəbdən ğeyindirildik?» – deyə soruşduqda isə, onlara: «Övladınızın Qurana bağlılığına görə» - deyiləcək"*. Şeyx Əlbani (Səhih tərqib 2/169, h. 1434) bu rəvayətin isnadının həsən olduğunu söyləmişdir.

*"Onlar Quran əhlidir, onlar Allah əhli və onun seçdiyi şəxslərdir" – deyə buyurdu" (Hədisin sənədi səhihdir)* [R5]

*5. Yenə Peyğəmbər ağamız (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur: "Məharətlə Quran oxuyan şəxs xeyirli, şərəfli mələklərlə bərabərdir. Quranı oxuyaraq çətinlik çəkən və Quranı oxuması ona ağır gələn şəxsin də iki əcri var" (Buxari və Muslim)*

## *Qurani Kərimdə təvilin mənası və növləri*

*Uca Allah belə buyurur:*

***"****[Ya Rəsulum!]* ***Sənə Kitabı nazil edən Odur. Onun bir hissəsi***[Σ71] ***möhkəm, digər qismi isə mütəşabih***[Σ72] ***ayələrdir. Ürəklərində əyrilik*** *[şəkk-şübhə]* ***olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih ayələrə uyarlar*** *[tabe olarlar]****. Halbuki onların yozumunu Allahdan başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə: "Biz onlara iman gətirdik, onların hamısı Rəbbimizin dərgahındandır", - deyərlər. Bunları yalnız ağıllı adamlar başa düşə bilərlər" (Ali-İmran, 3/7)***

*A. Təvil – təfsir mənasındadır. Bu, sözün mənasının anlaşılmasına qədər onun digər sözlərlə açıqlanmasıdır. İbn Cərir ət-Təbəri və onlara oxşar təfsirçilərin terminalogiyasında əksəriyyətcə başa düşülən budur.*

---

R5 Şeyx Əlbani "Səhih sünən İbn Məcə" (1/90, hədis №214) əsərində bu rəvayətin isnadının səhih olduğunu bildirmişdir.

Σ71 *Quranın əslini, əsasını təşkil edən* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 154)

Σ72 *Çətin anlaşılan, dəqiq mənası bilinməyən, məğzi bəlli olmayan* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 154)

*B. Təvil*[Σ73] *– sözün son nəticədə əsaslandığı həqiqət mənasını bildirir. Buna görə Uca Allah Öz zatı və sifətlərinə aid verdiyi xəbərlər müqəddəs zatının həqiqətləri və zatının daşıdığı sifətlərin həqiqətləridir. Allahın axirət günü haqqında bildirdiklərinin təvili isə axirət günü baş verəcək hadisələrin özüdür.*

*1. Uca Allahın:* ***"Ürəklərində əyrilik** [şəkk-şübhə] **olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih ayələrə uyarlar** [tabe olarlar]**. Halbuki onların yozumunu Allahdan başqa heç kəs bilməz"*** *buyruğu üzərində vəqf edənlər (yəni, qiraəti dayandıranlar – red.) və "elmdə qüvvətli olanlar" buyruğunu da yeni bir ifadə kimi dəyərləndirənlər bu halda təvilin ikinci mənasını (B) nəzərdə tuturlar. Bu isə əslində sözün son nəticədə aydınlaşacağı həqiqətdir. Belə olduqda, Uca Allahın zatının həqiqəti, əsli, ad və sifətlərinin keyfiyyəti və vəd edilənlərin gerçəkliklərini Allahdan başqa heç kim bilə bilməz.*

*2. Uca Allahın:* ***"… Halbuki onların yozumunu Allahdan** [yaxud Allahdan və elmdə qüvvətli olanlardan] **başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə: "Biz onlara iman gətirdik… - deyərlər"*** *buyruğunun əvvəlində gələn cümlənin "və"sini bağlayıcı kimi qəbul edərək, ardıyca gələnin yeni cümlə (yeni abzas) olmadığını söyləyiblər. Buradan belə çıxır ki, mövzunu mükəmməl bilənlər bununla təvilin birinci mənasına aid olan təfsiri nəzərdə tuturmuşlar. Buna görə, Mücahid haqqında: "O mütəşabih ayələrin təvilini bilir", deyə söyləndiyi zaman, məqsəd onun həmin ayələrin təfsirini bilməsini göstərməkdir.*

---

[Σ73] **Təvilin** bir başqa mənası: sözə ayrı məna vermə, hədisin və ya ayənin bir çox mənalarından ancaq ehtimal olunan birini mümkün hesab etmə (Bax: Ömer Sevincgül, "Özel lüğat", İstanbul, 2003, ZAFER yayınları, 1-ci nəşr, səh. 858)

*Beləliklə, nəticə baxımından hər iki nəzər nöqtəsi arasında bir ziddiyyət olmadığı üzə çıxır. Mübahisə təvil anlayışı ilə bağlı nəzər nöqtələrinin fərqliliyi ilə əlaqədardır (əl-Qattan, Ulumul-Quran)*

*3. İbn Abbas (A.o.r.) demişdir ki, təfsir dörd cürdür:*

*1) Kimsənin üzrxahlığının qəbul edilməyəcəyi təfsirin (halal və haramı) başa düşülməsi haqqında.*

*2) Ərəblərin öz dillərində (məs. "ilah"ın məbud mənasını verdiyini bildiyi kimi) mənasını bildiyi təfsir.*

*3) Elmdə qüvvətli olanların təfsirin (məs. "istivanın" uluvv – yüksəklik) mənasını verdiyini bildiyi kimi.*

*4) Allahdan başqasının bilmədiyi (Uca Allahın zatının və sifətlərinin mahiyyəti kimi) təfsir .*

*(Bax: İbn Kəsir, Təfsirul Quran)*

## *Pislənilmiş təvil*

*C. Pislənilmiş təvil – sözün, bəyənilən bir anlamını kənara qoyaraq, ona bənzər digər, dəlili bəyənilməyən, ehtimallara görə şərh edilməsinə deyilir. Allahın sifətlərinə dair ayə və hədislərin təfsir edilməsi haqqında sonradan gələn elm adamlarının əksəriyyətinin nəzərdə tutduqları təvil budur. Onların belə bir təvilə sığınmalarının səbəbi, öz qənaətlərinə görə, Uca Allahı yaradılmışlara bənzərlikdən təmizləməklə həddi aşmalarıdır. Bu isə öz növbəsində batil bir iddia olmaqla onları çəkindikləri təhlükənin bir başqa formasına və ya daha ağır bir təhlükəyə salır. Əslində, onlar, misal üçün, "yəd – əl" sözünü "qüdrət" mənasında təvil etdikləri vaxt Allahın əlinin olmasını deməkdən qaçmaq istəmişdilər. Çünki yaradılmışların da əli vardır. Bu dəfə "əl" sözü onlara mütəşabih görününcə, onu "qüdrət" adlandıraraq təvil etmişlər. Bu da onların bir ziddiyyətidir.*

*Belə ki, onlar məqbul saydıqları məna haqqında da müvafiq bir iddia qəbul etmək məcburiyyətindədirlər. Yəni, özlərinin rədd etdikləri mənanı qəbul etməyə məcburdurlar. Axı, qulların da qüdrəti vardır (Belə olduqda, Allahla yaradılmışlar arasında oxşarlıq yaranır) Əgər onların*[Σ74] *təsbit etdikləri qüdrət haqq və mümkün olan bir şeydisə, dolayısı ilə Uca Allah üçün əli məqbul saymaq da eyni qaydada haqq və mümkündür. Əgər Uca Allah haqqında əli qəbul etmək – onların iddialarına görə, təşbihi zəruri etdiyi üçün – batil və mümkün olmayan bir şeydirsə, eynilə, qüdrəti qəbul etmək də batil və qeyri-mümkündür. Digər tərəfdən, belə bir sözün üstün tutula bilməsi ehtimalı nəzərdən qaçırılaraq, üstün tutulmayan bir ehtimala görə təfsir edilən mənası (anlamı) ilə izah (təvil) edilir demək bəyənilmir. Sələfin və başqalarının qabaqcıl alimlərindən təvil edənlərin qınanmasına dair rəvayət edilmiş hekayətlər, məhz özlərinə mütəşabih görünən sözləri (başqaları üçün mütəşabih olmamasına baxmayaraq) mümkünsüz bir şəkildə təvil edən belələri haqqındadır (Bax: əl-Qahtani, Ulumul-Quran)*

## *Elmdə qüvvətli olanlarla yolundan azanların mütəşabih buyruqlara qarşı münasibəti*

*Yolundan azanların mütəşabih hökmlərə qarşı münasibətini Uca Allahın belələri haqqındakı:* ***"…Ürəklərində əyrilik*** *[şəkk-şübhə]* ***olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih ayələrə uyarlar*** *[tabe olarlar]…"* *buyruğu ilə; elmdə qüvvətli olanların mövqeyini isə:* ***"…Elmdə qüvvətli olanlar isə: "Biz onlara iman gətirdik, onların hamısı Rəbbimizin dərgahındandır", - deyərlər"*** *buyruğu ilə açıqlanmışdır.*

---

[Σ74] Sonradan gələn təvilçi alimlərin.

*Buna görə ürəklərində şəkk-şübhə olanlar bu mütəşabih ayələri Uca Allahın Kitabına böhtan demək və insanları bu Kitabdan uzaqlaşdıraraq, Allahın nəzərdə tutmadığı tərzdə şərh etmək üçün bir vasitəyə çevirirlər. Beləliklə həm özləri yollarını azır və həm də başqalarını azdırırlar.*

*Elmdə qüvvətli olanlar isə Uca Allahın Kitabında əksini tapmış bütün buyruqların haqq olduğuna, onda hər hansı bir uyğunsuzluq və ziddiyyət olmadığına iman gətirirlər. Çünki o Kitab Allah tərəfindən nazil edilmişdir.*

***"… Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət tapardılar" (Nisa, 4/82)***

*Mütəşabih nazil olan buyruqların hamısının etibarlı olması üçün onlar möhkəm*[Σ75] *ayələrin işığında anılarlar*[Σ76]*.*

*1. Birinci nümunə barəsində belə deyirlər:*

*"Şübhəsiz ki, Uca Allahın, sözün əsil mənasında, Onun cəlalı və əzəmətinə yaraşan, lakin yaradılmışların əllərinə bənzəməyən əlləri vardır. Onun, eynilə yaratdıqlarının əslinə bənzəməyən bir Özlüyünün olduğu kimi. Çünki Uca Allah belə buyurub:*

***"…Ona bənzər heç bir şey yoxdur. O eşidəndir, görəndir!" (Şura, 42/11)***

---

[Σ75] ***Möhkəm*** – söz əslində "sağlam, pozulmaz, etibarlı" mənalarını bildirir. Ancaq bu keyfiyyətlərə malik başqa şeyləri ifadə etmək üçün də istifadə edilə bilər. Burada mükəmməl, qorunan, təhlükəsizliyi təmin edilmiş *ayə* mənasını verən bir keyfiyyətdir. Belə ayələrin mənası açıqdır, başqa cür yozulmasına imkan verilmir, hər hansı bir başqa ayə ilə də hökmü ləğv olunmamışdır (Bax: Ömer Sevincgül, "Özel lüğat", İstanbul, 2003, ZAFER yayınları, 1-ci nəşr, səh. 579-580)

[Σ76] Yəni, belə ayələr başqa ayələrlə təfsir edilər.

*Uca Allahın ərşinin üstündə olması da Onun cəlalına layiq bir tərzdədir. Xəlq etdiklərindən heç biri Ona bənzəməz. Uca Allah belə buyurur:*

***"Rəhman ərşə istiva etdi" (Taha, 20/5)***

*2. İkinci nümunə haqqında da belə deyirlər:*

*Yaxşılıq da, pislik də Uca Allahın təqdirilədir, lakin yaxşılığın səbəbi Uca Allahın qullarına lütfkarlıq etməsindədir. Pisliyin səbəbi isə qulun öz əməlindəndir. Beləliklə, Uca Allah belə buyurur:*

***"Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların ucbatındandır. Allah çoxunu əfv edər" (Şura, 42/30)*** *Burada pisliyin qulun özünə aid edilməsi hər hansı bir şeydən ötrü meydana gələn haldır, onu təqdir edənə aid deyil. Yaxşılığın və pisliyin Uca Allaha bağlanılması isə bir şeyin onu təqdir edənə bağlanılması ilə əlaqədardır. Beləcə, iki ayə arasında uyğunsuzluq olması təhlükəsi ortadan qalxır. Çünki (aidiyyəti olan ayələrdə) bağlılıq cəhətləri bir-birindən fərqlənirlər.*

*3.Üçüncü nümunə haqqında da belə deyirlər:*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) ona bildirilən buyruqlar barədə qətiyyən şübhəyə düşməmişdir. O, hətta o buyruqları ən yaxşı bilən və yəqin ki, (özlərinə nazil edilənə qəti inam bəsləyənlərdən) ən güclü olanıdır. Beləliklə, Uca Allah belə buyurur:*

***"De: "Ey insanlar!***[Σ77] ***Əgər mənim dinim barəsində şübhəyə düşmüsünüzsə,*** *[bilin ki,]* ***mən Allahı qoyub tapındığınız başqa bütlərə ibadət etmirəm…" (Yunus, 10/104)***

*Bu o deməkdir ki, əgər sizin bu kitab haqqında bir şübhəniz varsa, mən onun haqqında qəti bir qənaətə, bir*

---

[Σ77] *Məkkə müşrikləri* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 281)

*inama sahibəm. Bundan ötrü sizin Allahdan başqa tapındıqlarınıza ibadət etmərəm, əksinə o bütləri inkar edir və Allaha ibadət edirəm.*

*Uca Allahın:* ***"Əgər sənə nazil etdiyimizə şübhə edirsənsə…" (Yunus, 10/94)*** *buyruğu Peyğəmbərin (sallallahu əleyhi və səlləm) şübhə etməsinin mümkün olduğunu və yaxud əməlində şübhəyə düşməsini labüd etmir. Belə ki, Uca Allahın:* ***"De: "Əgər Rəhmanın bir övladı olsa, [****ona****] ibadət edənlərin birincisi mən olaram!" (Zuxruf, 43/81)*** *buyruğundakı bu ifadələr Uca Allahın övlad sahibi olmasının mümkün və ya da əməli surətdə vücuda gəlməsini zəruri edirmi?*

*Qətiyyən! Belə bir şey Uca Allah haqqında nə mümkündür, nə də belə bir şey olmuşdur. Uca Allah belə buyurur:*

***"Halbuki Rəhmana Özünə övlad götürmək yaraşmaz. Çünki göylərdə və yerdə olan bütün məxluqatdan bir eləsi yoxdur ki, [****qiyamət günü****] Rəhmanın hüzuruna bir qul kimi gəlməsin" (Məryəm, 19/92-93)***

*Uca Allahın:* ***"… Şübhə edənlərdən olma!" (Yunus, 10/94)*** *buyruğu Peyğəmbərin (sallallahu əleyhi və səlləm) həqiqətən şübhə etməsinin lüzumsuzluğunu göstərir. Bəzən bir şeyi qadağan etmək, o işi heç vaxt görməyənə də yönəldilir. Beləliklə, Uca Allahın:* ***"Allahın ayələri sənə nazil edildikdən sonra ehtiyatlı ol ki, [****kafirlər****] səni çəkindirə bilməsinlər. Rəbbinə dəvət et və əsla müşriklərdən olma!" ((Qəsəs, 28/87)*** *buyruğuna diqqət yetirək. Məlum olduğu kimi, onlar Peyğəmbəri (sallallahu əleyhi və səlləm) Allahın ayələrindən çəkindirə bilmədilər. Peyğəmbər (sallallahu əleyhi və səlləm) də heç bir halda şirkə yol verməmişdir. Belə bir işi görməyənə belə bir qadağa qoymaqdan məqsəd bu işi görənləri məzəmmət etmək və onları tutduqları yoldan uzaqlaşdırmaqdır. Bu vasitə ilə mütəşabihlik və Peyğəmbərə*

*(sallallahu əleyhi və səlləm) yaraşmayan qadağa ehtimalının əsası aradan götürülür (Bax: Məhəmməd b. Saleh əl-Useymin, Usulun fit-təfsir)*

## *Quranda mütəşabih növlər*

*Qurani Kərimdəki mütəşabihlik iki cürdür:*

*Birincisi, həqiqi mütəşabihlikdir ki, insanların onu dərk etməsi mümkün deyil. Uca Allahın sifətlərinin əsil mahiyyətini bilmək buraya daxildir. Biz bu sifətlər haqqında nə qədər və hansı anlayışlara malik olsaq da, onların həqiqətlərini və keyfiyyətlərini bilə bilmərik. Çünki Uca Allah belə buyurur:* ***"…Onların elmi isə Onu***[Σ78] ***əhatə edib qavraya bilməz" (Taha, 20/110)*** *Yenə də Uca Allah belə buyurur:*

***"Gözlər Onu dərk etməz. O, gözləri dərk edər. O, lətifdir, [****hər şeydən****] xəbərdardır" (Ənam, 6/103)***

*Məhz buna görə, imam Malikə (A. r. e.) Uca Allahın* ***"Rəhman ərşə istiva etdi" (Taha, 20/5)*** *buyruğu ilə bağlı olaraq: "Necə istiva etdi?" – deyə soruşulduqda, bu cavabı vermişdir: «İstiva naməlum bir şey deyil. Lakin onun keyfiyyətini ağlımızla qavraya bilmərik, ona iman gətirmək vacibdir, buna dair sual vermək isə bidətdir».*

*Bu cür mütəşabih ayələrin mahiyyətinə varmaq imkanı olmadığına görə, onların açıqlanmasına aid də sual verilmir.*

*İmam Malikin dediyindən belə nəticə hasil olur ki, istivanın keyfiyyətini, necəliyini bilmədiyimiz halda, onun lüğəti mənasının ucalıq, üstdə olma anlamına gəlməsi bəllidir.*

---

Σ78 *Allahın zatını* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 377)

*İkinci növ mütəşabihlik isə nisbi mütəşabihlikdir. Bu isə bəziləri üçün mütəşabih olmaqla bərabər, digər insanlara görə belə olmayan buyruqlardır. Buna görə, elmdə qüvvətli olanlar tərəfindən bunlar anlaşılırsa da, başqaları – anlamırlar. Bu cür mütəşabih ayələrin açıqlanmasına dair sual verilə bilər. Çünki onların haqqında bilik əldə etmək mümkündür. Qurani Kərimdə mənası heç kim tərəfindən başa düşülə bilməyən buyruq yoxdur. Belə ki, Uca Allah belə buyurur:*

***"Bu, insanlardan ötrü bir xəbər, müttəqilərdən ötrü isə hidayət və nəsihətdir" (Ali-İmran, 3/138);***

***"…Biz Quranı sənə hər şeyi izah etmək üçün… nazil etdik!" (Nəhl, 16/89);***

***"Biz onu oxuduğumuz zaman oxunmasını diqqətlə dinlə. Sonra onu** [sənə] **bəyan etmək də Bizə aiddir!" (Qiyamə, 75/18-19);***

***"Ey insanlar! Sizə Rəbbiniz tərəfindən dəlil gəlmişdir. Biz sizə aydın bir nur endirdik" (Nisa, 4/174)***

*Bu növ mütəşabih ayələrin nümunələri lap çoxdur. Uca Allahın:* ***"…Ona bənzər heç bir şey yoxdur…" (Şura, 42/11)*** *buyruğu bu qəbildəndir. Çünki tətil əhli (Allahın sifətlərini qəbul etməyənlər) bu buyruqlardan Uca Allahın sifətlərinin olmaması qənaətinə gəlmişlər və Onun sifətlərinin olmasını Allahın yaradılmışlara bənzədilməsi zəruriyyətini tələb edəcəyini iddia edərək, Allahın sifətlərinin olduğuna dəlalət edən bir çox kərim ayələrdən üz döndərmişlər. Anlamın əslinin qəbul edilməsinin bənzərliyi lazım bilmədiyini isə qəbul etməmişlər.*

*Buna misal*[R6] *Uca Allahın bu buyuruğudur:*

---

[R6] Əsərin Məkkə şəhərində nəşr edilmiş ikinci buraxılışında, onun üçüncü buraxılışından və türk tərcüməsindən fərqli olaraq aşağıdakı çümlələr də

***"Hər kəs bir mömin şəxsi qəsdən öldürərsə, onun cəzası əbədi qalacağı Cəhənnəmdir. Allah ona qəzəb və lənət edər,*** *[axirətdə]* ***onun üçün böyük əzab hazırlar!" (Nisa, 4/93)***

*Onlar*[R7] *bu barədəki təhdidlə əlaqədar şübhəyə düşmüş (buyruq onlara mütəşabih gəlmiş) və bu baxımdan mömini qəsdən öldürən şəxsin Cəhənnəmdə əbədi qalacağını anlayaraq, bunun, böyük günah işləyən hər kəs üçün mümkünlüyünü qəbul etməklə, şirkdən özgə hər bir günahın (əzabının) Uca Allahın istəyinə bağlı olduğunu sübut edən başqa ayələrdən üz döndərmişlər.*

*Bu ayələrdən biri də Uca Allahın bu buyuruğudur:*

*"[Ya Rəsulum!]* ***Məgər bilmirsənmi ki, Allah göydə və yerdə nə varsa bilir? Həqiqətən, bu, bir kitabdır. Şübhəsiz ki, bu Allah üçün asandır!" (Həcc, 22/70)***

*Cəbriyyəçilər bu buyruğa görə şübhəyə düşərək, məhz ondan: "qulun bu əməli etməyə məcbur olduğu" mənasını çıxarmışlar. Bununla belə, qulun bu işi görməyə bir iradə və qüvvəsinin olmadığını və bir də qulun hərəkətlərinin, özündən asılı olan və olmayan olmaqla, iki cür olduğunu bildirən ayələri inkar etmişlər.*

*Elmdə qüvvətli olan ağıl sahibləri isə mütəşabih olan bu cür ayələrin mənalarını necə açıqlayacaqlarını, digər ayələrlə əlaqədar bir şəkildə necə mənalandırılacaqlarını bilirlər. Beləliklə, Qurani Kərimin heç də bütün ayələrinin mütəşabih olmadığını və qorunan, mühafizə edilən bir Kitab*

---

söylənilmişdir: «Buna misal Uca Allahın bu buyuruğudur: ***"...sonra səmaya istiva etdi" (əl-Bəqərə, 2/29)*** Yəni Buxaridə rəvayət edildiyi kimi "yüksəldi və ucaldı".

R7 Əsərin ərəd dilindəki ikinci buraxılışında, onun növbəti nəşrindən və türk tərcüməsindən fərli olaraq burada əvəzlik deyil, Vaidilər kəliməsi yazılmışdır ki, bu da xəvariclərin adlarından biridir.

*olduğunu görürük (Bax: Məhəmməd b. Saleh əl-Useymin, Usulun fit-təfsir)*

## *Quran ayələrinin möhkəm və mütəşabih növlərə ayrılmasındakı hikmət*

*Əgər Quran bütövlüklə möhkəm ayələrdən ibarət*[Σ79] *olsaydı, onu təsdiq etmək və layiqincə ona əməl etməklə imtahana çəkilmək kimi bir hikməti anlamaq mümkün olmazdı. Çünki mənası açıq-aydın üzdə olar, onun təhrif edilməsinə və fitnəkarlıq üçün onu yol verilməyən bir tərzdə izah etmək məqsədiylə mütəşabih ayələrə müraciət etməyə ehtiyac qalmazdı. Əgər hamısı mütəşabih olsaydı, onun insanlar üçün təfsir edilməsinə və doğru yol göstərən olmasına lüzum olmazdı. Ona layiqincə əməl edilməz və əsasında möhkəm bir əqidə təşəkkül tapmazdı. Bir sözlə, Uca Allah hikməti ilə Quranın bir sıra ayələrini möhkəm etmişdir. Oxşar ayələrə rast gəlindikdə onlara xüsusi diqqət yetirilir. Uca Allah bir qisim digər ayələrini də mütəşabih tərtib etmişdir. Bunların belə olması isə imanında səmimi olanla qəlbində şəkk-şübhə olanların bir-birilərindən ayırd edilməsi məqsədilə imtahan edilmələri üçündür. İmanında səmimi olan şəxs Quranın bütünlüklə Uca Allahdan nazil edildiyini bilir. Allahdan nazil olan isə haqdır. Onda batilin və*

---

[Σ79] Türk mətnində bu söz ***"muhkem"*** kimi ifadə olunmuşdur ki, onun da lüğəti mənası "sağlam, pozulmaz, etibarlı bina" kimi verilir. Lakin bu istilah belə keyfiyyətlər daşıyan başqa ayələr üçün də istifadə edilir. O ayələrdə bu söz "sağlamlaşdırılmış (möhkəmləşdirilmiş), qorunmuş, mühafizə edilmiş" mənalarını verir. Bu qəbildən olan ayələr məna baxımından açıqdır, onların başqa cür yozulmasına, şərh edilməsinə icazə verilmir, onların hökmləri başqa ayələrlə ləğv edilməmişdir (Bax: Ömer Sevincgül, "Özel lüğat", İstanbul, 2003, ZAFER yayınları, 1-ci nəşr, səh. 579-580)

*ya ziddiyyətin olmasına imkan yoxdur. Bununla əlaqədar Uca Allah belə buyurur:*

***"Nə öncə, nə də sonra batil ona yol tapa bilməz*[Σ80]*. O, hikmət sahibi, şükrə layiq olan tərəfindən nazil edilmişdir" (Fussilət, 41/42); "…Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət tapardılar" (Nisa, 4/82)***

*Qəlbində şəkk-şübhə olan şəxs mütəşabih ayəni, möhkəm buyruqları təhrif etmək, vəhylər barədə şübhə yaratmaq və hökmlərə qarşı çıxmaqla bağlı istəklərinə tabe olan vasitəyə çevirir. Buna görə, etiqad və əməl baxımından, yolunu azmış bir çox adamların öz azğınlıqlarına bu qəbildən olan mütəşabih ayələri dəlil kimi göstərdiklərini görürük (Bax: Məhəmməd b. Saleh əl-Useymin, "Usulun fit-təfsir" adlı əsərində başqa nümunələr də vardır)*

*Aişə (A.o.r.) demişdir ki: Peyğəmbər (sallallahu əleyhi və səlləm) aşağıdakı:* ***"**[Ya Rəsulum!]* ***Sənə Kitabı nazil edən Odur. Onun bir hissəsi möhkəm, digər qismi isə mütəşabih ayələrdir. Ürəklərində əyrilik** [şəkk-şübhə]* ***olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih ayələrə uyarlar** [tabe olarlar]**. Halbuki onların yozumunu Allahdan başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə: "Biz onlara iman gətirdik, onların hamısı Rəbbimizin dərgahındandır", - deyərlər. Bunları yalnız ağıllı adamlar başa düşə bilərlər" (Ali-İmran, 3/7)** ayəni oxuduqdan sonra belə buyurdu: "Əgər sən onun mütəşabih olanlarına tabe olanları görməli olsan, bax, Allahın barələrində dediyi şəxslər onlardır, sən onlardan uzaq ol" Buxari və Muslim)*

---

[Σ80] *Şeytan onun bir sözünü, bir hərfini belə dəyiş ə bilməz* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 534)

## *Qurani Kərimdən necə faydalana bilərik*

*Uca Allah buyurur ki:* ***"Şübhəsiz ki, bunda qəlb sahibi, yaxud hazır olub qulaq asan kimsə üçün öyüd-nəsihət vardır" (Qaf, 50/37)***

*Qurandan faydalanmaq istəyiriksə onu oxuduğumuz zaman bütün diqqətimizi toplamalı, ona yaxşıca qulaq asmalı, onu dinləyən sayıqlığını itirməməlidir. Çünki, O, şan-şöhrəti Uca Rəbbimizin Elçisi (sallallahu əleyhi və səlləm) vasitəsilə bizə xitab edilmişdir.*

*Təsirin tamlığı bu təsiri zəruri edən bir amil, bu təsiri qəbul edən bir yer, bu təsirin meydana gəlməsi üçün bir şərt və bu təsiri qabaqlayan xüsusiyyətlərin yoxluğu ilə bağlı olduğundan, kərim ayə bütün bunları ən özünəməxsus, ən aydın və məqsədə daha çox dəlalət edən kəlmələrlə izah etmişdir.*

*Uca Allahın:* ***"Şübhəsiz ki, bunda … öyüd-nəsihət vardır" (Qaf, 50/37)*** *buyruğu Qaf surəsinin əvvəlindən buraya qədər keçən bütün xüsusiyyətlərinə bir işarədir. Bax, amil budur.*

***"...qəlb sahibi..."*** *ifadəsi də bu təsiri qəbul edəcək və təsirlənəcək yeri bildirir. Bundan məqsəd isə, Allahdan nazil olan buyruqları başa düşən, anlayan diri qəlbdir. Beləliklə, Uca Allah belə buyurur:* ***"…Ona vəhy olunan ancaq öyüd-nəsihət və açıq-aşkar Qurandır ki, onunla diri olanları qorxutsun" (Yasin, 36/69-70)*** *Burada diri sözündə nəzərdə tutulan qəlbin diri olmasıdır.*

*Uca Allahın:* ***"…qulaq asan kimsə…"*** *buyruğunda, onlara deyilənlərə qulaq asan, deyilənləri yaxşıca dinləyən şəxslər nəzərdə tutulur. Bu da sözdən təsirlənmək üçün bir şərtdir.*

*__"...yaxud hazır olub..."__ ifadəsi də qəlbi qəfildən deyil, hazır olaraq dinləyəni bildirir.*

*İbn Quteybə deyir ki, sən, qəlbin və ağlın dərk etməyə hazır olduğu bir halda Allahın Kitabına qulaq as. Onu dinləyərkən qəflətdə və yanılmalar içərisində olma.*

*Bax bu, təsirin gerçəkləşməsinin qarşısını alan maneəyə işarədir. Bu maneə qəlbin yanılması, ona deyilənləri yaxşıca fikirləşmədən onlar haqqında düşünməyi və təfəkkürü tərk etməsidir.*

*Buna görə, Qurani Kərim – amil, təsiri qəbul edən yer – diri qəlb, dinləmək isə – şərt rolunu oynayır. Qəlbin başqa işlərlə məşğul olması, xitabın mənasından uzaqlaşması və başqa bir səmtə yönəlməsini bildirən, anlamağa mane olan xüsusiyyətlər olmazsa, təsir də gerçəkləşər. Bu təsir isə, Qurani Kərimdən faydalanmaq, ondan öyüd-nəsihət və ibrət almaqdır. (Bax: İbn Qeyyimin "əl-Fəvaid" əsəri, səh. 3-5)*

## *Quranı necə oxuyaq*

*Uca Allah: __"…Həm də aramla Quran oxu!" (Muzzəmmil, 73/4)__ – deyə buyurur. Onu ağır-ağır, tələsmədən oxu! Belə oxumaq Quranı anlamağına və onun üstündə əməllicə düşünməyinə köməkçi olacaq.*

*Ummu Sələməyə Peyğəmbərin (sallallahu əleyhi və səlləm) Quranın oxunuşu haqqında sual verildikdə, o, belə demişdir:*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) Quranın oxunmasını ayələrə bölərdi. (Belə): "Rəhimli, mərhəmətli Allahın adı ilə (deyər və dayanardı); Həmd olsun Allaha - aləmlərin Rəbbinə (deyər və dayanardı); Rəhmli mərhəmətli olana (deyər və dayanardı); Haqq-hesab gününün sahi-*

*binə…" (Səhih hədis kimi Tirmizi tərəfindən rəvayət edilmişdir)*

*Quranın aramla (ağır-ağır) oxunması, səsin məlahətliləşdirilməsi və oxuyarkən tələsməmək bəyənilən bir əməldir, yəni müstəhəbdir.*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) buyurub ki: "Quranı səsinizlə gözəlləşdirin. Çünki gözəl səs Quranın gözəlliyini artırır" (Səhih hədis kimi Əbu Davud və başqaları tərəfindən rəvayət edilib)*[R8]

*İbn Məsud demişdir ki: "Quranı qumu ələyən kimi ələməyin. Şer oxuduğunuz kimi tələsə-tələsə oxumayın. Onun heyrətəngiz buyruqları üzərində dayanın, onlarla qəlbləri hərəkətə gətirin. Sizdən hər hansı bir kimsənin əsas məqsədi surəni tam bitirmək olmasın" (Buxari)*[R9]

---

R8 Hədisi bu mətnlə Əbu Davudun "Sünən" əsərində tapa bilmədim. Yalnız onun birinci cümləsinə oxşar bir ifadə Bəra b. Azibin (A.o.r): *"Quranı səsinizlə bəzəyin"* rəvayətində (Əbu Davud, 1468) verilmişdir.

Cəmil Zeynunun təqdim etdiyi mətni, Əd-Darimi (Sünən, 2/565, h. 3501), Beyhəqi (Şuabul iman, 2/386, h. 2141) və başqaları Bəra b. Azibdən (A.o.r.) rəvayət etmişlər. Şeyx Əlbani isə, "Səhih Cəmi" (3145) və "Səhih hədislər silsiləsi" (2/401, h.771) əsərində onun səhih olduğunu bildirilmişdir.

R9 İbn Məsudun sözlərini Buxarinin "Səhih"ində tapa bilmədim. Məsələ ilə bağlı "Quranı necə anlamalı" kitabının ərəb dilindəki ikinci və üçüncü nəşrinə baxdıqda səhvin türk tərcüməçisinə aid olmadığı aşkar olundu. Həmin əsli nüsxələrin ikinci nəşrində əsərin əl-Bəğəvi, üçüncüsündə isə Buxari tərəfindən rəvayət edildiyi bildirilmişdir. Onun məxəzlərini müstəqil araşdırdıqdan sonra məlum oldu ki:

İbn Kəsir Muzzəmmil surəsinin təfsirində (4/559) bu əsərin imam Bəğəvi tərəfindən nəql edilməsini bildirmişdir. Hicrətin 516-cı ilində vəfat etmiş Hüseyn b. Məsud əl-Bəğəvi isə öz növbəsində onu "Məalimu ət-tənzil" (4/407) adlı təfsirinə daxil etmişdir. Həmçinin İbn Əbi Şeybə (Musannəf 2/256, №8733), Beyhəqi (Şuabul iman 2/360, №2041) və başqaları da bu əsəri Abdullah b. Məsuddan (A.o.r.) rəvayət etmişlər.

Əsərlə bağlı bir qeydi də nəzərinizə çatdırım ki, onun Peyğəmbərdən (sallallahu əleyhi və səlləm) rəvayət edilməsi haqda əs-Suyuti "əd-Dərrul mənsur" (8/314) adlı təfsirində demişdir: əd-Deyləmi onu

*Quranın oxunuşunun bitməsindən sonra "sadəqallah-ulazim" demək lazım deyil. Çünki Quran oxumaq bir ibadətdir. Ona, şəriət baxımından, ayələrdən başqa bir şey əlavə etmək qəbul olunmur. Bu barədə hər hansı bir şey nazil olmamışdır.*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) İbn Məsuddan Quranı dinləmişdir. O, Uca Allahın:* ***"…səni də onlara şahid təyin edəcəyimiz zaman** [kafirlərin halı] **nə cür olacaq?" (Nisa, 4/41)*** *buyruğuna çatdıqda Peyğəmbər (sallallahu əleyhi və səlləm) ona: "Bu qədər bəsdir!" dedi. (Buxari) Lakin İbn Məsud "sadəqallahulazim" demədiyi kimi, Peyğəmbər (sallallahu əleyhi və səlləm) də ona bunu əmr etməmişdir.*

*Bu bidət olan bir sünnəni aradan qaldırmış, onun məhvinə səbəb olmuşdur. Qeyd edilən isə Peyğəmbərin (sallallahu əleyhi və səlləm) aşağıdakı buyruğunda dediyi kimi dua etməkdir: "Quran oxuyan şəxs onunla Allahdan istədiyini xahiş etsin" (Yaxşı hədis olmaqla Tirmizi tərəfindən rəvayət edilmişdir)*

*Quran oxuyan şəxs qiraətindən sonra istədiyi şəkildə dua etsin və oxuduğu ilə Allaha təvəssül etsin*[Σ81]*. Çünki o, duanın qəbuluna səbəb olan xeyirxah əməllər sırasındadır. Bu duanı oxumaq da münasibdir:*

*"Allahım, mən sənin qulunam, sənin kölənin və cariyənin oğluyam. Taleyim sənin əlindədir. Hökmün qəbulumdur. Barəmdə hökmün də ədalətlidir. Öz zatına ad kimi verdiyin və ya kitabında nazil etdiyin və ya da qullarından birinə öyrətdiyin və yaxud dərgahındakı qeyb aləmində yalnız Özünə bəlli saxladığın hər bir adınla Səndən*

---

zəif bir isnadla İbn Abbasdan, o da Peyğəmbərdən (sallallahu əleyhi və səlləm) nəql etmişdir. Daha doğrusunu Allah bilir.

[Σ81] Oxuduğunu vasitəçi etsin.

*istəyirəm ki: Qurani Kərimi qəlbimin baharı, gözümün nuru, kədərimi aparan, sıxıntımı, qəmimi dağıdan edəsən!" (Yaxşı hədis kimi Əhməd tərəfindən rəvayət edilmişdir)*[R10]

[R10] Hədisi imam Əhməd (1/391, h. 3712), İbn Əbi Şeybə (6/40, h. 29318), Əbu Yəla (9/198, h. 5297), Təbərani (Mucamul-kəbir, 10/169, h. 10352) və başqaları rəvayət etmişlər. Şeyx Əlbani "Səhih Tərğib və Tərhib" (2/361, h. 1822) əsərində onun səhih olduğunu bildirmişdir.

## *"Quran sənin lehinə və yaxud əleyhinə olan bir dəlildir"*

*Muslimin mötəbər bir hədis kimi rəvayət etdiyi bu sərlövhə Quranı oxuyanları iki hissəyə ayırır:*

*1. Quranı oxuyan və qiyamət günü Quranın onun lehinə dəlil gətirəcəyi şəxs, Quranın hökmlərini yerinə yetirən, qoyduğu qadağalardan uzaq duraraq halalını halal, haramını haram qəbul edən, Qurana müvafiq olaraq hökm verən, onun hökmünə tabe və razı olan, Uca Allahın:* ***"[****Ya Peyğəmbər!****] Bu Quran sənə nazil etdiyimiz mübarək bir Kitabdır ki, [****insanlar****] onun ayələrini düşünüb dərk etsinlər və ağıl sahibləri də ibrət alsınlar!" (Sad, 38/29)*** *buyruğuna əməl edərək, onun başa düşülməsi üstündə yaxşıca fikirləşən, onu çoxluca oxuyub əzbərləyən, başqasından dinləyən, bilavasitə Qurani Kərimə dair verilişlər yayan radiolardan, Sıddıq Minşəvi, Husari və daha başqa məşhur Quran qarilərinin kassetlərini yaxşıca dinləyərək ailəsi ilə birlikdə onun tilavətindən və təfsirindən faydalanan, Uca Allahın:* ***"…Əhdə vəfa edin. Çünki [****insan****] əhd barəsində [****qiyamət günü****] cavabdehdir"***[Σ82] ***(İsra, 17/34)*** *buyruğunu oxuduqda və ya dinlədikdə Rəbbinə və qardaşlarına olan əhdlərini və vədlərini yada salaraq yerinə yetirmək üçün hazır olan şəxsdir.*

*2. Qurani Kərimi oxumaqla bərabər Quranın onun əleyhinə dəlil gətirəcəyi adam isə onun hökmlərinə layiqincə əməl etməyən, qoyduğu qadağanlarından çəkinməyən, halalını halal, haramını haram saymayan, Qurana müvafiq olaraq hökm etməyən, Quran hökmlərinə tabe və razı olmayan, Quranı anlamağa, üstündə düşünərək hökmlərini*

---

[Σ82] *İnsan verdiyi əhdi yerinə yetirib-yetirmədiyi haqda sorğu-suala tutulacaqdır.*

*tətbiq etməyə əhəmiyyət verməyən kimsədir. Belə bir kəs Uca Allahın:* ***"…Sonra [****Allaha****] dua edib yalançılara Allahın lənət etməsini diləyək!" (Ali-İmran, 3/61)*** *buyruğunu oxuduğu və dinlədiyi zaman, onun insanlarla danışığında yalan söylədiyini, sözü üstündə durmadığını, əlaqələrində, bağladığı əqdlərində onları aldatdığını görürük. Çox təəssüflər olsun ki, bəzi kafirlərin qarşılıqlı əlaqələrində, əqdlərində və verdikləri sözlərində vəfalı olduğu görülməkdədir. Mənim oğlumun başa saldığına görə, o, Parisdə zooparkda gəzərkən orada ikiəlli bir heyvan görmüşdür. Bir nəfər o heyvana bir şey atanda o əliylə tuturmuş. Orada gəzənlərdən başqa birisi verməyə bir şey tapmadığı üçün heyvana sanki bir şey verirmiş kimi əliylə işarə edir. Bunu görən heyvanxana nəzarətçisi olan fransız həmin müsəlmana yaxınlaşaraq, heyvanı aldatmasına görə onu məzəmmət etmişdi.*

*Bu əhvalat bizə imam Buxarinin (Uca Allah ona rəhmət etsin) başına gəlmiş bir hadisəni xatırladır. O, hədis nəql etdiyini eşitdiyi bir adamdan hədis almaq üçün çox uzaq bir şəhərə getmişdi. Uzun sürən və çətin bir səfərdən sonra həmin adamın yanına gəlib çatmışdır. O adamın bir heyvana əli və paltarının ətəyi ilə işarə edərək*[Σ83] *çağırdığını gördükdə, Buxari hədisi ondan dinləmədən geri dönmüşdür. Çünki heyvanı yalanla aldadan bir kimsə Peyğəmbər (sallallahu əleyhi və səlləm) haqqında da yalan deyər. Bir çox adamlar zarafat xatirinə yalan dediklərinin və yaxud uşağına yalan söyləməyinin və, beləliklə də, onun bu əməllərinin öz əleyhinə yazıldığının fərqinə varmırlar. Hədisdə belə deyilir:*

*"Zarafatla da olsa, yalan söyləməkdən çəkinən şəxsin cənnətin ortasında bir evinin olacağına mən zamin*

[Σ83] Sanki bir şey verirmiş kimi.

*dururam" (əl-Əlbani hədisin yaxşı istinadlı olduğunu bildirmişdir)*

*Belə olduğu halda, müsəlman qardaşım, oxuduğun və dinlədiyin Qurana əməl etməlisən ki, Quran sənin əleyhinə deyil, lehinə dəlil olsun. Xüsusilə Quran hafizləri, Quran elmləri və təfsiri ilə məşğul olanlar belə olmalıdırlar. Çünki Quranı əzbərləyən və təfsiri ilə məşğul olanların bir çoxunun Quranın göstərişlərinə, əxlaqına sadiq olmadıqları müşahidə edilir.*

*Digər tərəfdən Quranı əzbərləməklə, onun təfsiri ilə uzun müddət məşğul olmaqla bərabər yalan danışan, qardaşlarına ən çirkin niyyətlərlə böhtan atan, çirkin sözlər deməkdən çəkinməyən və bunları zəruri edən heç bir səbəb gətirməyən insanlar da vardır. Belə ki, sələfi əqidəsi sahibi olan, yüksək səviyyəli, hörmətli bir mühəddis elm xadimi haqqında onun cəhənnəm odunda yanacağına dair qərar çıxaran və Məkkə harami içərisində bir qardaşına hücum çəkərək, onu "ey cahil, ey yolunu azmış, sən mənə cavab verməyə cəsarətmi edirsən" deyənləri də görürük. Demək lazımdır ki, məhz bu kimsəyə qardaşı öyüd-nəsihət vermiş və onun səhvlərini çox ehmallıca şərh etmişdir. Lakin bu şəxsi günahkarlıq və təkəbbür hissi əsir etmiş, o, Beytullahın divarları arasında düşmənçilik edərək həddini aşmışdır. Halbuki, İslamdan əvvəlki müşriklər də belə bu Allah evinə hörmət edərdilər. Atasının qatilini də Haramda görən, Allahın evinə bəslədiyi ehtirama görə, ondan üzünü çevirərdi. Fəqət belə bir adam Quranı əzbərləməsinin, onun təfsiri ilə məşğul olmasının hansı bəhrəsini görə bildi? Şübhəsiz ki, Quran bu şəxsin əleyhinə dəlil olacaqdır. Sözü doğru olan və doğru sözü təsdiqləyən Peyğəmbər (sallallahu əleyhi və səlləm) buyurmuşdur: "Quran ya sənin lehinə, ya da əleyhinə bir dəlildir" (Muslim)*

*Quran hafizləri arasında ölülərə Quran oxumağı özünə peşə seçən, bunun əvəzində pul alan və məclislərdə*

*yeyib-içmək üçün bir vasitəyə çevirən kimsələri tanıyıram. Ancaq Peyğəmbər (sallallahu əleyhi və səlləm) millətini belə şeylərdən çəkindirərək belə buyurmuşdur:*

*1. "Quranı oxuyun, ona əməl edin, ondan uzaq düşməyin. Onun həddini aşmayın. Onu yemək vasitəsinə çevirməyin. Onun vasitəsilə mallarınızı çoxaltmağa cəhd etməyin" (Səhih hədis kimi imam Əhməd və başqaları tərəfindən rəvayət edilmişdir)*

*2. "Quranı oxuyan və onun vasitəsilə insanlardan bir şey istəyən qruplar peyda olmamışdan əvvəl Quranı oxuyun və onun vasitəsilə Allahdan istədiklərinizi diləyin" (Səhih hədis kimi imam Əhməd və başqaları tərəfindən rəvayət edilmişdir)*

## *Quranı tərk etməkdən çəkinmək*

***"Peyğəmbər də: "Ey Rəbbim! Həqiqətən qövmüm bu Quranı tərk etmişdi!" – deyəcək" (Furqan, 25/30)***

*Uca Allah Elçisi və Peyğəmbəri Məhəmməddən (sallallahu əleyhi və səlləm):* ***"Ey Rəbbim! Həqiqətən qövmüm bu Quranı tərk etmişdi!"*** *dediyini xəbər verir.* ***"Kafir olanlar*** *[öz dostlarına]****: "Bu Quranı dinləməyin, o oxunduqda səs-küy salın ki, bəlkə,*** *[bununla Məhəmmədə]* ***qalib gələsiniz!" (Fussilət, 41/26)*** *buyruğunda bildirdiyi kimi, onu dinləmir, ona qulaq asmırlar. Onlara Quran oxunduğu zaman onu dinləməmək üçün təmtəraqlı sözlər danışır, səs-küy qoparırlar. Bax bu, Quranı tərk etməkdir. Ona imanı, onu təsdiq etməyi tərk etmək də onu tərk etmək deməkdir. Onun üstündə düşünməyi, onu anlamağa çalışmağı tərk etmək onu tərk etmək, ondan uzaqlaşmaqdır. Layiqincə əməl etməyi, hökmlərinə tabe olmağı, qoyduğu qadağanlardan uzaq durmağı tərk etmək də onu tərk etməkdir. Quranı buraxıb şer, söz, mahnı, əyləncə və yaxud müxtəlif baxışlara uymaq və ya da Qurandan alınmamış hər hansı bir yola üz tutmaq da onu tərk etməkdir.*

*Səxavətli, lütfkar və gücü hər şeyə çatan Allahdan bizi Onu qəzəbləndirən hər bir şeydən xilas etməsini, Onu razı salacaq Kitabını əzbərləmək, onu anlamaq, gecə vaxtlarında, gündüzün müxtəlif anlarında Onun sevəcəyi və razı qalacağı tərzdə ona əməl etməyimizə bizi yönəltməsini diləyirik. Şübhəsiz ki, O, kərəmi bol-bol Olandır, sonsuz Bağışlayandır (Bax: İbn Kəsir, Təfsir)*

*Quranı tərk edərək ondan uzaqlaşmağın müxtəlif formaları var:*

*1. Quranı dinləməyi, ona iman gətirməyi və ona qulaq asmağı tərk etmək.*

*2. Quranı oxusa və ona iman gətirsə də belə, ona layiqincə əməl etməmək, onun halal və haram hökmlərini yerinə yetirməmək.*

*3. Dinin əsaslarında, ayrı-ayrı hökmlərində Quranı hakim saymağı və onun tələblərinə tabe olmağı tərk etmək, onun mükəmməl bilik vermədiyinə, dəlillərinin elmlə əlaqəsi olmayan sözlərdən ibarət olduğuna inanmaq.*

*4. Qurani Kərim üstündə yaxşıca düşünməyi, onu anlamağa çalışmağı, ondakı buyuruqları söyləyənin ondan nəyi istədiyini bilməyi tərk etmək.*

*5. Bütün ürək xəstəliklərində onda şəfa və müalıcə axtarmağı tərk edərək bu xəstəliklərdən sağalmanı Qurandan kənarda aramaq, onunla müalicə etməmək. Bax bütün bunlar Uca Allahın:* ***"Peyğəmbər də: "Ey Rəbbim! Həqiqətən qövmüm bu Quranı tərk etmişdi!" – deyəcək" (Furqan, 25/30)*** *buyruğunun əhatə etdiyi mənaya daxildir.*

*Bununla bərabər bu tərketmələrin növləri daha da incədir. (İbn-Qeyyim, əl-Fəvaid, 113)*

# *QURANIN BƏZİ AYƏLƏRİNİN TƏFSİRİ*

## *Dində bidət etməkdən çəkindirmək*

*Uca Allah İsa əleyhissəlam haqqında belə buyurur:*

***"…Onun ardınca gedənlərin qəlblərində bir-birinə şəfqət, mərhəmət oyatdıq. Onlar özlərindən rahiblik icad etdilər. Biz onu onlara vacib buyurmamışdıq. Onlar bunu Allah rizasını qazanmaq üçün etdilər, lakin ona layiqincə əməl etmədilər[Σ84] …" (Hədid, 57/27)***

*"Rahiblik" buyruğu – onlar bir rahiblik icad etdilər deməkdir. Bu buyruğda mükəmməl xeyrixahlıq əməli "mərhəmət oyatdıq" ifadəsilə verilir və daha sonra "onlar özlərindən rahibdik icad etdilər" buyruğu davam etdirilir. Burada Allah göstərir ki, "Biz onu onlara vacib buyurmamışdıq". Əksinə onlar özlərindən onu bidət kimi araya gətirdilər (haqlarında bəhs edilənlər xristianların rahibləridir)*

*Uca Allahın:* ***"...Onlar bunu Allah rizasını qazanmaq üçün etdilər..."*** *ifadəsindəki buyruqda (qazanmaq mənasındakı sözün) fəthə ilə hərəkələnməsi barədə üç nəzər nöqtəsi mövcuddur:*

*Ən doğrusu, bunun, ayrılmış bir istisna kimi fəthə ilə hərəkələnməsidir. Yəni, onlar rahibliyi ancaq Allahın rizasını almaq üçün icad etmişdilər. Buna isə Uca Allahın: "onlar özlərindən (bidət olan) rahiblik icad etdilər" buyruğu dəlil rolunu oynayır. Bundan sonra isə, onları bu rahibliyi uydurmağa yönəldən səbəbi (yəni, Allahın razılığını axtarmağı) xatırlamışdır. Ardıyca ona layiqincə riayət*

---

[Σ84] *İncili təhrif edib İsanı Allah bildilər, Muhəmməd əleyhissəlamın peyğəmbərliyini dandılar* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 598)

*etməkdən uzaqlaşmaları onlara qarşı nifrət oyadır" (Mədəricus-Səlikin, III, 32)*

*Şeyx Həmid əl-Faqi bu izahla bağlı olaraq aşağıdakıları bildirir:*

*"Ayənin əvvəlki və sonrakı buyruqları ilə bərabər onun üslubundan belə məlum olur ki, Uca Allahın məqsədi dində bidət yaradanları məhkum etmək və bunun insan təbiətinə zidd olduğunu bəyan etməkdir. Bidət törədən hər hansı bir şəxs əslində o bidəti layiqincə yerinə yetirmək gücünə malik olmaz və olsa da onu itirər. Çünki ortaya atılan o bidət insan təbiətinə və sağlam ağla ziddir və onlardan uzaqdır. Hər şeyi bilən və hikməti sonsuz olan aləmlərin Rəbbi Allahın qulları üçün nəzərdə tutduğu nemətini tamamlamaqdan ötrü müfəssəl şərh etdiyi din də bəşəriyyəti islah etmək, Uca Allahın insanları xəlq edərkən onlara verdiyi fitrətlə onları siratu mustəqimə*[Σ85] *yönəltmək üçündür.*

*Rahiblik – insan təbiətinə qarşı qoyulmuş, cinsi, qidalanma, geyinmə, rahatlıq, yuxu və buna oxşar haqlardan məhrum edilməklə bağlı, ilahi yaradılışa kökündən ziddir. İnsanın bunu yerinə yetirə bilməsi və ona layiqincə riayət etməsi mümkün olmayan bir şeydir.*

*Bundan ötrü Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə işi görənlərə olduqca qəzəblənmişdir Uca Allah da belə buyurur:*

***"De: "Allahın öz bəndələri üçün yaratdığı zinəti və təmiz ruziləri kim haram buyurmuşdur?"… (Əraf, 7/32)***

*Bir çox ayələrdə belə bir işə qoşulanın şeytanın öz dostlarına etdiyi təlqinlərlə bağlıdır. Doğrusunu ən yaxşı bilən Allahdır". (bu açıqlama üçün bax: İbn Qeyyim, ət-Təfsirul Qeyyim, səh. 486)*

---

[Σ85] Düzgün yola

*Bəzi sufilər də rahiblərə bənzəyərək yundan toxunmuş paltar geyinirlər, öz nəfslərini, Qurana və Peyğəmbərin (sallallahu əleyhi və səlləm) doğru yoluna qarşı çıxaraq, xoş və təmiz şeylərdən məhrum edirlər.*

## *Bidətçilərlə oturub-durmaqdan çəkindirmək*

*Uca Allah buyurur ki:*

***"…Əgər Şeytan[Σ86] sənə unutdursa, xatırlayandan sonra o zalım tayfa ilə bərabər oturma" (Ənam, 6/68)***

*Bundan məqsəd ümmətin hər hansı bir fərdinin Allahın ayələrini təhrif edən və onları layiqincə dəyərləndirməyən yalançılarla ünsiyyət saxlamamaqdır (İbn Kəsir)*

*Qeyd etməliyəm ki, "zalimlər tayfası" müşrikləri, yolundan azmışları və dində bidət yaradanları əhatə edir. İbn Qeyyim onlardan çəkindirərək, aşağıdakıları söyləmişdir:*

*"Dördüncü qism – ünsiyyət saxlanılması tamamilə məhvedici olan və onunla oturub-durulması zəhər yemək səviyyəsində olan insanlardır. Əgər onu yeyən adam zəhəri təsirsizləşdirən zəhər əleyhinə bir vasitə taparsa, xilas ola bilər. Əks təqdirdə o şəxsin başsağlığını verməkdən başqa bir çarə qalmır. İnsanlar arasında bu qəbildən olanlar nə qədər desən vardır. Allah onları çoxaltmasın! Bunlar bidət və zəlalət əhli olan şəxslər, Allahın və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) sünnəsindən uzaq qaçanlar, o sünnənin əleyhinə olan yollara çağıranlar, Allahın yolu ilə gedilməsinə mane olub, onun şəkk-şübhəyə salınmasını istəyənlərdir. Beləliklə, onlar bidəti sünnə, sünnəni bidət, qəbul sayılan bir şeyi inkar edər, rədd ediləni isə bəyənilən kimi qələmə verərlər.*

*1. Əgər onların arasında təmiz bir tövhiddən söz salsan, sənə: əməlisaleh övliya cənablarını hörmətdən salırsan, deyərlər.*

*2. Əgər sadəcə olaraq Allahın Peyğəmbərinə (sallallahu əleyhi və səlləm) tabe olmaqdan bəhs*

---

[Σ86] *Bu qadağan əmrini*

*edərsənsə, sənə: tabe olunması zəruri olan imamları heç etdin, deyərlər.*

*3. Əgər Uca Allahı, Onun Özünün və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) buyurduğu sifətlərlə vəsf etsən, bu barədə özündən heç nə əlavə etməsən də, qüsurlu davranmasan da, səni: muşəbbihəçilərdənsən (yəni, Allahı Onun yaratdıqlarına bənzədən – red.) - deyə adlandırarlar.*

*4. Əgər Allah və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) əmr etdiyi bəyənilmiş bir şeyi əmr etsən, Allah və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) haram buyurduğunu qadağan etsən, sənə: fitnəkarlardansan deyərlər.*

*5. Əgər Sünnəyə tabe olar, Sünnəyə zidd olan şeyləri tərk edərsənsə, səni doğru yoldan azdıran bidət əhlindən adlandırarlar.*

*6. Yalnız Uca Allahın rizasına üz tutub dünya malı ilə onları baş-başa qoysan, səni haqqı batilə qarışdıran adlandırarlar.*

*7. Əgər getməkdə olduğun yolu buraxaraq onların istədiyinə tabe olsan, Allah yanında zərərə düşənlərdən olsan da, onlara görə münafiqlərdən olarsan. Belə hallarda, onları əsəbiləşdirmək bahasına da olsa, Allah və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) rizasını axtarmağa, onların kandarına və danlağına yaxınlaşmamağa diqqət yetir. Onların səni məzəmmət etmələrinə və sənə nifrət bəsləmələrinə fikir vermə. Çünki bu sənin öz kamilliyindəndir və vəziyyət aşağıdakı beytdə deyildiyi kimidir:*

*"Əgər sənə əskik bir şəxs tərəfindən mənim pisləndiyim xəbəri çatsa,*

*Bil ki, o, mənim fəzilət sahibi olduğuma dair bir şəhadətdir" (Bax: İbn Qeyyim, ət-Təfsirul-Qeyyim, səh. 630)*

*Qeyd etməliyəm ki, belə adamları ən gözəl üsulla haqqa dəvət etmək qaçınılmazdır. Məhz bu yolla onlara qarşı dəlil gətirmək olar. Bunu da Rəsulu Əkrəminə (sallallahu əleyhi və səlləm) belə xitab edən Uca Allahın aşağıdakı əmrinə tabe olmaqla etmək lazımdır:*

***"[Ya Rəsulum!] İnsanları hikmətlə*[Σ87] *gözəl öyüd-nəsihət ilə Rəbbinin yoluna [İslama] dəvət et…" (Nəhl, 16/125)***

***"[Ya Rəsulum!]*[Σ88] *Səbr et. Sənin səbr etməyin yalnız Allahın köməyilədir. Onlardan [müşriklərdən] ötrü kədərlənmə və qurduqları hiylələrə görə də ürəyini qısma! Həqiqətən, Allah Ondan qorxub pis əməllərdən çəkinənlər və yaxşı işlər görənlərlədir!" (Nəhl, 127-128)***

*8. Uca Allah belə buyurur:* ***İnsanları hikmətlə gözəl öyüd-nəsihət ilə Rəbbinin yoluna [İslama] dəvət et…" (Nəhl, 16/125)*** *Uca Allah Peyğəmbəri Məhəmmədə (sallallahu əleyhi və səlləm) insanları Allahın yoluna hikmətlə dəvət etməsini əmr edir. Hikmət – ona nazil olmuş Quran və Sünnədir. Gözəl öyüd-nəsihət isə onların içində olan və hər ikisini baş verəcək yanlışlıqlardan uzaqlaşıracaq nəsihətlərdir.*

*9. Yenə də Uca Allah:* ***"…Onlarla ən gözəl surətdə mübahisə et! …" (Nəhl, 16/125)*** *– deyə buyurur. Yəni onlardan hər hansı biri ilə mübahisə və ya mübarizə etmək ehtiyacı varsa, bunu gözəl üsul olan şirin dillə, mehribanlıqla, əqli səviyyələrinə müvafiq şəkildə apar. Uca Allahın bu buyruğunda olduğu kimi:* ***"Kitab əhlinin zülm***

---

Σ87 *Quranla, tutarlı dəlillərlə* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 337-338)

Σ88 *Allah yolunda olan bütün əzab-əziyyətə* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 338)

***edənləri istisna olmaqla, onlarla ən gözəl tərzdə mücadilə edin!.." (Ənkəbud, 29/46)***

*Uca Allah Peyğəmbərə (sallallahu əleyhi və səlləm) yumşaqlıqla davranmasını əmr edir. Belə ki, Musa və Harunu (əleyhissəlamları) Fironun yanına göndərəndə də onlara eyni buyruğu vermişdi:* ***"Onunla yumşaq danışın. Bəlkə, öyüd-nəsihət qəbul etsin, yaxud qorxsun!" (Taha, 20/44)***

## *Şirkin yer üzündə fəsad törətməkdə əlaqəsi*

*Uca Allah belə buyurur:*

***"Yer üzü düzəldikdən sonra, orada fəsad törətməyin…" (Əraf, 7/56)***

*Təfsirçilərin bir çoxu belə deyib: Uca Allah yer üzünü peyğəmbərlər göndərməklə, şəriəti onların vasitəsilə izah etməklə, Allaha itaətə çağırmaqla islah edərkən siz orada günahlar törətməklə, Allahdan başqasına itaət etməyə çağırmaqla fəsad törətməyin. Çünki Allahdan başqasına itaət etmək, Ondan başqasını çağırmaq və Ona şərik qoşmaq yer üzündəki fəsadın ən böyüyüdür. Hətta, əslində yer üzündəki fəsad, ancaq Ona şərik qoşmaqdır, Onun əmrinə qarşı çıxmaqdır. Uca Allah belə buyurur:*

***"İnsanların öz əlləri ilə etdikləri üzündən quruda və suda fəsad əmələ gələr…" (Rum, 30/41)***

*Xülasə şəklində desək, şirk Allahdan başqasına dəvət etmək, Ondan başqa bir məbud göstərmək, Peyğəmbərdən (sallallahu əleyhi və səlləm) başqasına itaət edilən və tabe olunan kimsələr göstərmək yer üzündə ən böyük fəsaddır. Yer üzünün və orada yaşayanların düzəlməsi ancaq və təkcə Allahın məbud kimi qəbul edilməsi, başqasına deyil, yalnız Ona ibadətə dəvət olunması, başqasına deyil, təkcə Allahın Peyğəmbərinə (sallallahu əleyhi və səlləm) itaət edilərək, ona tabe olunması ilə mümkündür. Peyğəmbərdən başqa şəxslərə gəlincə, onlar ancaq Məhəmməd Peyğəmbərə (sallallahu əleyhi və səlləm) itaət göstərməyi əmr etdikləri təqdirdə onlara itaət etmək lazımdır. Əgər kimsə Peyğəmbərə (sallallahu əleyhi və səlləm) qarşı çıxan və onun gətirdiyi şəriətə zidd olan şeyləri əmr edərsə, beləsinin itaət edilmək haqqı yoxdur. Şübhəsiz ki, Allah yer üzünü, Peyğəmbəri (sallallahu əleyhi və səlləm) və dini ilə tövhid olunmasını əmr*

*etməklə islah etmiş, Ona şərik qoşmaq və Peyğəmbərinə (sallallahu əleyhi və səlləm) qarşı çıxmaq vasitəsilə orada fəsad törətməyi qadağan etmişdir.*

*Dünyada mövcud şərait haqqında diqqətlə fikirləşən hər bir insan yer üzündəki hər hansı tərəqqinin səbəbinin Allahın tövhidinin – təkcə Ona ibadətin və Peyğəmbərinə (sallallahu əleyhi və səlləm) itaətin olduğunu, yer üzündəki hər bir pislik, fitnə-fəsad, qıtlıq, düşmən əlinə keçmə və daha başqa pisliklərin də səbəbinin Allahın Peyğəmbərinə (sallallahu əleyhi və səlləm) qarşı çıxmaq, Allahdan və Peyğəmbərindən başqasına dəvət etməyin olduğunu görəcəkdir. (Bax: İbn Qeyyim, ət-Təfsirul Qeyyim, səh. 255)*

## *Allahdan başqasını Allah kimi sevmək şirkdir*

*Uca Allah buyurur ki:*

***"İnanların içərisində Allahdan qeyrilərini** [Allaha] **şərik qoşub, onları Allahı sevən kimi sevənlər də vardır. Halbuki iman gətirənlərin Allaha məhəbbəti daha qüvvətlidir…" (Bəqərə, 2/165)***

*İbn Qeyyim deyib ki: "Uca Allah bu barədə belə xəbər verir: Kimsə Uca Allahı sevdiyi kimi bir başqa şeyi sevərsə, o, Allahdan kənarda Allaha tay tutanlardandır. Bu, yaradılış və rübubiyyət baxımından deyil, məhz sevgidə tay tutulmasıdır. Yer üzündə yaşayan heç bir kəs yaratmaqda və rübubiyyətdə Allaha tay qoşmamışdır. Lakin məhəbbətdə şərik qoşmaq belə deyil. Yer üzündəkilərin əksəriyyəti Allahdan kənarda bir sıra varlıqları sevgi və təzim məsələlərində Ona şərik etmişlər.*

*Uca Allahın: **"… onları Allahı sevən kimi sevənlər…"** buyruğu Allahı sevdikləri kimi onları da sevərlər deməkdir. Bu isə, bilavasitə Allaha yönəldilməli olan məhəbbətin*

*Allahdan qeyrisinə ünvanlanmasıdır. Beləəri öz sevgilərində Allahla bərabər başqalarını da Ona tay etmişlər.*

*Daha sonra Uca Allah:* ***"… Halbuki iman gətirənlərin Allaha məhəbbəti daha qüvvətlidir…"*** *– deyə buyurur.*

*Yəni, iman gətirənlərin Allaha olan məhəbbəti, şərik qoşanların şərik qoşduqları varlıqlara – Allahdan başqa sevdikləri və təzim etdikləri tanrıçalarına bəslədikləri sevgidən qat-qat güclüdür".*

*Şeyxülislam İbn Teymiyyə aşağıdakı sözləri ilə bu təfsiri bəyəndiyini belə bildirir:*

*Bunların məzəmmət edilmələrinin səbəbi Allaha şərik qoşduqları varlıqları sevgidə Allaha şərik etmələri və möminlərin etdiyi tərzdə, sevgilərini Allaha olduğu kimi verməmələridir. Bax, sevgidə belə şərik qoşma Uca Allahın, onların od içində olarkən nə deyəcəklərinə xəbər verdiyi aşağıdakı buyruğunda da toxunmuşdur. Onlar od içində yanarkən öz tanrıçalarına və şərik qoşduqları varlıqlara, şərik qoşulan varlıqlar da onlarla birlikdə odda hazır edildikləri zaman belə deyəcəklər:*

***"Allaha and olsun ki, biz*** *[haqq yoldan]* ***açıq-aydın azmışdıq! Çünki biz sizi*** *[siz bütləri]* ***aləmlərin Rəbbi ilə bərabər tuturduq" (Şura, 26/97-98)***

*Məlum olduğu kimi, onlar, yaratmaq və rübubiyyət baxımından, ortaqlarını aləmlərin rəbbinə şərik qoşmurdular. Onlar ancaq sevgi və təzimlə bağlı olduqda o varlıqları Ona şərik etmişdilər (Bax: İbn Qeyyim, Mədaricus-Salikin, III, 13-14)*

*Qeyd etməliyəm ki, sufilər arasında olan bəzi müsəlanlar Allahı sevdikləri kimi, şeyxlərini də sevir və ona təzim edirlər. Onlar bu vəziyyətləri ilə birinci kərim ayədə (Bəqərə, 2/165 –red.) Allahın məzəmmət etdiyi müşriklərə bənzəyirlər. Onlardan olan müsəlmanlar da, təəssüflər olsun*

*ki, Allaha dua etdikləri kimi, övliya qəbul etdikləri şəxslərə də dua edirlər. Bunlar belə etməklə duada onlarla Allahı bərabərləşdirmiş olurlar. Bu isə, Allahdan qeyrisi üçün icra edilməsinə icazə verilməyən ibadət növlərindəndir. Bu vəziyyətdə son kərim ayə onlara uyğundur. Hədisdə də deyilir ki: "Dua ibadətin lap özüdür" (Tirmizi rəvayət edərək, onu yaxşı və səhih adlandırmışdır) – deyə buyrulur.*

*Sufilər arasında bəzi (Qərbi Dəməşqdə olan İbn Ərəbi kimi) şəxslər Allahla yaratdıqlarını eyniləşdirirlər. O belə deyir:*

***"Rəb quldur, qul da Rəbdir.***

***Hayıf ki, bilmirəm cavabdeh kimdir?"***

*Uca Allah onların söylədiklərindən daha uca və pakdır.*

## *Allah göydədir və ərşin üstündədir*

*Uca Allah buyurur ki:*

***"Göylərdə də, yerdə də*[Σ89] *yalnız O Allahdır! Sizin gizlində də, aşkarda da nəyiniz varsa, tutduğunuz* [bütün] *əməlləri bilir" (Ənam, 6/3)***

*Bir çox müsəlmanlardan: "Allah haradadır?" soruşularsa, o sizə "hər yerdə" – deyə cavab verəcək, sonra isə bu ayəni və ya bir başqasını dəlil gətirəcəkdir. Əgər bu müsəlman həmin ayələrin düzgün təfsirini bilsəydi, xətalı cavabında onları dəlil kimi göstərməzdi.*

*İbn Kəsir deyir ki, bu ayəni təfsir edənlər onu: "O hər yerdədir" kimi yozan və həmdə (azmış bir təriqət olan)*

---

[Σ89] *İbadətə layiq olan* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 210)

*cəhmiyyəçilərin (Uca Allah onların dediklərindən çox yüksəkdir) baxışlarını rədd etmək üzrə həmrəy olmaqla bərabər bu kərim ayənin təfsirində müxtəlif nəzər nöqtələrinin sahibi olmuşlar.*

*1. Belə nəzər nöqtələrindən ən mötəbər olanı budur: O, göylərdə də, yerdə də Ona dua ediləndir. Yəni, göylərdə və yerdə olanlar Ona ibadət edir, Onu tək sayırlar. Göylərdə və yerdə olan kimsələr Onun üluhiyyətini qəbul edir, Onu Allah adlandırır, qorxu və ümidlə Ona dua edirlər (Cinlərdən və insanlardan olan kafirlər istisna olmaqla) Bu nəzər nöqtəsinə görə, bu kərim ayə Uca Allahın:* ***"Göydə də tanrı, yerdə də tanrı Odur…" (Zuxruf, 43/84)*** *buyruğuna bənzəyir. Belə ki, O, göydə olanların da, yerdə olanların da tanrısıdır. Buna görə də Uca Allahın: "Gizlinizi də, aşkarınızı da bilir" buyruğu xəbərdarlıq və yaxud da vəziyyətə işarədir (Vəziyyətlə bağlılığına görə, "göylərdə də, yerdə də Allah olan, gizlinizi də, aşkarınızı da bilən Odur" demək olar)*

*2. İkinci bir nəzər nöqtəsinə görə həmin buyuruqdan məqsəd budur: O, göylərdə və yerdə olan gizli, aşkar hər şeyi bilən Allahdır. Buna görə "bilir" buyruğu "göylərdə də, yerdə də" buyruğuna aiddir və izahı belədir: O, Allahdır, göylərdə və yerdə gizlətdiyinizi də, aşkarınızı da və nə qazanacağınızı da bilir.*

*3. Üçüncü nəzər nöqtəsinə görə "göylərdə Allah Odur" ifadəsindəki buyruq üstündə tam bir vəqf (qiraətin dayandırılması – red.) vardır. Daha sonra Uca Allah xəbər cümləsi ilə sözə başlayaraq belə buyurur: "Yerdə də sizin gizlətdiyinizi və aşkarınızı bilir". İbn Cəririn bəyəndiyi budur. Buna görə "O, nə qazandığınızı da bilir" buyruğu, xeyr və şər olan bütün əməllərinizi bilir deməkdir (Bax: İbn Kəsir, 2/123)*

*4. Uca Allahın: "Harada olsanız da O sizinlə bərabərdir" buyruğuna gəlincə, İbn Kəsir bu ayəni aşağıdakı şəkildə təfsir edir: "O, sizi görüb müşahidə edən,*

*əməllərinizə şahid olandır. Quruda da, dənizdə də, gecə də, gündüz də, evlərin içində də və ya açıqda olun. Bilmək baxımından, bunların hamısı Onun üçün birdir. O, hər yerdə olanı görür və eşidir. Buna görə də sizin danışığınızı eşidir, olduğunuz yeri görür, gizli saxladığınızı və pıçıldaşmağınızı da bilir" (IV, 304)*

*5. Allah hər yerdədir deyərkən Onun bizimlə bir yerdə olması, bizi eşitməsi və görməsi mənası nəzərdə tutulursa, bu, doğrudur. Əgər, "O zatıyla hər yerdədir" deyilirsə, bu böyük bir yanlışlıqdır. Çünki hamamlar və zibilliklər kimi nəcis və natəmiz olan pis yerlər də vardır. Ağlı başında olan bir müsəlman Allah oradadır deməz. Şan-şöhrəti uca olan Allah bunlardan uzaq və pakdır.*

*Bəzi müsəlmanlar belə deyirlər: Allah mömin qulunun qəlbindədir. Bunu söləyərkən əsli olmayan bir hədisə əsaslanırlar: "Mən səmaya da, yerə də sığmadım. Mən mömin qulumun qəlbinə sığdım". Allahın (Allah göstərməsin!) insanların qəlbinə girməsini söyləyən bir kimsə, bunu təkcə İsa məsih üçün öngörən xristianlardan da kafirdir.*

*Doğrusu isə Uca Allahın səmanın üzərində, ərşin üstündə olmasıdır. Buna dəlil aşağıdakı buyruqlardır:*

*a. Uca Allah belə buyurur: **"Sonra səmaya istiva etdi" (Bəqərə, 2/29)**[Σ90]. Buxaridə əksini tapmış Mücahid və Əbul-Aliyənin təfsirinə görə ayədəki istiva sözü "üstünə çıxdı və yüksəldi" mənasını verir.*

*b. Peyğəmbər (sallallahu əleyhi və səlləm) bir cariyədən: "Allah haradadır?" soruşduqda, o: "Göydədir" cavabını vermişdir. Peyğəmbər (sallallahu əleyhi və səlləm) ondan: "Mən kiməm?" – deyə soruşduqda, cariyə: "Allahın Rəsulu Məhəmməd" cavabını vermişdir. Buna görə*

---

[Σ90] Bu ayə kitabın türk nəşrindən birbaşa tərcümə edilmişdir.

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) cariyənin sahibinə: "Onu azad et, çünki o mömindir" – deyə buyurmuşdur (Muslim)*

*Hədisə görə: Allahın səmada olduğuna inanmayan kimsənin mömin olmadığı aydınlaşır. "Səmada" olması isə səmanın üstündə olması deməkdir.*

*Uca Allahın səmanın üstündə olmasına inanmaq əshabələrin, tabeinlərin, müctəhid imamların və onların ardıcıllarının etiqadıdır.*

*1. Şəfii deyib ki, şübhəsiz ki, Uca Allah səması üstündə, ərşinin üzərindədir. O, qullarına istədiyi formada yaxınlaşır və şübhəsiz ki, Allah dünya səmasına necə istəsə, eləcə də enər (Bunu əl-Həkəvi, Əqidətuş-Şəfiidə rəvayət edir)*

*2. Əbu Hənifə deyib ki, bir kimsə, "mən, Rəbbim səmadadırmı, yerdədirmi bilmirəm" deyərsə kafir olar. Çünki Uca Allah:* **"Rəhman ərşə istiva etdi"** *– deyə buyurur. Onun ərşi isə yeddi səmanın üstündədir. Əgər: O, ərşin üzərindədir deməklə bərabər, "mən, ərş səmadamıdır, yoxsa yerdəmidir, bilmirəm" deyilərsə, yenə də həmin şəxs kafirdir. Çünki Allahın səmanın üstündə olduğunu inkar etmiş olur. Allahın səmanın üstündə olduğunu inkar edən isə kafir olur. Çünki Uca Allah ucalar ucasıdır və Ona yuxarıya doğru üz tutaraq dua edilir, aşağıya üz tutaraq dua edilmir (Şərhul-Əqidətit-Təhaviyə, səh. 322)*

*3. İmam Malikə Allahın ərşi üstə necə istiva etdiyinə dair sual verildikdə bu cavabı vermişdir: "İstiva məlum bir sözdür, mahiyyəti – necəliyi isə bilinmir. Ona iman gətirmək vacib, (istivanın mahiyyətinə) dair sual vermək isə bidətdir. Bu bidətçini bayıra atın".*

# *Qorxu və ümid*

*Uca Allah buyurur ki:*

***"…Ona həm qorxu, həm də ümidlə dua edin…" (Əraf, 7/56)***

*Uca Allah qullarına onların yaradıcısı və məbuduna Onun cəhənnəmindən və əzabından qorxaraq, cənnətinə və nemətlərinə ümidlə dua etmələrini buyurmuşdur. Beləliklə, Hicr surəsində:*

***"Qullarıma xəbər ver ki, Mən, həqiqətən, bağışlayanam, rəhm edənəm! Eyni zamanda əzabım da çox şiddətli əzabdır!" (Hicr, 15/49-50)*** [Σ91]*. Məhz Allahdan*

---

[Σ91] İmam ən-Nəvəvinin "40 hədis" adlı kitabında ("İmam ən-Nəvəvinin 40 hədisi", rus dilində, M, 2001, 2-ci nəşr) Uca Allahın bağışlama sifətinə geniş bir fəsil həsr edilmişdir. Mövzunun bu hissəsinə aidiyyətini nəzərə alaraq ondan bir sıra nümunələri, Uca Allahın rizası ilə, burada veririk. İmam ən-Nəvəvi qeyd edir ki: "Ənəs (Allah ondan razı olsun) demişdir:

*«Mən eşitmişəm ki, Allahın Rəsulu* (Ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), *buyurub:*

*«Uca Allah demişdir**: «Ey Adəm oğlu, həqiqətən, Mən, etdiklərinə*** (günahlarına) ***baxmayaraq, Mənə dua ilə ibadət edəcəyin və Mənə tapınacağın günədək səni bağışlayacağam! Ey Adəm oğlu, əgər sən səma buludlarına çatan qədər günahlar işlətsən və sonra Məndən bağışlanmanı diləsən, Mən səni bağışlayaram! Ey Adəm oğlu, həqiqətən, əgər sən, az qala bütün yeri (doldura bilən) günahlarla Mənim yanıma gəlsən və Mənimlə bərabər heç nəyə ibadət etmədən Mənlə görüşsən, Mən hökmən sənə bağışlanma əta edərəm və o*** (bütün günahlarını örtər)***!»*** **Ət-Tirmizi və əd-Darimi** rəvayət etmişlər.

Peyğəmbərin (sallallahu əleyhi və səlləm) bütün sünnələrinin məcmusu olan hədislərin hamısından bu hədis daha çox ümid verir, çünki onda Uca Allahın olduqca çox şeyləri bağışlaya biləcəyindən bəhs edilir. Bu ona görə edilir ki, çoxsaylı günahlar törədən şəxslər Allahın onları bağışlayacağına ümidlərini itirməsinlər. Digər tərəfdən, heç kim bununla özünü aldatmamalı və günahların girdabına atılmamalıdır; elə ola bilər ki, bu günahlar insanı büsbütün özünə tabe edərək, Allahın bağışlaması haqqını qazanmağa imkan verməsin (Fəslin mətni rus dilindən tərəfimizdən tərcümə edilmişdir) ( Σ)

*qoxması qulu Allaha qarşı çıxmaqdan və Onun qadağan etdiyi şeylərdən uzaqlaşmağa sövq edər, Onun Cənnəti və mərhəmətinə ümid etməklə sağlam işlər görməyə, Rəbbini razı salacaq hər hansı bir əməli yerinə yetirməyə yönəldər.*

***Bu ayənin göstərdiyi yol***

*1. Qul, onu yaradan Allahına dua etməlidir. Onun duasını eşidən və qəbul edən Odur.*

*2. Allahdan qeyrisinə dua etməməlidir. Hətta, bu qeyrisi lap peyğəmbər, övliya və ya mələk olsa belə. Çünki, dua namaz kimi bir ibadətdir və onun Allahdan başqasına yönəldilməsi yolverilməzdir.*

*3. Qul Rəbbinə cəhənnəm odundan qorxaraq və cənnətinə ümid edərək dua etməlidir.*

*4. Kərim ayə ilə Allaha ondan qorxaraq və yaxud Onun nemətlərinə ümid edərək ibadət etmədiklərini deyən sufilərin baxışları rədd edilir. Çünki qorxu və ümid ibadətin növlərindəndir. Uca Allah insanların ən seçilmişləri olan peyğəmbərləri tərifləyərkən belə buyurur:*

***"…Onlar xeyirli işlər görməyə tələsər, ümid və qorxu ilə Bizə ibadət edirdilər. Onlar Bizə müti idilər" (Ənbiya, 21/90)***

*5. Kərim ayədə "əməllər ancaq niyyətlərlədir" hədisini "əl-Ərbəin ən-Nəvəvi" (Nəvəvinin 40 hədisi – red.) adlı əsərində açıqlayarkən Nəvəvinin istifadə etdiyi aşağıdakı ifadələri də rədd edilir:*

*Əməllə bərabər niyyətdə də olduğu təqdirdə üç hal yaranır:*

*birinci, Uca Allahdan qorxaraq belə əməli etmək. Bu sadiq qulların ibadətidir;*

*ikinci, bu əməli cənnətə və savaba görə etməsidir. Bu da tacirlərin ibadətidir;*

*üçüncü isə, bunu Allahdan utanaraq, qulluq haqqını və şükrü ödəmək üçün edilir. Bu da azad insanların ibadətidir.*

*Şeyx Məhəmməd Rəşid Rıza bu sözlərlə bağlı olaraq "Məcmuətul-hədis ən-Nəcdiyyə" adlı əsərdə bunları söyləyir:*

*Belə bir tərzdə qisimlərə ayırmaq hədis alimlərinin sözlərindən daha çox sufilərin sözlərinə oxşayır. Tədqiqatın nəticəsi budur ki, kamillik – onun "qulların ibadəti" adını verdiyi (hamımız Allahın qullarıyıq) qorxu ilə, "tacirlərin ibadəti" adlandırdığı Allahın savabına və lütfkarlığına ümidin bir yerdə olmasıdır.*

*Şeyx Mutəvalli əş-Şəravi də kitablarında sufilərin əqidəsini mənimsəmişdir. Çünki o sözü keçən bir hissəni qeyd etməklə, hətta* ***"…və Rəbbinə etdiyi ibadətə heç kəsi şərik qoşmasın!" (Kəhf, 18/110)*** *buyruğunu öz rəyi ilə açıqlayarkən daha qabağa gedərək: "Cənnət də bu şərik qoşulan şeylərdən biridir" deyir (və bu sözləri ilə Uca Allaha qarşı, cənnətini arzulayaraq ibadət etməyin şirk olduğunu çərənləyir)*

*Şəravi "əl-Muxtar min Təfsiril-Quranil-Azim" adlı əsərində də bunları bildirir:*

*Üçüncü növ – Uca Allaha ibadət etməyə layiq olduğu üçün ibadət etməkdir. Buna isə bu qüdsi hədisi dəlil göstərir: "Əgər mən cənnət və ya cəhənnəmi yaratmamış olsaydım ibadətə layiq olmayacaqdımmı?" (II, 25)*

*Şəravi bu hədisin səhihliyinə toxunmur. Lakin göründüyü kimi bu hədis uydurmadır. Çünki Qurana ziddir. Kitabında bəhs etdiyi bu şərh onun televiziya ekranlarında kərim ayəni təfsir edərkən söylədiyi "cənnət də bu şərik qoşulan şeylərdən biridir" ifadəsini müdafiə edir.*

*Kim desə ki, Şəravi bu sözləri ilə "cənnətə ibadət edən Allaha şərik qoşur" demək istəmişdir, deyirsə, ona belə cavab veririk: "Dünyada "mən cənnətə ibadət edirəm" deyən heç bir kimsə yoxdur. Lakin Şəravinin bu təfsiri onun kitablarında mənimsədiyi sufi əqidəsini örtüb gizlətmək üçündür. Sufilər deyirlər ki, biz təkcə Allaha ibadət edirik. Cənnətinə ümid etmir və ya cəhənnəmindən qorxmuruq.*

## *Allah göylərin və yerin nurudur*

*Uca Allah buyurur ki:*

***"Allah göylərin və yerin nurudur*[Σ92]*. Onun nuru içində çıraq olan bir taxçaya bənzər; taxçadakı o çıraq bir qəndilin içindədir, o qəndil isə sanki parlaq bir ulduzdur. O çıraq nə şərqdə, nə də qərbdə olan*[Σ93] *mübarək bir zeytun ağacından yandırılır. Onun yağı özünə od toxunmasa da, sanki işıq saçır. O, nur üstündə nurdur. Allah dilədiyini öz nuruna qovuşdurur*[Σ94]*. Allah insanlar üçün misallar çəkir. Allah hər şeyi biləndir!" (Nur, 24/35)***

*1. İbn Qeyyim Uca Allahın: **"Allah göylərin və yerin nurudur…"** buyruğunu göyləri və yeri nurlandıran, göylərdə və yerdə olanlara doğru yol göstərən kimi təfsir etmişdir. Onun nuru ilə göylərdə və yerdə olanlar doğru yol tapır. Bu, Onun gördüyü işdir (felidir – red.), əks halda nur Onun Özü ilə bir olan sifətlərindəndir. Allahın gözəl adlarından biri olan ən-Nur adı da buradan Ona verilmişdir (İbn Qeyyim, İləmul-Muvaqqin, I, 185)*

---

[Σ92] *Kainatı yaradıb ona nur verən, yer və göy əhlinə haqq yolu göstərən xaliqdir* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 412)

[Σ93] *Yəni bu, yer yox, göy ağacıdır* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 80)

[Σ94] *Allah istədiyinə öz nurunu bəxş edib cənnət yolu olan islam dininə yönəldir* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 412)

*Uca Allah bu nura, onun olduğu yerə, onu daşıyana və onun maddəsinə qəndil oyuğunu*[Σ95] *nümunə göstərmişdir. Bu isə evin divarının içində düzəldilmiş oyuq formasında xüsusi bir yerdir. Bir tərəfdən köksə bənzəyir. Bu qəndil oyuğunda (taxçada) ən şəffaf şüşədən düzəldilmiş pəncərə vardır. Şəffaflığından və ap-aydın olmasından par-par parıldayan ulduza bənzədilmişdir. Bu da qəlbə bənzəyir. Qəlb isə şüşəyə bənzədilmişdir. Çünki bu şüşə möminin qəlbində olan bir sıra keyfiyyətləri özündə cəmləşdirmişdir. Bunlar təmizlik, incəlik və mətanətlilikdir. O, təmiz və bulanıqsızlığı ilə haqqı və doğru yolu görür. İncəxasiyyətliliyinə görə başqalarının halına yanması, rəhmliliyi və şəfqətli olması bilinər. Mətanəti ilə isə Uca Allahın düşmənlərinə qarşı mübarizə edir, onlarla sərt davranır, haqlı olduğu işdə mətinlik göstərir, mətanətliliyini itirmir. Ona məxsus olan keyfiyyətlər bir-birini inkar etmədiyi kimi, ona mane də olmazlar. Əksinə, Uca Allah möminlərə keyfiyyət bəxş edərkən, aşağıdakı buyruğunda olduğu kimi, onların hər biri digərinə kömək göstərərək onu müdafiə edir:*

***"…onlar kafirlərə qarşı sərt, bir-birinə isə mərhəmətlidirlər…" (Fəth, 48/29)***

*Şüşənin içərisində bir qəndil vardır. Bu ad fitildə olan işığa verilir və onu daşıyır. Bu nurun bir maddəsi var ki, o, günün başlanğıcında və sonunda ən münbit günəşli yerlərdə bitən bir zeytundan sıxılıb çıxarılmış yağdır. Zeytun yağların ən təmizi və törtöküntüsü olmayanıdır. Saflığı və təmizliyi üzündən ona od deyilməsə də, işıq saçandır. Bax, qəndilin işıqlılığının mənbəyi də budur.*

*Möminin qəlbindəki qəndilin işığını saxlayan mənbə də belədir. O, bərəkəti hər şeydən daha böyük və*

---

[Σ95] ***Qəndil oyuğu*** – taxça (20-ci əsrin ortalarınadək Azərbaycan evlərində daha çox paltar boxçaları və ya qab-qacaq qoyulması üçün nəzərdə tutulardı)

*azmaqdan ən uzaq olan vəhy ağacındandır. Bu ağac ən mülayim, ən mütənasib və ən kamil xüsusiyyətləri özündə təmsil edir. Xristianlığın da, yəhudilin də yolundan azması kimi hallara səbəb olmur. Əksinə, o, hər sahədə pislənən iki qütbün ortasındadır. Bu zeytun yağı son dərəcə təmiz və şəffaf olduğundan və öz-özündən işıq saçan haldaykən, ona od təsir etdikcə işıqlığı artır və ondakı işıq saçan maddə güclənir və nəticədə isə, o, nur üstündə nur olur.*

*Bax, mömin də belədir. Onun qəlbi işıqlıdır. Ətrafı da işıqlandırır. O, istənilən anda ilahi təbiəti və ağlı ilə haqqı tanıya biləcək vəziyyətdədir, lakin şəxsən özündən gələn bir maddəsi yoxdur. Bundan ötrü vəhy cövhəri nazil olaraq onun qəlbinə girmişdir. Beləliklə vəhy sahəsində Uca Allahın yaradarkən fitri olaraq ona verdiyi nurun üstünə nur vəhylə artırılır. Bunun nəticəsində o fitrətin nuruna əlavə olaraq vəhy nuru da əldə edir.*

*Məhz ağıllı bir kəs bu çox böyük ayə və bu ayənin belə yüksək mənalara müvafiqliyi üzərində düşünməlidir. Uca Allah göylərdə və yerdə nurunu, mömin qullarının qəlbindəki nurunu, yəni, bəsirət və qəlb deyə ad qazanmış ağlı nur ilə uca və alt aləmin hər tərəfinin özüylə işıqlandırdığı gözlə görülən maddi nuru gerçəkləşdirir. Bunların hər ikisi çox qüdrətli nur mənbələridir, biri digərindən daha böyükdür.*

*Bunlardan hər hansı biri bir yerdə olmazsa və yaxud bir məkanda yerləşməzsə, orada bir insan və yaxud bir başqa varlıq yaşaya bilməz. Çünki canlı varlıqlar nurun (işığın) olduğu yerdə olurlar. İşığın doğmadığı qaranlıq yerlərdə isə canlı nə yaşaya, nə də ola bilməz.*

*Beləliklə, vəhy və iman nurunun olmadığı bir millət də eynilə və labüd olaraq ölü bir millətdir. Belə bir nurun olmadığı qəlb də qəti demək olar ki, ölü bir qəlbdir. Onda həyat nişanəsi görünməz. Necə ki, belə işıqlığın olmadığı bir*

*yerdə yaşayan bir canlının tapılması mümkün deyil (Bax: İbn Qeyyim, ət-Təfsirul-Qeyyim, səh. 374; əl-Vabilus-Sayyib, səh. 736)*

*2. Təbəri Uca Allahın:* **"Allah dilədiyini öz nuruna qovuşdurur"** *buyruğunu belə açıqlayır:*

*Allah Quran adlandırdığı Öz nurunun ardıyca getməyi istədiyi quluna nail edir.*

**" Allah insanlar üçün misallar çəkir"** *buyruğu da o deməkdir ki, Allah bu Qurani Kərimdə insanlara möminin qəlbində şüşə içindəki qəndili və bu ayədəki digər misalları göstərdiyi kimi, digər misallar da çəkir və bənzətmələr yaradır.*

**"Allah hər şeyi biləndir!"** *Allah bu və buna oxşar başqa misallar çəkərkən elm sahibi kimi davranır (Bax: Təbəri, VIII, 143)*

**Ayədən çıxarılan nəticələr**

*1. Uca Allah möminə işıqlığında doğru yol tapacağı bir nur yaratmışdır.*

*2. Allah istədiyi qulunu imana çatdırar.*

*3. Bu doğru yol ilahi müvəffəqiyyətinin təzahür etdiyi doğru yoldur.*

*4. İlahi müvəffəqiyyətinin təzahür etdiyi doğru yol Allahın əlindədir, ona başqa bir kimsənin gücü çatmaz.*

*5. Anladılması istənilən məsələlərin daha yaxşı başa düşülüb qavranılması üçün misallar çəkmək gözəl bir işdir.*

*6. ən-Nur Uca Allahın adlarındandır.*

*7. Nur iki cürdür. Biri günəş işığı kimi maddi işıqdır ki, insan, heyvan və bitkilər onsuz yaşaya bilməz; digəri isə*

*mənəvi nurdur ki, bu da Uca Allahın nur adını verdiyi Qurani Kərimdir. Gözəl həyat arzulayan kimsə onsuz yaşaya bilməz.*

*8. Uca Allahın yaratdığı günəşin maddi nuru şüalarını saçmağa başladığı anda qəndillərin, şamların işığı onunla müqayisəyə gəlməz. Eyni qaydada da Uca Allahın qulları üçün nazil etmiş olduğu İslam nuru, mənəvi işıq kimi, hər tərəfi işıqlandırmağa başladıqda, ona qarşı çıxan hər cür sistemlərin aradan çıxması labüddür. Bunların sırasına laiqilik*[Σ96]*, masonçuluq, kapitalizm, kommunizm və bir sıra başqa, insan tərəfindən yaradılmış, sistemlər də daxildir. Kommunizm sona çatdı, aradan çıxdı. Uca Allahın icazəsiylə İslama qarşı çıxan digər sistemlər də yox olacaqlar. Şairin bu beytləri nə qədər doğrudur:*

*"Allahu Əkbər! Məhəmmədin dini və kitabı*

*Ən güclüdür, sözü ən doğrudur,*

*Onun yanında danışılmaz digər kitablardan,*

*Çünki səhər açılmışdır, qəndilləri söndürün".*

## *Əcəl haqqında təsbit edilənlər və silinənlər*

*Uca Allah buyurur ki:*

---

[Σ96] ***Laiq*** – keçmişdə "ilahi təbəqədən olmayan insan" kimi işlədilirdi. ***Laiqilik*** – din ilə dünya işlərini ayırmaq. Vicdan azadlığı prinsipinə görə, dinsizlərə və günahkarlara baş qoşulmadığı kimi, dindarlara da toxunmamaq müddəasına dövlət yanaşması, dindən kənarlıq (Bax: Ömer Sevincgül, "Özel lüğat", İstanbul, 2003, ZAFER yayınları, 1-ci nəşr, səh. 464)

***"Allah [həmin kitabdan] istədiyi şeyi məhv edər, istədiyini də sabit saxlayar[Σ97]. Kitabın əsli [lövhi-məfhuz] Onun yanındadır" (Rəd, 13/39)***

*Təbəri deyir ki, bu ayənin şərh edilməsi haqqında söylənilmiş nəzər nöqtələrinin ən uyğunu və doğruya ən yaxın olanı bizim əl-Həsən və Mücahidin nəql etdiyimiz baxışlarıdır. Buna görə müşriklər Uca Allahın Peyğəmbərindən (sallallahu əleyhi və səlləm) cəza ilə bağlı əlamətləri və onlarla qorxudulmanın yerinə yetirilməsini ondan istədilər. Uca Allah da onlara:* ***"…Allahın izni olmadıqca heç bir peyğəmbər heç bir möcüzə gətirə bilməz…" (Rəd, 13/38)*** *– deyə buyurdu. Bununla Uca Allah onlara barələrindəki qəza və hökmünün bir kitabda təsbit edilmiş öz vaxtı olduğunu bildirir. Beləcə, onlar bu vaxtın gəlib çatacağına qədər ləngidilirlər. Daha sonra onlara belə buyurur: "Beləcə, o vaxt gəlib çatan kimi, Uca Allah, əcəli çatmış, ruzisi bitmiş və ya həlak ediləsi anı gəlmiş və yaxud da yüksək vəzifədən aşağı salınmasının vaxtı çatmış və ya da ki, mal-mülkünün məhv edilməsi zamanı yetişmiş kimsələrin hökmlərini qərarlaşdırmağı təqdir edir. Bax bu "məhv etmədir". Əcəli, ruzisi və yeməyinin bitməməsini istədiyi kimsələri isə sabit saxlar, onları məhv etməz" (Bax: Təbəri, Camiul-Bəyan, XVI, 490, Mahmud Şakirin tədqiqatı)*

*Təbəri Uca Allahın:* ***Kitabın əsli*** *[lövhi-məfhuz]* ***Onun yanındadır"*** *buyruğu haqqında bunları söyləyir: Bu barədə ən doğru nəzər nöqtəsi: "Kitabın əsli və özü Onun yanındadır" deyənlərə məxsusdur. Çünki Uca Allah bu kitabı yada salmaqla və Onun istədiyini məhv edib, istədiyini isə sabit saxladığını xəbər verir və daha sonra ardıyca: "* ***Kitabın əsli*** *[lövhi-məfhuz]* ***Onun yanındadır"*** *– deyə buyurur. Beləliklə bunun aşağıdakı mənanı verdiyi aydın şəkildə üzə çıxır: Özü*

---

Σ97 *Bəndələrinə aid hər hansı bir hökmü ləğv edib başqası ilə dəyişər və ya onu olduğu kimi saxlayar* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 312-313)

*tərəfindən təsbit olunmuş və məhv edilənin əsli və özü Onun yanında olan bir Kitabdır (Təbəri, XVI, 498, Mahmud Şakirin tədqiqatı ilə)*

*Şeyxülislam İbn Teymiyə ayənin təfsirində bunları söyləyir:*

*Elm adamları deyirlər ki, məhv etmək və sabit saxlamaq mələklərin səhifələrindədir. Şan-şöhrətli Uca Allahın elmində isə dəyişiklik ola bilməz. Əvvəllər bilmədiyi bir məsələ mövcud deyil. Onun məhv etməsi və ya sabit saxlaması elmi haqqında digər vasitələrlə bilmək müzakirə mövzusu deyil.*

*Lövhi-məfhuzda məhv etmək və sabit saxlamaq məsələsi varmı? Bu barədə iki nəzər nöqtəsi mövcuddur. Doğrusunu isə, ən yaxşı bilən Uca Allahdır (Bax: Fətava, XIV, 492)*

*Elm adamlarının bu təfsiri, həmin ayəni şaban ayının ortasında (bəraət gecəsində) "Uca Allah istədiyini məhv edər, istədiyini sabit saxlar" iddiası ilə oxuyan bidətçilərin baxışlarını rədd edir.*

## *Ömürdə artma və azalma*

*Uca Allah buyurur ki:*

***"…Ömür sahibi olan birinin uzun ömür sürməsi də, onun ömrünün qısaldılması da ancaq kitabda [****lövhi-məfhuzda****] yazılmışdır…" (Fatir, 35/11)***

*Şeyxülislam İbn Teymiyə deyir ki, burada nəzərdə tutulan ömür verilənlər cinsinə işarədir. Yəni, ömür verilən hər bir insanla bərabər qısa ömürlü hər hansı başqa insanlar nəzərdə tutulur. Digər tərəfdən ömrün uzadılması (təmir) və qısaldılması (təqsir) ilə iki şey nəzərdə tutulur:*

*1. Əvvələn, birinin ömru uzun, bir başqasınınkı qısa olur. Bu halda ömrü qısa olanın ömrünün qısaldılması başqası ilə müqayisədə aşkarlanır. Beləliklə, uzun ömürlünün ömrünün uzun olması eynilə bu qaydadadır. Birisinin ömrü qısa gəldikdə, onun qısalığı başqasına nisbətən qısa olur. Eynilə, bir başqasının ömrünün uzun olması da başqasına nisbətən belə olduğu kimidir.*

*2. Yuxarıdakı qayda ilə, yazılıb təqdir edilmiş ömrün qısaldılması da nəzərdə tutula bilər. Bu da, eyni artımla yazılmış ömrün uzadılmasının nəzərdə tutulması kimidir. Buxari və Muslimdə Peyğəmbərin (sallallahu əleyhi və səlləm) belə buyurduğu rəvayət edilir:*

*"Ruzisinin artırılmasından, işinin (əcəlinin) gecikdirilməsindən xoşlanan bir kimsə qohumluq əlaqələrini kəsməsin".*

*Bəziləri söyləmişlər ki, yuxarıda deyilənlə ömürdəki bərəkət nəzərdə tutulur. İnsan qısa bir vaxt ərzində, başqasının uzun illər boyu edə bildiklrini əldə edir. Ruzi və əcəl (birdəfəlik) yazılmış və təsdiq edilmiş şeylərdir. Artırılması və azaldılması olmur deyirlər. Belələrinə cavab verilir ki: belə bərəkət və artım əməllərdədir. Fayda da eyni*

*tərzdə təsdiq edilmiş və yazılmışdır. Bunlar dolayısıyla hər şeyi əhatə edir.*

*Tədqiqat nəticələri kimi veriləcək cavab belədir: Allah qulu üçün mələklərin səhifələrində məlum bir əcəl*[Σ98] *yazır. O, qohumluq əlaqələrini kəsmədikdə, bu yazılanları artırır. Əgər əksiltməyi zəruri edəcək bir iş görərsə, orada yazılandan azaldılır. Bu anlamın bir bənzəri Tirmizi və digərlərində qeyd olunan Peyğəmbərin (sallallahu əleyhi və səlləm) aşağıdakı buyruğudur:*

*"Adəm Allahdan ona öz soyundan göndəriləcək peyğəmbərlərin surətini göstərməsini istədikdə, Allah onları ona göstərmişdir. Aralarında nur saçan bir adam gördü. Ya Rəbb, bu kimdir? – deyə soruşdu. Oğlun Davuddur – deyə cavabını verdi. Adəm soruşdu ki, onun ömrü neçə ildir? Allah: Qırx ildir buyurdu. Adəm: Bəs mənim ömrüm nə qədərdir? Allah: Min ildir buyurdu. Onda Adəm dedi: Mən ömrümdən altımış il ona bağışladım. Bununla əlaqədər bu məsələyə dair bir kitab (sənəd) yazıldı. Mələklər də buna şahidlik etdilər. Adəmin ölüm vaxtı gələndə: Mənim ömrümdən hələ altımış il qalıb dedi. Onlar: Sən altımış ili oğlun Davuda bağışlamışdın, dedilərsə də, o bunu inkar etdi. Buna görə o kitabı (sənədi) göstərdilər. Peyğəmbər (sallallahu əleyhi və səlləm) dedi ki: "Adəm də unutdu, onun unutmasına görə nəslindən törəyənlər də unutdular, Adəm inkar etdi, onun nəslindən törəyənlər də inkar etdilər" (Tirmizi, bəzi söz fərqlərilə, rəvayət etmiş, hədisi yaxşı və mötəbər adlandırmışdır) (Bax: Fətava, XIV, 490)*

## *Haqq yol birdir, sapdıracaq yollar çoxdur*

*Uca Allah belə buyurur:*

---

[Σ98] Ömür.

***"Bu, şübhəsiz ki, Mənim doğru yolumdur. Onu tutub gedin. Sizi*** *[Allahın]* ***yolundan sapdıracaq yollara uymayın.*** *[Allah]* ***sizə bunları tövsiyə etdi ki, pis əməllərdən çəkinəsiniz!" (Ənam, 6/153)***

*İbn Məsud demişdir ki: "Peyğəmbər (sallallahu əleyhi və səlləm) bizə əli ilə bir cizgi cızdı və sonra belə buyurdu: Bu, Allahın lap doğru yoludur. Sağına və soluna da bir sıra cizgilər çəkdi və buyurdu: Bax bu yolların hər birinin üstündə mütləq o yola çağıran bir şeytan var. Sonra da Uca Allahın:* ***"Bu, şübhəsiz ki, Mənim doğru yolumdur"*** *ayəsini oxudu" (Hədis səhihdir, Əhməd və Nəsai rəvayət etmişlər)*[R11]

*Göründüyü kimi, (ayə) "sirat" kəlməsi və "hədis"də səbil (ikisi də "yol" mənasındadır) sözü tək halda işlədilmişdir. Əvəzində Allahın yolunun əleyhinə olan digər yollar isə cəm halında verilmişdir. Çünki Allaha aparan yol birdir. Bu yol Onun peyğəmbərləri ilə göndərdiyi və kitabları ilə nazil etdiyi yoldur. Heç kim Ona bu yoldan qeyrisi ilə çata bilməz. İstəyirlərsə, qoy insanlar bütün yollarla getsinlər, hər bir qapını açsınlar. Gedəcəkləri bütün yollar çıxılmazdır, bütün qapılar qapalıdır. Ancaq Ona aparan tək bir yoldan gedilə bilər. Təkcə bu yolun sonu Allaha çatacaq, təkcə bu yol Allaha çatdıracaq:*

***"…Mənə görə, bu, düz yoldur! (Hicr, 15/41)*** *Yəni, ayənin mənası "mənə çatdıracaq yol budur" deməkdir. Mücahid demişdir ki: "Haqq Allaha aiddir və Onun yolu haqdır. Başqa heç nəylə əlaqəsi yoxdur". Bu nəzər nöqtəsi ayə ilə bağlı şərhlərin ən səhihidir. Buradakı* ***"Mənim doğru yolumdur"*** *kimi ifadə edilən sözlərin vaciblik bildirdiyi*

---

[R11] Hədisi imam Əhməd (1/435, h. 4142), Nəsai (Sünən əl-Kubra, 10/95, h. 11109), Mərvazi (əs-Sunnə, 1/9, h. 11), İbn Hibban (1/180, h.6), əd-Darimi (1/78, h. 202), Səid b. Mənsur (5/112, h. 935), Tayalisi (Musnəd, 1/33, h. 244) və başqaları rəvayət etmişlər.Şeyx Əlbani "Ziləlul-cənnəti fi təxricis-sunnə" (1/5, h. 17) əsərində hədisin həsən isnadlı olduğunu bildirmişdir.

*söylənmişdir. Yəni, aydınlaşdırmağı, tanıtmağı və özünü göstərməyi (sübut etməyi) öhdəmə götürdüyüm yol budur. Bu iki baxış ən-Nəhl surəsində verilən:* ***"Doğru yolu [****İslamı****] göstərmək Allaha aiddir…" (Nəhl, 16/9)*** *ayəsində ifadə edilənə bənzəyir. Bu ayə barəsindəki doğru şərh də əl-Hicr surəsində verilən ayə haqqındakı doğru şərh kimidir: Mustəqim və orta yol deyilən bu doğru yolun sonu, onu tutub gedənləri Allaha qaytaracaq və çatdıracaqdır (Bax: İbn Qeyyim, ət-Təfsirul-Qeyyim, səh. 14-15)*

*Bu kərim ayə ilə şərif hədisdən müsəlman üçün belə bir gerçək aydınlıq əldə edilir ki: haqq yol birdir, o da Uca Allahın Ona tabe olmağı əmr etdiyi doğru yoldur. Doğru yol (sirat) isə Kitabda və mötəbər Sünnədə təcəssümünü tapmış* ***İslamdır****. Bunlara bərk-bərk sarılan kəslər doğru yolu (siratu mustəqimi) hökmən taparlar.*

*Ayə və şərif hədis azdıran yolların həddən çox olduğunu ifadə edirlər. Pozğunluq yolları isə Kitab və Sünnədən uzaq olan və İslamın qəbul etmədiyi bir sıra bidətlər çıxarıb zülmətdə yeriyənlərin – Uca Allahın nuru və hidayətini özündə əks etdirən doğru yolunu tərk edənlərin yoludur. Buna görə Uca Allah belə buyurur:*

***"Allah [****Ona****] iman gətirənlərin dostudur. Onları zülmətdən çıxarıb işığa tərəf yönəldər. Kafirlərin dostu isə Tağutdur [****şeytanlardır****]. Onları [****kafirləri****] nurdan ayırıb zülmətə salarlar. Onlar cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar! (Bəqərə, 2/257)***

*Bu kərim ayədə də işıq yolu tək, zülmət yolu isə cəm halda verilmişdir. Eynilə birinci ayədə və bir az bundan qabaq qeyd etdiyimiz hədisdəki kimi, bu da haqqa aparan yolun bir olduğunu, azğınlıq yolunun isə çoxluğunu göstərir.*

## *"Hidayətə dair ayənin" doğru anlamı*

*Uca Allah belə buyurur:*

*"[Ya Rəsulum!]* ***Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar. Doğru yolda olacaq kəsləri daha yaxşı O bilir!" (Qəsəs, 28/56)***

*Bir adama öyüd-nəsihət verib onu doğru yola çağırmaq istədiyin vaxt bəziləri: əl çək ondan, onsuz da sən onu hidayətə çatdıra bilməyəcəksən deyirlər. Əgər etiraz edən adam bu ayənin, bu ayədəki hidayətin mənasını və ayənin nazil olma səbəbini bilsəydilər belə bir söz danışmazdılar.*

*1. Görkəmli elm xadimi əl-Qasimi bu ayənin təfsirində aşağıdakıları söyləyir:*

***"Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən",*** *yəni, sən ya qövmündən, ya da başqalarından olsun, İslama daxil olmasını istədiyin, arzu etdiyin hər hansı bir kəsi İslama daxil etdirmə gücünə malik deyilsən.* ***"Amma Allah dilədiyini doğru yola salar",*** *yəni doğru yola salmaq istədiyi kəsi qayğısıyla İslama daxil edir.* ***"Doğru yolda olacaq kəsləri daha yaxşı O bilir".*** *Onların bacardıqlarını və qəlblərinə möhür vurulmadığını bildiyinə görə hidayətinə qabil olanları ən yaxşı biləndir" (Məhasinul-Təvil, 13/115)*

*2. Ayənin nazil olması səbəbinə gəlincə, Hafiz İbn Kəsir təfsirində aşağıdakıları qeyd edir:*

*Buxari və Muslimdə sabitliyinə görə, ayə Peyğəmbərin (sallallahu əleyhi və səlləm) əmisi Əbu Talib haqqında nazil olmuşdur. Əbu Talib Peyğəmbərə (sallallahu əleyhi və səlləm) himayəçilik edər, ona köməklik göstərər, onun tərəfini saxlayar, onu – şəriət baxımından deyil, təbiəti etibarı ilə çox sevərdi. Ölümü yaxınlaşıb, əcəli çatdıqda*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) onu imana və İslama girməyə dəvət etdi. Amma barəsindəki ilahi qədəri gerçəkləşdi, onu əlindən alıb apardı. Əvvəlki kafirliyini davam etdirdi. Sonsuz hikmət Allaha məxsusdur. (İbn Kəsir, III, 394)*

*3. İmam Muslim də bu ayənin nazil olması səbəbini "Səhih"inin "İman" fəslində aşağıdakı müqəddimə ilə verir:*

*Ölümü yaxınlaşmış bir adamın ğarğara (yəni, ruhun boğaza çatsası – red.) kimi tanınan ruhunun alınması anından öncə İslama daxil ola bilməsinin səhihliyinə, müşriklərə bağışlanma istənilməsinin aradan götürüldüyünə və müşrik kimi ölənin cəhənnəmlik olduğuna və habelə heç bir vasitə ilə onun bu vəziyyətdən xilas ola bilməyəcəyinə dəlildir.*

*Daha sonra, onun nazil olması səbəbindən uzun-uzadı bəhs edir. Xülasəsi belədir: Əbu Talibin ölümü yaxınlaşdıqda Peyğəmbər (sallallahu əleyhi və səlləm) yanına gələrək ona dedi ki: "Əmi! Lə iləhə illəllah de. Bu kəlmə ilə mən sənin xeyrinə Allah qarşısında şahidlik edim". Ancaq o, lə iləhə illəllah deməyi qəbul etmədi. Peyğəmbər (sallallahu əleyhi və səlləm) dedi ki: "Allaha and içirəm, mən qadağan edilməyincəyə qədər sənə bağışlanmaq diləyəcəyəm". Buna görə Uca Allahdan:* ***"Müşriklərin cəhənnəmlik olduqları bəlli olduqdan sonra onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanmaq diləmək yaraşmaz!" (Tövbə, 9/113)*** *ayəsi nazil oldu.*

*Uca Allah Əbu Talib haqqında da buyruq nazil edərək Peyğəmbərə (sallallahu əleyhi və səlləm):* ***"Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən" (Qəsəs, 28/56)*** *– deyə buyurur.*

*Hədisdəki "Əbu Talibin ölümü yaxınlaşdıqda" ifadəsi ölümün əlamətlərinin görünməyə başlamsını nəzərə*

*çarpdırır. Bu da insanın axirətdəki yerini görməsindən və canının alınmağa başlanmasından əvvəl olur. Əgər axirətdəki yerini gördüyü və ruhu alındığı anda (iman gətirilərsə) imanın o şəxsə faydası olmaz (Bax: Muslim, 1/54)*

*Bu ayə və bu şərif hədis Əbu Talibin kafir olduğunu isbat edir. Əbu Talibin qurtulacağını qəbul edənlərin baxışları rədd edilir. Xüsusilə Abdul-Mutallibin oğlu Abbasın belə dediyi rəvayət edilir: Ey Allahın Peyğəmbəri, sənin Əbu Talibə hər hansı bir faydan oldumu? Çünki o səni qoruyur və sənə görə qəzəblənirdi. Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə cavab verib: "Bəli, o dayaz od içində olacaqdır. Əgər mən olmasaydım, odun ən dərin yerinə düşəcəkdi" (Muslim)*

*Bir rəvayətdə də belə deyilir: "Odun çox dərin olmayan bir yerinə salınacaq. Onun topuqlarına çatacaqdır. Buna görə də beyni qaynayacaqdır" (Muslim)*

*4. **"Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən"** buyruğunda bildirilən hidayət Uca Allaha xas olan tövfiq (yəni, doğru yola müvəfəq etmək – red.) hidayətidir. İnsanları İslama dəvət etmək baxışından hidayət isə Allahın Peyğəmbəri (sallallahu əleyhi və səlləm) və bütün dəvətçilər üçün ümumidir. Peyğəmbər (sallallahu əleyhi və səlləm) Əbu Talibi doğru yola və İslama dəvət etməsinə baxmayaraq, o, İslamı qəbul etmədi və kafir olaraq öldü. Ona görə də o ayə nazil oldu. Biz də insanları doğru yola yönəltmək məqsədilə onları dəvət edirik. Əgər üz çevirirlərsə, Allahın köməyi ilə doğru yol tapmaları üçün dua edirik. Onları dəvət etməkdən çəkinməyimiz də bəyənilmir və bu barədə də həmin kərim ayəni dəlil kimi göstəririk. Ancaq Əbu Talibin əhvalatına bənzər bir halın olması istisnadır. Bir kafiri İslama dəvət etdiyimiz zaman onun bunu qəbul etməyib kafir təki ölməsi kimi.*

## *Qurani Kərimdə hidayətin*[Σ99] *növləri*

*Uca Allahın insana hidayəti dörd cürdür. Rağib əl-İsfəhani bunları belə açıqlayır:*

*1. Hər bir özünə cavabdehlik edə bilən*[Σ100] *şəxsə ümumi şəkildə verdiyi qəbildən olan hidayət. Ağıl, zəka və bunlardan da əhəmiyyətli olan qəti biliklər*[Σ101]*. O biliklər hər kəsə qavrıya biləcəyi qədər verilmişdir. Bununla əlaqədar Uca Allah belə buyurur:*

***"…Rəbbimiz hər şeyə Öz xilqətini verən, sonra da doğru yolu göstərəndir!" (Taha, 20/50)***

*2. İnsanları peyğəmbərlər vasitəsilə, Quranı nazil etməklə və buna bənzər yollarla Özünə dəvət etdiyi hidayət. Uca Allahın:* ***"Biz onları əmrimizlə doğru yola gətirən imamlar etdik…" (Ənbiya, 21/73)*** *buyruğundan məqsəd budur.*

*3. Uca Allahın təkcə doğru yol tapanlar üçün təsis etdiyi və Allahın köməyi ilə mümkün olan doğru yol növü bunlardır:*

***"Döğru yolu tapanlara gəldikdə isə,*** *[Allah]* ***onların doğruluğunu daha da artırar və onlara təqvalarının mükafatını verər" (Məhəmməd, 47/17)***

***"…Kim Allaha iman gətirsə,*** *[Allah]* ***onun qəlbini haqqa doğru yönəldər…" (Təğabün, 64/11)***

***"İman gətirib yaxşı işlər görənləri Rəbbi iman gətirdiklərinə görə hidayətə qovuşdurar…" (Yunus, 10/9)***

---

Σ99 ***Hidayət*** – doğru yol

Σ100 Əqli (təfəkkür) baxımdan məsuliyyət daşıya bilən

Σ101 Qətiyyən kamilliyinə şübhə doğurmayan biliklər

***"Bizim uğrumuzda cihad edənləri öz yollarımıza qovuşduracağıq…" (Ənkəbut, 29/69)***

***"Allah doğru yolda olanların doğruluğunu artırar…" (Məryəm, 19/76)***

***"…Onların ixtilafda olduqları həqiqətə Onun izni ilə iman gətirənləri isə Allaha doğru yola yönəltdi…" (Bəqərə, 2/213)***

*4. Uca Allahın aşağıdakı buyruqlarında nəzərdə tutulan axirətdə cənnətə doğru yol (göstərmək):*

***"**[Allah]** onları doğru yola müvəffəq edəcək, onların əhvalını*[Σ102] ***düzəldəcəkdir" (Məhəmməd, 47/5)***

***"Biz onların*[Σ103] ***ürəklərindəki kin-küdurəti çəkib çıxardarıq. Onların** [qaldıqları yerin] **altından çaylar axar. Onlar deyərlər: "Bizi bura gətirib çıxaran Allaha həmd olsun! Əgər Allah bizi doğru yola yönəltməsəydi, biz özümüzə doğru yolu tapa bilməzdik…" (Əraf, 7/43)***

---

[Σ102] *Dünyada və axirətdə* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 561)
[Σ103] *Cənnət əhlinin* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 231)

***Bu dörd doğru yol növü bir-birilərilə əlaqədardır***

*a. Birinci doğru yola mənsub olmayanlar üçün ikinci doğru yol tətbiq oluna bilməz.*

*b. İkinci doğru yola mənsub olmayanlar üçün üçüncü və dördüncü yol mümkün deyil.*

*c. Dördüncü yola nail olan kimsə üçün əvvəlki üç doğru yol da gerçəkləşir.*

*d. Üçüncü yolu mənimsəyənlər ondan əvvəlki iki doğru yolu da müvəffəq olurlar.*

*h. Bundan sonrakı dövrdə isə bunun əksi baş verir. Yəni, insan bəzən birinci növ doğru yola mənsub olmaqla bərabər ikinci yolu əldə etməyə bilər və habelə üçüncüsünə də çata bilməz. İnsan ancaq başqasını dəvət etmək və onu yollarla tanış etməklə doğru yola yönəldilə bilər. Digər doğru yolları isə özü gerçəkləşdirə bilməz.*

*1. Dəvət etmək və yollarla tanış etməyi bildirən ikinci növ doğru yola Uca Allah bu buyruqlarla işarə vurur:*

***"…Sən** [onunla insanları] **düz yola yönəldirsən"**[Σ104] **(Şura, 42/52)***

***"…Hər tayfanın bir rəhbəri**[Σ105] **vardır!" (Rəd, 13/7)***

*2. Digər doğru yollara da Uca Allah: **"Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar…" (Qəsəs, 28/56)** buyruğu ilə işarə edir.*

---

[Σ104] *İslam dininə dəvət edib haqqa qovuşdurursan* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 541)

[Σ105] *Döğru yol göstərən peyğəmbəri* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 308)

*3. Uca Allahın zalımlara və kafirlərə nəsib etmədiyini bildirdiyi hər bir doğru yol üçüncü növdən olandır. Bu isə ancaq doğru yola nail olanlara aid kömək yoludur.*

*4. Axirətdəki mükafat və cənnətə salmaq anlayışlarındakı dördüncü doğru yol Uca Allahın aşağıdakı hökmlərində və onlara bənzər olanlarında göstərilir:*

***"İman gətirdikdən, Rəsulun haqq olduğuna şəhadət verdikdən və özlərinə aşkar dəlillər gəldikdən sonra kafir olan tayfanı Allah necə doğru yola yönəldər? Allah zalımlar dəstəsini haqq yola yönəltməz!" (Ali-İmran, 3/86)***

*Uca Allahın bu buyruğu da deyilənə misaldır:*

***"Bu** [əzab] **ona görədir ki, onlar dünyanı axirətdən üstün tutarlar. Allah kafirləri doğru yola salmaz!" (Nəhl, 16/107)***

*Uca Allahın Peyğəmbərin (sallallahu əleyhi və səlləm) və insanların qadir olmadığını (bu, onların buna gücləri çatmamasının ifadəsidir) bildirdiyi hər hansı bir hidayət – dəvət etməkdən və o yolu tanıtmağa məxsus hidayətdən kənarda olan bir hidayətdir. Bu isə ağıl vermək, doğru yola müvəffəq etmək və cənnətə varid etmək kimi olmaqla Uca Allahın aşağıdakı buyruqlarında öz əksini tapmışdır:*

***"**[Ya Rəsulum!] **İnsanları doğru yola yönəltmək sənin borcun deyildir. Allah kimi istərsə, onu doğru yola yönəldər…" (Bəqərə, 2/272)[Σ106].***

***"…Allah istəsəydi, onları yığıb doğru yola salardı…" (Ənam, 6/35)***

***"Sən korları da düşdükləri əyri yoldan qurtarıb düz yola gətirə bilməzsən…" (Rum, 30/53)***

---

[Σ106] *Sənin (Məhəmməd Peyğəmbərin, s.ə.s.) vəzifən ancaq onları haqq yola dəvət etməkdir* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 151)

***"[Ya Rəsulum!] Sən onların doğru yola gəlməsini həddindən artıq istəsən də[Σ107]. Çünki Allah yoldan çıxartdıqlarını [bir daha] doğru yola salmaz…" (Nəhl, 16/37)***

***"…Allahın yoldan etdiyi kimsəyə də yol göstərən olmaz!" (Mumin, 40/33)***

***"Allahın doğru yola saldığı kimsəni də heç kəs yoldan çıxarda bilməz…" (Zumər, 39/37)***

***"Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar…" (Qəsəs, 28/56)***

*Uca Allah bu buyruqları ilə demək istəyir ki:* ***"İnsanları iman gətirməyə sənmi məcbur edəcəksən?!"[Σ108] (Yunus, 10/99)***

***"…Allahın doğru yola saldığı kəs doğru yoldadır. Allahın yoldan çıxartdığı kimsəyə isə əsla doğru yolu göstərən bir dost tapa bilməzsən!" (Kəhf, 18/17)*** *Yəni doğru yolu istəyən və araşdıran kimsəyə Allah onu müvəffəq edir və cənnətə aparan yola salır. Halbuki Allahın azdırdığı, zəlalət və küfr yolunu tutanlar üçün vəziyyət belə deyil. Uca Allahın aşağıdakı buyruqlarında olduğu kimi:*

***"…Allah kafirləri haqq yoluna yönəltməz!" (Bəqərə, 2/264)***

***"…Şübhəsiz ki,…Allah yalançı, nankor olan kimsəni doğru yola müvəffəq etməz!" (Zumər, 39/3)***

*Yalan söyləyən, kafir olan Allahın doğru yolunu qəbul etməyəndir. Həmin sözlər bu məqsədlə işlənilməsə də belə, nəticə etibarilə buna aiddir. Allahın doğru yolunu qəbul*

---

[Σ107] *bunun heç bir faydası yoxdur!* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 329)

[Σ108] Yəni, *bu sənin işin deyildir. Sənin vəzifən ancaq İslamı təbliğ etməkdir* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 281)

*etməyən kəsə isə Allah doğru yol göstərməz: mənim hədiyyəmi qəbul etməyən kimsəyə, mən də hədiyyə verməræm, mənim bağışlamamı qəbul etməyən kimsəni bağışlamaram, məndən üz çevirən kimsəyə mən də çevrilib baxmaram deyilməsinə bənzəyir (Bax: Rağib əl-İsfəhani, əl-Mufradət fi Ğaribul-Quran, səh. 539)*

## *Möminlərin ruhlarının qorunması*

*Uca Allah belə buyurur:*

***"Küfr edənlər də, sizin Məscidülhərama daxil olmağınıza maneçilik törədənlər də, qurbanlıqları öz yerinə gedib çatmağa qoymayanlar da məhz onlardır. Əgər tanımadığınız mömin kişi və qadınları bilmədən ayaq altına alıb əzmək və bundan dolayı sizə günah gəlmək ehtimalı olmasaydı***[Σ109] ***. Amma Allah istədiyini Öz mərhəmətinə qovuşdursun deyə*** *[o zaman buna izin vermədi]* ***Əgər onlar*** *[möminlərlə kafirlər]* ***bir-birindən seçilib ayrılmış olsaydılar, Biz onlardan kafir olanları şiddətli bir əzaba düçar edərdik!" (Fəth, 48/25)***

***Bu kərim ayədən aşağıdakı nəticələr çıxır***

*1. Məkkə sakinləri olan müşriklər ümrəyə getmək məqsədilə Məkkəyə girmək istəyən müsəlmanlara maneçilik törətdilər. Müsəlmanlar özləri ilə bərabər kəsilməsi üçün təyin olunmuş yerlərə çatdırılması əngəllənən qurbanlıqlar da aparırdılar.*

*2. Aralarında möminlər olduğu halda basqın edən kafirlərlə (lüzumsuz olaraq mömin kişi və qadınların həlak ola biləcəyi qorxusundan) vuruşmaq bəyənilmir. Bu vəziyyətdə döyüşən möminlər günaha uğrayır və utanılacaq bir hala düşürlər. Bu ayə İslamın mömin kişi və qadınların, azacıq da olsa, həyatda yaşamalarına nə qədər diqqət yetirildiyini aydın şəkildə göstərir. İbn Kəsir təfsirində deyir ki, o vaxt Məkkədə olan mömin kişi və qadınların sayı doqquz nəfər idi. Bunlar yeddi kişi və iki qadındı.* ***"… Əgər tanımadığınız mömin kişi və qadınları bilmədən ayaq altına***

---

[Σ109] *Allah siz möminlərin hamılıqla Məkkəyə daxil olmasına izin verərdi* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 567)

***alıb əzmək və bundan dolayı sizə günah gəlmək ehtimalı olmasaydı…"*** *buyruğunun ifadə etdiyi məna da bu idi.*

*3. Uca Allahın, aralarından istədiyi kimsələr, İslama girsin deyə, müşriklərin cəzalandırılmasını təxirə salması. Əslində, elə səbəb də bu olmuşdu. İbn Kəsir təfsirində Həbib b. Sibənin belə dediyini rəvayət edir:*

*"Mən günün başlanğıcında Peyğəmbərə (sallallahu əleyhi və səlləm) qarşı kafir kimi döyüşdüm, günün sonunda isə onunla birlikdə mömin olaraq döyüşdüm".*

*Burada Uca Allah:* ***"…Amma Allah istədiyini Öz mərhəmətinə qovuşdursun deyə*** *[o zaman buna izin vermədi]****…"*** *buyruğu ilə buna işarə vurur.*

*4. Aralarında möminlər olan lakin onlardan seçilən və yaxud möminlərlə bir-birinə qarışmış halda olmayan kafirlərlə döyüşə yol verilir. Bu nəticə, Uca Allahın:* ***Əgər onlar*** *[möminlərlə kafirlər]* ***bir-birindən seçilib ayrılmış olsaydılar, Biz onlardan kafir olanları şiddətli bir əzaba düçar edərdik!"*** *buyruğundan əldə edilir.*

*5. Kaş ki, ümumiyyətlə bütün müsəlmanlar, xüsusilə də onların arasından cihad edənlər bu kərim ayəni tətbiq edəydilər və onlarla döyüşmək istəyən kimsələr arasında bir-birinə qarışmış halda olan müsəlman bacı və qardaşlarının olduğunu göz qabağına gətirəydilər. Əgər ilk müsəlmanlar, müşriklər onlara Məkkəyə girməyə mane olduqları zaman, onlarla döyüşməyi sonraya saxladıqları kimi, təxirə salsaydılar, onda mömin bacı-qardaşlarını qoruyar, günahkarlara onların boyunlarını vurmaq fürsəti və namuslarını ayaqlar altına atmaq imkanı verməmiş olardılar.*

## *Quranın əmr etdikləri Peyğəmbərə*

## *nazil olanlardır*

*Uca Allah buyurdu ki:*

***"…Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin…" (Həşr, 59/7)***

*İbn Kəsir deyir ki, sizə hər nə əmr edərsə*[Σ110]*, onu yerinə yetirin və sizə hər nəyi qadağan edərsə, ondan uzaq durun. Çünki o, ancaq xeyirli olanı əmr edir və ancaq şər olanı qadağan edir.*

*Abdullah b. Məsud (A.o.r.) deyib ki: Allah döymə döyən, döymə döydürən qadınlara, qaşlarını aldıranlara, gözəllik üçün Uca Allahın xilqətini*[Σ111] *dəyişdirərək dişlərini hamarlatdırıb nazildənlərə lənət oxumuşdur. Abdullahın bu sözü evində olan və Um Yaqub kimi tanınan Əsəd övladlarından bir qadına çatdı. Abdullahın yanına gələrək belə dedi: Mənə xəbər verildiyinə görə sən filan-filan şeylər demisən. Abdullah cavab verib ki: Peyğəmbərin (sallallahu əleyhi və səlləm) lənət etdiyi və Uca Allahın Kitabında da (lənətlə) yad edilmiş kimsələri mən nəyə görə lənətləməməliyəm? Qadın: Mən heç şübhə yoxdur ki, Quranı başdan axıra kimi oxumuşam və bilirəm. Sənin bu dediyini orada görməmişəm. Abdullah cavab verdi ki: Əgər sən Quranı həqiqətən oxumuş olsaydın, onu tapardın. Sən* ***"…Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin…"*** *buyruğunu orada oxumamısanmı? Qadın oxuduğunu təsdiq etdikdə, Abdullah belə söylədi: Peyğəmbər bu dediklərini yasaqlamışdır. Bu dəfə isə, qadın dedi ki: məncə sənin ailən də bunu edir. Abdullah: Get, bax! – dedi. Qadın getdi, amma dediyi kimi bir şey görmədi. O, qayıdaraq: Xeyir, dediyim kimi bir şey görmədim, deyincə,*

---

[Σ110] Yəni, bu ayə o deməkdir ki, Peyğəmbər (sallallahu əleyhi və səlləm) sizə…və ardı mətndə olduğu kimi oxunmalıdır.

[Σ111] Verdiyi əzəli surəti

*Abdullah ona belə söylədi: Əgər dediyin kimi olsaydı, bizimlə birlikdə olmazdılar. (Buxari və Muslim) (İbn Kəsir, IV, 336)*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur: "Mən sizə bir əmr verməli olsam, onu gücünüz çatdığı qədər yerinə yetirin. Sizə bir şeyi qadağan etsəm, ondan da uzaq olun" (Buxari və Muslim)*

*Bu kərim ayə Peyğəmbərin (sallallahu əleyhi və səlləm) əmr etdiyi doğruluq, əmanət, əhdə vəfa, verilən sözü yerinə yetirmək, saqqal saxlamaqla bağlı və bütün digər əmrləri əhatə edir. Uzun illər bundan qabaq Məkkədə Məscidul-Haramda dərs deyirdim, hacılara Peyğəmbərin (sallallahu əleyhi və səlləm) əmr etdiyi qaydada saqqal saxlamağı, bığlarını gödəltməyi tövsiyyə edirdim. Dərsdə olanlardan bir nəfər ayağa qalxaraq məndən bunun vacibliyinə dair Qurani Kərimdən dəlil gətirməyimi xahiş etdi. Mən də ona Uca Allahın:* ***"…Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin…" (Həşr, 59/7)*** *ayəsini oxu dedim və sonra:*

*– Peyğəmbərin (sallallahu əleyhi və səlləm) bizə saqqal buraxmaq əmri vardır, – dedim.*

*O da mənə:*

*– "Doğru söyləyirsən" – dedi.*

*Bir neçə gündən sonra isə saqqal buraxdı.*

## Çox zikr etmə[Σ112] və növləri

*Uca Allah buyurur ki:*

---

[Σ112] ***Zikr etmə*** – anma, xatırlama, yada salma

***"Ey iman gətirənlər! Allahı çox zikr edin!" (Əhzab, 33/41)***

*Zikri (anmanı, xatırlamanı) uzatmaq Allaha məhəbbət bəsləmənin davam etməsinə səbəb olduğuna görə Uca Allah kamal dərəcəsində sevgiyə, übudiyyətə, təzimə və yüksəldilməyə ən layiqli olduğundan, Onu çoxlu-çoxlu anmaq qul üçün ən faydalı işlərdəndir. Əkin üçün də, susuz yaşaya bilməyən balıq üçün də su nədirsə, qəlb üçün də zikr elədir. Zikrin bir sıra növləri var:*

*1. Şəni Uca Allahı adı və sifətləri ilə zikr etmək və onlarla Ona tərif demək və dua-sənalar etmək;*

*2. Uca Allahı təsbih*[Σ113] *etmək, Ona həmdüsəna, təkbir*[Σ114] *və təhlil*[Σ115] *etmək, şənini ucaltmaq. Sonra gələn alimlər tərəfindən zikr anlayışının işlədilməsində əsasən bunlar nəzərdə tutulur.*

*3. Uca Allahı hökmləri, əmrləri, qadağaları ilə xatırlamaq. Bu, elm əhlinin zikridir.*

*Bütünlüklə bu üç növ zikr insanların Rəblərini anma növlərini ifadə edir.*

*4. Uca Allahı, Onun kəlamı olan Qurani Kərimi oxuyaraq anmaq. Bu da zikrin ən bərəkətlisi qəbul edilir. Uca Allah belə buyurur:*

***"Hər kəs Mənim öyüd-nəihətimdən** [Qurandan] **üz döndərsə, güzəranı daralar**[Σ116] **və Biz qiyamət günü onu məhşərə kor olaraq gətirərik!" (Taha, 20/124)***

---

[Σ113] ***Təsbih etmə*** – "Sübhənallah" deməkdir.
[Σ114] ***Təkbir etmək*** "Allahu Əkbər!" deməkdir.
[Σ115] ***Təhlil etmə*** – "Lə iləhə illəllah" deməkdir. .
[Σ116] *Yaxud qəbir evində şiddətli əzaba düçar olar* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 378)

*Burada Uca Allahın öyüd-nəsihəti*[Σ117] *deyildikdə nəzərdə tutulan, Peyğəmbərinə nazil etdiyi Kəlamdır.*

*Uca Allah bir başqa yerdə belə buyurur:*

***"O kəslər ki, Allaha iman gətirmiş və qəlbləri Allahı zikr etməklə aram tapmışdır. Bilin ki, qəlblər yalnız Allahı zikr etməklə aram tapar!" (Rəd, 13/28)***

*5. Uca Allaha dua edərək, Ondan bağışlanma diləyərək, Ona yalvarıb-yaxararaq Onu anmaq.*

*Peyğəmbərin (sallallahu əleyhi və səlləm) anılıb xatırlanması da Uca Allahı xatırlamaqla bağlıdır. Bunlar zikrin beş növünü təşkil edir (Bax: İbn Qeyyim, Cəlaul-Əfhəm, səh. 307)*

*Allahı zikr etmək Allahın şəriətə aid buyurduğu hökmlərinə və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) millətinə öyrətdiyi qaydada yerinə yetirilir. Zikr sufilərin uydurduğu və bidət kimi araya çıxartdıqları müxtəlif forma və bidət şəkilləri ilə edilə bilməz. Məsələn, onlar "hu hu (o, o)" deyirlər və bunu Allahın adlarından biri kimi qəbul edirlər. Amma bu doğru deyildir. Eyni qaydada Peyğəmbərə (sallallahu əleyhi və səlləm) salavat çevirmək də ancaq Sünnədə verilmiş şəkildə olmalıdır. İbrahim salavatı (Allahummə salli alə Məhəmməd…) kimi, ancaq Sünnədə verilmiş qaydada ıə Sünnəyə uyğun olan oxşar sözlərlə verilə bilər.*

## *Davud əleyhissəlamın fitnəsinin (sınanmasının) mahiyyəti nədədir?*

*Uca Allah belə buyurur:*

---

[Σ117] ***Zikrindən (Qurandan)***

*"[Ya Peyğəmbər!]* ***Sənə*** *[Davudun padşahlığı vaxtı]* ***dava edənlərin xəbəri gəlib çatdımı? O zaman onlar məbədə***[Σ118] ***divardan aşıb gəlmişdilər. Onlar Davudun yanına gəldikdə*** *[Davud]* ***onlardan qorxdu. Onlar dedilər: "Qorxma, biz bir-birimizə haqsızlıq etmiş iki iddiaçıyıq. Aramızda ədalətlə hökm et, haqqı tapdalama və bizə doğru yol göstər!*** *[Onlardan biri dedi:]* ***"Bu mənim*** *[din]* ***qardaşımdır. Onun doxsan doqquz dişi qoyunu, mənim isə bircə dişi qoyunum vardır***[Σ119]***. Belə bir vəziyyətdə: "Onu mənə ver!" – dedi və mübahisədə məni məğlub etdi.*** *[Davud]* ***dedi: "O sənin bircə qoyununu öz qoyunlarına qatmaq istəməklə, şübhəsiz ki, sənə zülm etmişdir. Doğrudan da, şəriklərin çoxu bir-birinə haqsızlıq edər. Yalnız iman gətirib yaxşı işlər görənlərdən savayı! Onlar da çox azdırlar!*** *[İddiaçılar bir-birinə baxıb güldükdən, yaxud çıxıb getdikdən sonra]* ***Davud*** *[bu işdən şübhəyə düşərək]* ***Bizim onu imtahana çəkdiyimizi güman etdi. O dərhal Rəbbindən öz bağışlanmasını dilədi və dizi üstə düşüb səcdəyə qapanaraq tövbə etdi. Biz bunu***[Σ120] ***ona bağışladıq. Həqiqətən, o,*** *[qiyamət günü]* ***dərgahımıza yaxın olacaq və onun qayıdıb gələcəyi yer də gözəl olacaqdır. Ya Davud! Biz səni yer üzündə xəlifə etdik. Buna görə də insanlar arasında ədalətlə hökm et, nəfsdən gələn istəklərə uyma, yoxsa onlar səni Allah yolundan sapdırar. Şübhəsiz ki, Allah yolundan sapanları haqq-hesab gününü unutduqları üçün şiddətli bir əzab gözləyir!" (Sad, 38/21-26)***

*Təfsirçi alimlər bu kərim ayə haqqında bir-birindən fərqlənən nəzər nöqtələrinə malikdirlər.*

---

Σ118 *Davuda məxsus məbədə ibadət vaxtı ora daxil olmaq qadağan edildiyi üçün* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 510)

Σ119 *Və yaxud onun doxsan doqquz zövcəsi, mənim isə bircə zövcəm vap* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 511)

Σ120 *O biri iddiaçını dinləməyərək onu zülmkar adlandırmasını və ya belə bir səhv zənnə düşməsini* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 511)

*1. Təbəri deyir ki: Bu Davud əleyhissəlamın ibadət etdiyi yerə divarı aşaraq gələn iddiaçının gətirdiyi bir misaldır. Belə ki, deyildiyinə görə, Davudun doxsan doqquz zövcəsi varmış. Müharibəyə göndərdiyi adamın öldürülməsinə qədər isə tək bir zövcəsi varmış. Rəvayət edildiyinə görə, həmin adam döyüşdə öldürüldükdən sonra Davud onun zövcəsi ilə də nikahlanmışdır. Sonra isə iki iddiaçı barəsində hökm verdikdə, özünün sınağa çəkildiyini anladı və Allahdan günahının bağışlanmasını istədi. Allaha səcdə etdi, Rəbbinin rizasına üz tutdu və günahının bağışlanması üçün tövbə etdi (Bax: Təbəri, XXIII, 143.)*

*Daha sonra Təbəri onun hekayəti haqqında uzun silsilə sənədi ilə birlikdə bəhs edir. Bu hekayətdə bildirilən bir fəsil bu anda əldə olan Tövratda verilmiş həkayətə bənzəyir (Bax: əl-Qasimi, XIV, 156)*

*2. Suyuti əl-İklildə bunları söyləyir: Qadın haqqında deyilən və Davudun o qadını bəyəndiyi və ərini də həlak edilincəyə qədər müharibələrə göndərdiyi barədə hekayəti İbn Əbi Hatim, Ənəsin rəvayət etdiyi mərfu (yəni, Peyğəmbərdən nəql edilən – red.) bir hədis kimi göstərir. Hədisin isnadında İbn Luheyə də vardır. İbn Luheyənin vəziyyəti məlum olan bir şəxsdir. O, Əbu Yəzid ər-Ruqaşidən rəvayət etmişdir. Bu isə zəif bir hədis rəvayətçisidir. Ayrıca olaraq bu rəvayəti İbn Abbasın dediyi söz kimi də rəvayət etmişdir.*

*Deyərdim ki, Təbərinin və digər təfsirçilərin nəqli və əqli dəlillərinin zəifliyinə baxmayaraq bu hekayəti nəql etmələri heyrət doğuracaq bir haldır.*

*3. İbn Həzm əl-Fasl adlı əsərində bunları deyir: Uca Allahın Davud əleyhissəlam haqqında bildirdikləri doğru və səhihdir, lakin yəhudilərin düzəltdikləri bir sıra xürafatlara arxalanan yalançı və məsxərəçilərin söylədiklərinin heç biri dəlil deyildir. Bu iddiaçılar şübhəsiz ki, Adəm oğullarından*

*idilər. Onlar həqiqətən də öz aralarında bir-neçə dişi qoyun haqqında mübahisə etmişdilər. Onların biri digərinə, ayənin də bildirdiyi kimi, haqsızlıq etmişdi. Onların, qadınlarla bağlı olduğuna üstüörtülü eyham vuran mələklər olduqlarını söyləyən kəslər Uca Allaha iftira edirlər. Onun buyurmadığını buyurduğuna iddia edirlər, Quranda olmayan bir şeyi ona əlavə edirlər.*

*Allaha and içirəm ki, bizdən hər bir kəs özünü və abrını qorumağa çalışan qonşusunu, qonşusunun zövcəsinə vurulmaqdan, sonra da ona evlənmək məqsədilə ərini ölümə vadar etməkdən özünü qorusun.*

*4. əl-Bəqai təfsirində belə deyir: Bu və buna oxşar hekayətlər yəhudilərin uydurduqları yalanlarındandır. Onlardan İslama girmiş birisinin mənə bildirdiyinə görə, onlar Davud əleyhissəlam haqqında bu hekayəti qəsdən yayırlar. Çünki İsa əlehissalam onun nəslindəndir. Bu yolla ona böhtan atmaq üçün fürsət tapmış olurlar.*

*Daha sonra aşağıdakıları söyləyir: Uca Allahın:* ***"…Biz bunu ona bağışladıq…"*** *buyruğu, iddiaçılardan birinin sözünü dinləmədən ədalətsiz hökm verməsinin mahiyyətini ifadə edən sözlər işlətməsini ona bağışladıq mənasını bildirir. Bu iş hökm çıxarmaq məsələsi ilə bağlı Uca Allahın Davud əleyhissəlama verdiyi bir təlimdir. Uca Allahın bu əhvalatdan bəhs etməsi Davud əleyhissəlam barəsində əslində mümkün olmayan bəzi ehtimallar uydurulmasının qarşısını almaq üçün:* ***"… Həqiqətən, o, [****qiyamət günü****] dərgahımıza yaxın olacaq və onun qayıdıb gələcəyi yer də gözəl olacaqdır…"*** *– deyə buyurmasıdır. O halda hekayətdən bəhs edilməsinin yeganə bir səbəbi kamillik pillələrində daha çox irəliləyişin əldə edilməsi məqsədi daşıyır. Barəsində danışdığım məsələnin ilk dəlili də – belə bir sınağın hökm çıxarmaq barədə bir təlim olmasını ehtiva etməsindədir. Bunun bir qadınla və ya başqası ilə bir əlaqəsi yoxdur.*

*Qadınla bağlı bəhs edilən hekayət məşhur olsa da belə, batildir. Çünki neçə-neçə məşhur olan batil deyimlər var ki, ayrı-ayrı şəxslər tərəfindən qəsdən uydurulmuşdur (Bax: Təfsirul-Qasimi, XIV, 159)*

## *Süleyman peyğəmbər əleyhissəlam atlara olan sevgisindən onları sığallayır*

*Uca Allah belə buyurur:*

***"Biz Davuda Süleymanı bəxş etdik. Nə gözəl bəndə! O, daim Allaha sığınan bir kimsə idi.** [Bir gün] **axşamüstü ona cins**[Σ121] **çapar atlar göstərildiyi zaman o dedi: "Mən gözəlliyi** [bu atları] **Rəbbimin zikrindən** [Tövratdan] **dolayı sevirəm**[Σ122]**. Nəhayət,** [o atlar Süleymanın gözündən] **qeyb olub gizləndi.** [Süleyman dedi:] **"Onları mənə qaytarın!** [Atlar qaytarılıb gətirildikdən sonra] **onların qıçlarını və boyunlarını sığallamağa başladı" (Sad, 30-33)***

*Təfsirçilərin bir çoxu, atlar Süleyman əleyhissəlamı günəş batıncaya qədər məşğul etdiyinə görə, onun əsr namazına gecikdiyini bildirirlər. Buna görə, o, Uca Allaha yaxınlaşmaq məqsədilə bu atların ayaqlarının kəsilməsini və başlarının vurulmasını əmr etmişdir. Bu məsələ ilə bağlı işlətdikləri sözlərin bir-birindən fərqli olması ilə bərabər hamısı həmin məna ətrafında dolaşır. Bu təfsirə qarşı bir sıra mülahizələrdən bəhs edilir:*

*Uca Allahın: **"Rəbbimin zikrindən dolayı"** buyruğunda bəhs edilən **"Rəbbi zikr etmə"**nin əsr namazı olmasına dair*

---

Σ121 *Bir ayağını dırnağı üstünə qoyub, üç ayağı üstündə duran* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 511)

Σ122 *Çünki Allahın dinini qüvvətləndirmək üçün bir cihad vasitəsi kimi onların tərifi Tövratda mövcuddur* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 511-512)

*bir dəlil yoxdur. Çünki buradakı "عن: dən, dan" şəkilçiləri bəzən "من: dən, dan" növündən mənasını da verir. Beləliklə, Şəvkani öz təfsirində İbn Abbasdan Uca Allahın:* ***"Rəbbimin zikrindən"*** *buyruğunu Rəbbimi zikr etmək növündən mənasında olduğunu söyləmişdir (IV, 432) Buna görə, atlar Allahı zikr etməklə bağlı ibadət növlərindəndir. Çünki atlar cihad etməkdə köməkçidirlər. Buna görə Uca Allah atların bağlanıb bəslənməsini əmr etmişdir:*

***"[****Ey möminlər!****] Allahın düşmənini və öz düşməninizi, onlardan başqa sizin bilmədiyiniz, lakin Allahın bildiyi düşmənləri [****münafiqləri****] qorxutmaq üçün kafirlərə qarşı bacardığınız qədər qüvvə və [****cihad üçün bəslənilən****] döyüş atları tədarük edin…" (Ənfal, 8/60)***

*Bugünkü günümüzdə atların yerini tanklar, təyyarələr, zirehli maşınlar, raketlər və daha başqa vasitələr əvəz edirlər.*

*Buna görə, atların cihad üçün hazırlanması tələb olunan ibadətlərdəndir. Hətta, ən fəzilətlilərindən. Bundan başqa, atlar bir çox hədislərdə təriflənmişdir.*

***"…Nəhayət, (****o****) qeyb olub gizləndi…"*** *buyruğunun Günəşə aid olması haqqında dəlil yoxdur. Çünki nə əvvəl və nə də sonra günəşdən söz salınmır. Ən çox xatırlanan varlıqlar atlardır. Bunun təsdiqi* ***"Nəhayət, (****o atlar Süleyman əleyhissəlamın gözündən****) qeyb olub gizləndi"*** *ifadəsində öz əksini tapır.*

*Bundan daha əhəmiyyətlisi təfsirçilərin:* ***"…onların qıçlarını və boyunlarını sığallamağa başladı…"*** *buyruğunu "ayaqlarını və boyunlarını kəsdirdi" deməklə açıqlamaları olmuşdur. Beləliklə, onlar "sığallama (məsh)" sözünü "kəsmək" kimi təfsir etmişlər ki, bunun da dəlili yoxdur. Xüsusilə bu vasitə ilə heyvana əzab verilməsi və malın tələf edilməsi özünü doğrultmur.*

*Ən müvafiq izah, bizim, kərim ayənin zahirindən də bilindiyi kimi, onu başa düşüləcək şəkildə şərh etməyimizdir. Təbəri Uca Allahın:* **"…onların qıçlarını və boyunlarını sığallamağa başladı"** *buyruğu ilə əlaqədar İbn Abbasın aşağıdakı açıqlamasını rəvayət edir: "Süleyman atlara olan sevgisindən onların yallarını və ayaqlarını sığalladı" (Buxari)*

*İbn Abbasın nəql etdiyimiz baxışı ayənin təfsirinə ən uyğun gələn şərhdir. Çünki Allahın peyğəmbəri Uca Allahın izni ilə heyvanların ayaqlarını kəsməklə onlara əzab və işgəncə verməz, səbəb olmadan malını tələf etməz (Bax. Təbəri, XX111, 156)*

*İbn Abbasın bu təfsiri mötəbərdir. Süleyman əleyhissəlamın atlara olan sevgisinin, dolayısı ilə, hərbi keçid təşkil etmək məqsədindən irəli gələ biləcəyini də demək olar. Atlar qarşısından keçərək uzaqlaşıb gözdən itən sonra onları təkrarən geri döndərməyi əmr etdi. Bu dəfə o, atların ayaqlarına və böyunlarına yapışmış toz-torpağı (hal-hazırda at saxlayanların etdiyi kimi) silməyə qoşulmuşdu.*

*İbn Həzm demişdir ki, ayənin mənasının, atlarla məşğul olaraq namazı ötürdüyü üçün, onların boynunu vurmaq kimi yozulması olduqca biganə, dəyərsiz, uydurulmuş və yalan bir xürafatdır, müxtəlif nəzər nöqtələrinə görə, əhəmiyyətsiz baxışları ehtiva edir. Çünki burada günahsız atların cəzalandırılması və onların orqanlarının kəsilməsi, mənasız yerə yararlı malın tələf edilməsi, Allahın elçisi olan bir peyğəmbərə namazın ötürülməsinin aid edilməsi, sonra da atları törətdikləri günahlara görə deyil, öz günahı üzündən cəzalandırdığından bəhs edilir.*

*Ayənin mənası isə aşağıdakı kimidir.*

*O, Rəbbini xatırlamaq üçün xeyri sevmişdir. Sonra, günəş və yaxud haqqında danışılan həqiqi atlar pərdənin arxasında yoxa çıxdı. Bunun ardıyca Süleyman*

*əleyhissəlam atların geri qaytarılmasını əmr edən kimi, onları gətirdikdə, onlara şəfqətini və nəvazişini göstərərək, böyunlarını və ayaqlarını sığallamışdır. Kərim ayənin, elə oxunuşundan da bəlli olan və başqa bir anlamının nəzərdə tutulması ehtimal edilməyən, mənası budur. Qəti şəkildə peyğəmbərin (ə.) atları öldürməsi və namazını ötürməsinə dair (verilən şərhlərə görə) heç bir işarə*[Σ123] *yoxdur. Halbuki, bütün bunları*[Σ124] *müsəlmanların bir sıra etibarlı şəxsiyyətləri də söyləmişlər. Peyğəmbərin (sallallahu əleyhi və səlləm) sözündən başqa heç kimin sözünün dəlil kimi gətirilə bilinmədiyi halda, həmin etibarlı müsəlmanlar bunları hansı əsasla söyləmişlər!*

*Fəxrəddin ər-Razi ayə haqqında aşağıdakıları söyləmişdir:*

*Şübhəsiz ki, atları bağlayıb saxlamaq onların da dinində yayılmış bir şey idi. Belə ki, bu, İslam dinində də belədir. Digər tərəfdən, Süleyman əleyhissəlam müharibəyə ehtiyac duyurdu. Ona görə də o, at hazırlanması və onlarla məşq keçirilməsini əmr edərək belə demişdi: Mən bu atları dünya üçün və nəfsimin istəyinə görə sevmirəm. Mən bunları ancaq Allahın əmri və Onun dinini gücləndirmək istədiyim üçün sevirəm. Bax, Uca Allahın:* **" Rəbbimin zikrindən..."** *buyruğundan məqsəd də elə budur. Daha sonra, o, atların geri qaytarılmasını və çapdırılmalarını əmr edir. Nəhayət atlar pərdə arxasına keçərək qeyb olurlar, yəni Peyğəmbər (ə.) üçün onlar görünməz olur. Daha sonra mehtərlərə atları geri qaytarmalarını əmr edir, atlar onun yanına qaytarılıb gətirilincə, onların boyunlarını və ayaqlarını sığallamağa başlayır.*

---

[Σ123] Dəlil, sübut

[Σ124] Əslində, cəfəngiyatı

***Bu sığallamağın məqsədi***

*1. Atların yüksək keyfiyyətlərinə və qiymətli olmalarına işarədir. Çünki atlar düşməni qovmaq üçün ən böyük köməkdir.*

*2. Süleyman əleyhissəlam bu davranışıyla ölkəsinin idarə olunmasını və mülkiyyətini şəxsən özünün ciddi intizam altında saxladığını göstərir.*

*3. Atların vəziyyətinə, xəstəliklərinə, qüsurlarına o, daha yaxşı bələddir. Buna görə də o, atları özü sınaqdan keçirir, onların boyunlarını və ayaqlarını sığallayır. Beləcə, onlarda bir xəstəlik olub-olmaması əlamətlərini öyrənməyə çalışırdı.*

## *Süleyman əleyhissəlamın "fitnəsinin" düzgün təfsiri*

*Uca Allah belə buyurur:*

***"And olsun ki, Biz Süleymanı[Σ125] imtahana çəkdik. Taxtının üstünə bir cəsəd atdıq. Sonra o[Σ126] qayıtdı" (Sad, 38/34)***

*Bu kərim ayəni Peyğəmbərin (sallallahu əleyhi və səlləm) aşağıdakı hədisi təfsir edir: "Süleyman əleyhissəlam deyib ki, bu gecə yüz xanıma dəyəcəyəm. Hər bir xanım Allah yolunda döyüşəcək bir oğlan doğacaq. Mələk ona, İnşəallah da de, dedisə də, o yaddan çıxarıb demədi. Xanımları bir-bir dolaşdı. Onlardan ancaq hansısa biri yarımçıq bir insan doğdu".*

---

Σ125 *Etdiyi bir xəta üzündən* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 512)

Σ126 *Peşman olub tövbə etdi və yenidən öz mülkünə, öz taxtına)* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 512)

*Bir rəvayətdə: "Onlardan bir xanımdan başqa kimsə hamilə olmadı. O da yarım bir insan doğdu".*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) buyurdu ki: "Əgər, "inşallah" desəydi, andını pozmazdı və istəyinin gerəkləşməsi ehtimalı daha yüksək olardı".*

*Başqa bir rəvayətdə də belə deyilmişdir:"Əgər "inşallah" demiş olsaydı, onların hər biri ata minən və Allah yolunda döyüşən bir kişi doğacaqdı" (Buxari və Muslim)*

*Şeyx Məhəmməd Əmin əş-Şinqiti «Ədvaul-Bəyan» adlı təfsirində aşağıdakıları söyləyir:*

*Bu məsələni öyrəndikdən sonra, onu da bildirim ki, bu səhih hədis Uca Allahın:* ***"And olsun ki, Biz Süleymanı imtahana çəkdik. Taxtının üstünə bir cəsəd atdıq…"*** *buyruğunu açıqlayır. Süleymanın (ə.) sınanması onun "inşallah" deməyi unutmasına görə idi. O qadınlar arasından yalnız biri uşağa qaldı və o da yarım insan doğdu. Uca Allahın:* ***"…Taxtının üstünə bir cəsəd atdıq…"*** *buyruğunda bəhs edilən və ölümündən sonra taxtının üstünə atıldığı bildirilən cəsəd həmin o yarıminsandır.*

*Təfsirçilərin Uca Allahın:* ***"And olsun ki, Biz Süleymanı imtahana çəkdik…"*** *buyruğunu təfsir etmələri əsnasında bəhs etdikləri şeytanın möhürü alaraq Süleymanın (ə.) taxtında oturduğunu və onu mülkündən qovub uzaqlaşdırdığı bu vəziyyətin möhürü balığın qarnında tapıncaya qədər davam etdiyini, bəhs edilən bu balığın isə şahlığından uzaqlaşdırılmış vəziyyətdə ikən, yanında muzdur işlədiyi bir şəxsin ona verdiyi balıq olduğuna və hekayətin digər təfərrüatlarına gəlincə, bunun batil və əsassız olması açıq-aydın məlumdur. Peyğəmbərlik dərəcəsinə belə bir şeyin yaraşmadığı aydın görünən bir məsələdir. Bunların batil olması aydın bilinən İsrail uydurmalarıdır. Ayənin elə zahirindən anlaşıldığına görə, əsil məna bizim qeyd etdiklərimizdir. Səhih Sünnə də ümumiyyətlə buna dəlalət*

*edir. Tədqiqatçı İslam alimlərinin bəzisi də bunu üstün tutmuşdur. Doğrusunu ən yaxşı bilən Allahdır (1V, 77)*

## *Cadu şeytanların işidir*

*Uca Allah buyurur ki:*

***"Allah tərəfindən onlara ellərindəkini[Σ127] təsdiq edən bir peyğəmbər gəldikdə kitab verilənlərdən[Σ128] bir qismi[Σ129] guya bilmirmiş kimi, Allahın kitabına arxa çevirdi.*** *[Yəhudilər]* ***Süleymanın səltənətinə dair şeytanların oxuduqlarına uydular. Süleyman kafir olmadı, lakin şeytanlar sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanları xalqa öyrədərək kafir oldular. Halbuki*** *[o iki mələk]*: ***"Biz imtahanıq, sən gəl kafir olma!" – deməmiş heç kəsə sehr öyrətmirdilər. Yenə də ər-arvad arasına nifaq salan işləri onlardan öyrənirdilər. Lakin onlar Allahın izni olmadan heç kəsə zərər verə bilməzlər. Onlar*** *[yəhudilər]* ***ancaq özlərinə faydası olmayan, zərər verən şeyləri öyrənirdilər. Həqiqətən, onlar belə şeyləri satın alanların axirətdə payı olmadığını yaxşı bilirlər. Kaş ki, onlar özlərini nə qədər yaramaz bir şeyə satdıqlarını biləydilər! Əgər onlar iman gətirib pis əməllərdən çəkinsəydilər, Allah tərəfindən əldə etdikləri savab daha xeyirli olardı. Kaş ki, bunu dərk edəydilər" (Bəqərə, 2/101-103)***

*Məhəmməd (sallallahu əleyhi və səlləm) yəhudilərdə olan Tövratı təsdiq edən gəldikdə onu qəbul etmədilər. Qurana da, Tövrata da arxa çevirərək onları tərk etdilər və layiqincə əməl etmədilər. Bunun müqabilində yəhudilər şeytanların Süleyman əleyhissəlamın səltənəti əleyhinə*

---

[Σ127] *Tövratı* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 128)

[Σ128] *Yəhudilərdən* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 128)

[Σ129] *Tövratda Məhəmməd əleyhissəlamın həqiqi peyğəmbər olduğu barədə deyilənləri* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 128)

*uydurduqları iftiraları və cadularının ardıyca gedirdilər. Çünki şeytanlar özləri cadugərliklə məşğul olurdular və Süleyman əleyhissəlamın da cadugərlik etdiyini və böyük səltənətini bunun vasitəsilə əldə etdiyini iddia edirdilər. Uca Allah onların yalanlarını rədd etdi və Süleyman Peyğəmbərin (ə.) küfr və zərərdən ibarət olan cadugərlikdən uzaq olduğunu bildirdi, cadu və küfrün onu yəhudilərə öyrədən şeytanlara məxsus olduğunu göstərdi və bu cadunu Uca Allahın iki mələyi olan Harut və Maruta nazil etmədiyini açıqladı (Bax: İbn Kəsir Təfsiri və başqaları)*

*1. Əlusi Uca Allahın:* ***"iki mələyə…nazil edilən şeylər"*** *buyruğunun "cadu" mənasındakı sözə istinad etdiyini bildirir (Məhz buna görə şeytan həm cadunu və həm də iki mələyə nazil edildəni öyrədirdi deyilir) Bu istinadın faydası ondadır ki, bu yolla onların sehr olan ilə Allah tərəfindən sınamaq üçün nazil edilənləri eyniləşdirmələri üzə çıxır. Beləliklə, bu, onların qadağan olunmuş bir işi gördüklərindən ötrü iki baxımdan günahlandırıldıqlarını ifadə edir. Belə buyrulmuş kimidir: Onlar kitablarda yazılmış və başqa yerlərdə olan sehr-caduya tabe oldular. Bu iki mələk isə Uca Allahdan bir sınaq kimi insanlara sehri öyrətmək üçün göndərilibler. Cadunu öyrənərək ona əməl edən kafir olur. Bunun müqabilində cadunu öyrənib cadu etməkdən çəkinən isə imanına sadiq qalır. Uca Allah qullarını istədiyi kimi sınamaq haqqına malikdir. Belə ki, O, Talut xalqını böyük çayla sınamışdır. Sehrlə möcüzəni bir-birindən ayırd etmək üçün də belə sınanmışlar. Çünki o dövrdə sehr çox geniş yayılmış, sehirbazlar qeyri-adi qarşılanan bir sıra oyunlar çıxarır və bunun nəticəsində də peyğəmbərlik haqqında insanlarda şübhə oyatmışdılar. Buna görə də Uca Allah həmin o iki mələyi insanlara müxtəlif sehr formalarını açıqlayıb başa salmaq və öyrətmək üçün göndərmişdi ki, bu yolla şübhələri aradan qaldırsınlar, narahatlıq törədən*

*şeylərdən insanları xilas etsinlər (Əlusi, Ruhul-Məani, 1, 306)*

*2. Təbəri demişdir ki: "Harut və Maruta nazil edilən şeyləri" buyruğundakı "ما: şeylər" kəlməsi "الذي: hansı ki" mənasındadır (yəni, bir şeyə yetişib çatan, qovuşan, vasil olan) Harutla Marut isə iki mələyin kimliyini açıqlayır. Əgər dediklərimiz məna qarışığlığına səbəb olarsa, və: Allahın mələkləri insanları əri arvadından ayıran şeyləri öyrətmələrini necə başa düşmək olar? Yaxud, Uca Allahın bunu mələklərə nazil etməsi mümkündürmü? deyə soruşularsa, belə cavab verilir: Allah qullarına verdiyi bütün əmrləri və qoyduğu qadağanları onlara öyrətmişdir. Sehr də Allahın Adəm oğullarından olan qullarına qadağan etdiyi şeylərdəndir. Uca Allahın o şeyləri bilavasitə adlarını bildirdiyi və Adəm oğullarından olan qulları üçün bir sınaq vasitəsinə çevirdiyi bu iki mələyə öyrətməsi qəbul edilməyəcək bir şey deyil. Bu iki mələk vasitəsilə Uca Allah insanları, qadağan etmiş olduğu ərlə arvadı bir-birindən ayırmaq və cadu ilə sınamaq istəmişdir. Bu yolla bu iki mələkdən öyrənməyi istəməyən mömin qullarını təmizləyəcək, əvəzində bu ikisindən cadunu və küfrü öyrənərək kafir olanları rüsvay edəcəkdir (Təbəri, Camiul-Bəyan, II, 426 ixtisarla, tədqiq: Mahmud Şakirindir)*

*3. Əbu Şuhbə əl-İsrailiyat vəl-Məvduat adlı əsərində deyir ki, nazil edilənlə nəzərdə tutulan şey iki mələyin insanlara öyrətmək üçün gəldikləri sehrdir. Bundan məqsəd isə insanların sehrdən çəkinmə imkanı əldə etmələrinə nail olmaq idi. Belə olduğu halda, o iki mələyin endirilməsinin səbəbi insanlara bir sıra sehr növlərini öyrətməkdi. Bu yolla insanlar sehrlə peyğəmbərlik arasında fərqi öyrənməliydilər.*

### *Kərim ayədən çıxarılan nəticələr*

*1. Kitab və Sünnədən üz döndərmək pisliyə, fəsada, zülmə və cadugərliyin yaranmasına səbəb olur.*

*2. Cadu (sehr) edən kafirdir. Cadunu (sehri) öyrənmək və etmək haramdır.*

*3. Cadunun bir sıra zərəri var. Fələq və Nas surələrinin oxunması ilə və yalnız Uca Allaha dua etməklə qarşısı alınır.*

*4. Kahini, falçını və sehirbazı təsdiq etmək haramdır. Çünki Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur: "Kim bir kahinə və yaxud bir falçının yanına gedərək onun dediyini qəbul edərsə, Məhəmmədə nazil nazil edilənə küfr etmiş olar" (Səhih hədis kimi Əhməd tərəfindən rəvayət edilmişdir)*

*"Hər kim ki, bir falçı yanına gedib ondan bir şey soruşarsa, qırx gün ərzində onun heç bir namazı qəbul olunmaz" (Muslim)*

*Falçı və kahin yalandan qeybi bildiklərini iddia edənlərə deyilir.*

*5. Həm falçı və həm də başqaları üçün (o kafir də olsa) tövbə qapısı açıqdır.*

*6. Uca Allah qullarından kimin asi, kiminsə itaətkar olduğunu müəyyənləşdirmək üçün qullarını xeyir və şər ilə sınayar. Uca Allah belə buyurmuşdur:*

***"…yoxlamaq mqsədilə Biz sizi şər və xeyirlə*[Σ130] *imtahana çəkərik. Və siz ancaq Bizim hüzurumuza qaytarılacaqsınız!" (Ənbiya, 21/35)***

---

[Σ130] *Xəstəlik, yoxsulluq, ehtiyac, və sağlamlıq, var-dövlət və cah-cəlalla* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 383)

## *İslamda çoxarvadlığın hökmü*

*Uca Allah belə buyurur:*

***"Əgər yetim qızlarla** [evlənəcəyiniz təqdirdə] **ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxarsınızsa, o zaman sizə halal olan başqa qadınlardan iki, üç və dörd nəfərlə nikah bağlayın! Əgər** [onlarla da] **ədalətlə dolanmağa əmin deyilsinizsə, o halda təkcə bir nəfər qadın və ya sahib olduğunuz kənizlə evlənin. Bu, ədalətli olmağa daha yaxındır" (Nisa, 4/3)***

*Bəziləri bu kərim ayənin kişi üçün çoxarvadlılığı (birdən çox qadınla evlənməyi) ancaq məhdud şərtlər çərçivəsində nə haram və nə də savab olmayan əməl kimi qəbul saydığını, bunun xəstəlik və qısırlıq şərtləri ilə bağlı olduğunu düşünürlər. Əgər onlar elm adamlarının bu kərim ayəni necə təfsir etdiklərini oxuyub bilsələr belə yanlış təsəvvürlərdən əl çəkərlər.*

*İbn Cəvzi öz Təfsirində belə deyir: təfsirçilər ayənin nazil olma səbəbi və onun şərhi barəsində fərqli nəzər nöqtələrinə malikdirlər.*

*a. Ərəblər cahiliyyə dövründə çoxsaylı qadınlarla evlənir və onlarla ədalətsiz davranmaqdan çəkinmir, yetimlərə qarşı münasibətdə də istənilən ədalətsizliyə yol verirdilər. Bu kərim ayədə onlara: yetimlərə qarşı ədalətsizlik etməkdən necə çəkinirsinizsə, qadınlarınız arasında ədalətsiz davranmaqdan eləcə çəkinin, deyilir.*

*Ayənin göstərilən anlamı İbn Abbas, Səid b. Cubeyr, əd-Dahhak, Qətadə, əs-Suddi və Muqatildən rəvayət edilmişdir.*

*b. Digər bir açıqlamaya görə ayənin mənası belədir: Ey yetimlərə himayədarlıq edənlər, əgər yetim qızlarla nikah bağladığınız zaman onlara verəcəyiniz kəbin haqqı ilə bağlı*

*ədalətli olmayacağınızdan qorxursunuzsa, onlardan başqa, Allahın sizə halal etdiyi digər qadınlarla evlənin.*

*Ayənin aşağıdakı mənası Aişədən (A.r.o.) rəvayət edilmişdir:*

*Buxari və Muslimin rəvayətinə görə Urvə b. əz-Zubeyr Aişəyə (A.r.o.) Uca Allahın:* **"Əgər yetim qızlarla ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxarsınızsa…"** *buyruğu haqqında sual verdikdə, o belə cavab vermişdir: «Ey bacım oğlu! Burada bəhs edilən məsələ himayəsində olan və malı da onun malı ilə bir yerdə olan, malı və gözəlliyi hamisinin xoşuna gəldiyindən, ona bir başqasının verə biləcəyinə (ədalətli başlıq olmamaqla) bənzər bir nikah haqqı verməklə evlənmək istədiyi yetim qız barəsindədir. Yetim qızlara qarşı ədalətli davranmaları üçün və onlara nikah haqqı ən yüksək miqdarda nəzərdə tutulmadığı hallar üçün belə nikahlar qadağan edildi. Bu səbəbə görə belə kişilərə belələrindən başqa, qalan digər qadınlardan özlərinə halal olanları ilə nikah bağlamaq əmr olundu (Bax: Zədul-Məsir, II, 6)*

*Qurtubi demişdir ki, Quran elmlərilə məşğul olan hər kəs Uca Allahın:* **"Əgər yetim qızlarla ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxarsınızsa…"** *buyruğunun əksinə olacaq məfhumun alınmayacağını alimlərin bəyəndiyi rəyə əsasən qəbul etmişdir. Çünki yetim qızlara qarşı münasibətində ədalətli olmaqdan qorxmayan şəxsin, eynilə bu cür qorxan şəxs kimi, birdən çox, iki, üç və ya dörd qadınla evlənə biləcəyi alimlərin ümumi rəyi ilə qəbul edilmişdir (V, 13)*

*Məhz bu, kərim ayənin belə işlərdən qorxan insanlara cavab kimi nazil olduğunu və hökmünün daha ümumi məna kəsb etdiyini göstərir.*

*Uca Allahın:* **"…Əgər ədalətlə dolanmağa əmin deyilsinizsə, o halda təkcə bir nəfər qadınla… evlənin"**

*buyruğunun mənasına gəlincə, Şəvkani bunun təfsiri haqqında bunları söyləyir:*

*Yəni, əgər siz günləri bölüşdürmək və buna bənzər məsələlərdə zövcələriniz arasında ədalətlə davrana bilməyəcəyinizdən qorxursunuzsa, bir qadınla nikah bağlayın. Bu göstəriş ədalətsiz olmaqdan qorxan şəxslər üçün birdən artıq qadınlarla evlənməyin qadağan edildiyini də bildirir.*

***"… və ya sahib olduğunuz kənizlə evlənin…".** Yəni, kişi ədalətin məhdudlaşdırması nəzərə alınmadan kənizləri ilə evlənə bilər*[Σ131]*.*

***"…Bu, ədalətli olmağa daha yaxındır".** Yəni, əgər siz zövcələriniz arasında ədalətli olmaqdan qorxursunuzsa, sizə əmr olunmuş bu vəziyyətdə haqsızlıq etməmə ehtimalınız daha yüksəkdir (Bax: Fəthul-Qadir, I, 421)*

*Qurani Kərimdə (zövcələr arasında) ədalət anlayışı dolanacaq xərci və gecələməklə bağlıdır. Ər arvadlarının hər birinə digərinə verdiyi xərcliyin bir mislini verməli və onların hər birinin yanında, gəldikləri qərara görə, bir və ya bir gecədən çox qalmaqla ədalətli bölgüyə riayət edilməlidir. Qəlbin sevgi və cinsi yaxınlıq istəməsinə gəlincə, bu insandan asılı olan bir şey deyildir. Bundan ötrü Uca Allah belə buyurur:*

***"Siz nə qədər çox istəsəniz də, heç vaxt arvadlar arasında ədalətlə rəftar etməyi bacarmazsınız. Barı, [**birisinə**] tamamilə meyl göstərib, digərini asılı vəziyyətdə***[Σ132]

---

Σ131 Qeyd edim ki, kölə (kəniz) və qul anlayışları bu gün də ədəbiyyatımızda, bəzən az qala eyni mənalarda işlədilməsinə baxmayaraq, aralarında prinsipial fərqlərə malikdir. Belə ki, insan Allahın qulu olduğu kimi, heç kimə qul ola bilməz. Həmçinin kölə, kəniz kimi kiməsə mənsub olan insanlar öz insani hüquqlarını itirmirlər.

Σ132 *Nə ərli kimi ərli, nə də boşanmış kimi boşanmış* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 189)

***qoymayın[Σ133]. Əgər özünüzü islah edib** [belə hərəkətlərdən]* ***çəkinsəniz** [Allah sizi bağışlar]. **Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!" (Nisa, 4/129)***

*İmam Şəvkani bu ayənin təfsirində aşağıdakıları söyləyir ki, Uca Allah, ən kiçik yoldan çıxmanın olmadığı halda belə qadınlar arasında ədalətlə davranmanın kişilər üçün mümkün olmadığını xəbər verir. Çünki insan təbiəti birinə digərinə nisbətən daha çox meyl edir, birini o birisindən daha çox sevir, digərini daha az sevir. Bu isə, əslində yaradılışla bağlı məsələdir və bu barədə onlar ürəklərinə hakim olmaya bilərlər və bərabərlik saxlamaq həddində özləri ilə bacarmaya bilərlər. Buna görə Aişə (A.r.o.) belə deyib: «Peyğəmbər (sallallahu əleyhi və səlləm) xanımları arasında bölgü aparar, ədalətli davranar və sonra da belə deyərdi: "Allahım, malik olduğum imkanlar çərçivəsində mənim bölgüm budur. Mənim sahib ola bilmədiyim, Sənin isə sahib olduğun məsələlər barədə məni qınama". Bununla o, qəlbini nəzərdə tutur». Hədisin sənədi səhihdir.* [*Qeyd edim ki, əl-Əlbani əl-İrva adlı əsərində hədisin zəif olduğunu bildirir*].

*Bu məsələlər haqqında çox çalışsalar və həddini aşsalar da, bu işə layiqincə gücləri çatmayacağından ötrü Uca Allah onlara bir-birilərinə tamamilə meyl etmələrini qadağan etmişdir. Çünki belə bir işi tərk etmək və zülmdən tamamilə qurtarmaq onların edə biləcəyi bir şeydir, imkanları daxilindədir. Ər arvadlarından birinə tam meyl edərkən, o birisinin nə ərli və ya nə də boşanmış vəziyyətdə, havadan asılı halda qalması haqqında düşünməlidir. Bu buyruğu ilə Uca Allah zövcələri havadan asılı qalan və əlində dəqiq bir qərarı olmayan kimsələrə bənzədir.*

---

[Σ133] Sahibləri tərəfindən atılmış minik heyvanları kimi (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 53)

*"… **Əgər özünüzü islah edib** [belə hərəkətlərdən] **çəkinsəniz** [Allah sizi bağışlar]" buyruğu qadınlara zəruri dolanacaq xərcliyi verməyə və aralarında ədalətli davranmaya işarə edir. Vəzifəniz olmasına baxmayaraq tərk etdiyiniz və dolayısıyla pozduğunuz halları düzəldərək sizə qadağan olunmuş bir tərəfə tamamilə meyl etməkdən **"…özünüzü islah edib** [belə hərəkətlərdən] **çəkinsəniz** [Allah sizi bağışlar]. **Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!"** O vaxt sizi qusurlarınızdan ötrü məsuliyyətə cəlb etməz (Bax: Fəthul-Qadir, I, 521)*

*Hafiz İbn Kəsir ayənin təfsirində bunları söyləyir: "Belə ki, ey insanlar, siz, bütün nəzər nöqtələri baxımından, qadınlar arasında bərabərlik yarada bilməzsiniz. Hərəsinə bir gecə vaxt ayırmaqla belə sevgi, şəhvət və cinsi əlaqə baxımından mütləq fərqlilik olacaqdır".*

*Beynəlxalq aləmdə tanınmış liderlərdən olan Anna Bizant deyir ki: "Biz bu işləri ən düzgün ədalət tərəzisi ilə çəkməli olsaq, qadınların geyim və qida ehtiyaclarını təmin edən və onları qoruyan İslam formasındakı çoxarvadlılığın çəkidə qərbdəki fahişəlik sistemindən daha ağır gələcəyini açıq-aydın görəcəyik. Çünki qərbdəki **bu sistem** kişilərin yalnız seksual ehtiyaclarını ödəmək üçün qadınlardan arvad kimi istifadə eməyə, ehtiyaclarını təmin etdikdən sonra isə belə qadını küçəyə atmağa imkan verir".*

*Qeyd etməliyəm ki, bu hələ kafir bir qadının etdiyi şahidlikdir. Fəzilət isə düşmənlərin şahidliyi ilə qəbul ediləndir.*

***Xülasə***

*1. Birdən çox evliliyi (çoxarvadlılığı) nə savab və nə də haram hesab etməyən, sonsuz hikmətə malik olan İslam kişilərdən əvvəl qadınların xeyrinə olan bir dindir. Bu din*

*qızların və dul qadınların ehtiyaclarını təmin edən şəxslərin yanında ehtiyac içində dolanmaqdansa, onlara ərlərinin evlərində şərəfli bir həyat sürmək üçün zəmanət verir.*

*2. Birdən çox qadınla evlənmənin əksinə olan təbliğat heç şübhəsiz ki, nəslin azalmasının səbəbini təşkil edir. İslam düşmənləri də müsəlmanların sayını azaltmaq və onları zəlil etmək uğrunda çalışırlar. Eyni zamanda evdə qalan qızların və dulların sayının soxluğu onları fitnə-fəsada düşməyə vadar edir. Çünki statistik məlumatlara görə qadınlar kişilərdən sayca xeyli çoxdur. Xüsusilə kişilər müharibələrdə və cəbhələrdə ölümə məruz qaldıqları zamanlarda belə fərqlər qadınların hesabına daha da artır. Birinci Dünya Müharibəsindən sonra qadınlar Almaniyada keçirdikləri bir mitinqdə çoxarvadlılığa icazə verilməsini irəli sürmüşdülər*[Σ134]*.*

*3. Birdən çox qadınla evlənmək bu zamanımıza da müvafiqdir. Çünki cəmiyyətlər onlarda olan insanların sayına görə dəyərləndirilirlər. Əhalinin sayı artdıqca gücləri də artır. Əfqanıstanda, İranda. Fələstində, Livanda, İraqda və digər İslam ölkələrindəki müharibələr kişilərin azalması, ərlərini itirən qadınların çoxalması ilə nəticələnmişdir*[Σ135]*. İslam müsəlmanlardan belə qadınları tərk etməmələrini istəyir.*

---

[Σ134] Nəzərə alsaq ki, həm birinci dünya müharibəsindən əvvəl və həm də ondan sonrakı dövrlərdə bütövlükdə bütün yer kürəsində irili-xırdalı müharibələr, kütləvi qırğınlar fasiləsiz olaraq, bir qədər az-bir qədər çox intensivliklə həmişə davam edir, xüsusilə ikinci dünya müharibəsi dövründə qısa müddət ərzində əlli milyona yaxın insan tələf olmuşdur və onların mütləq əksəriyyəti kişilər idi, onda, bu həqiqətin nə dərəcədə gerçək olması problemi dərk etmək istəyənlərə aydın olar.

[Σ135] Bundan başqa hər il dünyada baş verən qəzalar nəticəsində ölənlərin böyük əksəriyyətin artım qabiliyyətli kişilərin olması beynəlxalq ictimaiyyətin gözü qarşısındadır. Bunların çoxu sosial baxımdan fəal, nəsli artırmağa qabil, evli insanlardır. Bu kişilərin cəmiyyətdən ayrılması onların zövcələrini ərsiz qoyur və bir sıra ictimai fəsadlar yaradır. Bütün bunlar

## *Kişilərin qadınlarla təklikdə qalmasının təhlükəsi*

*Uca Allah buyurur ki:*

***"Doğrudan da** [qadın] **ona meyl salmışdı. Əgər Rəbbinin dəlilini** [xəbərdarlığını] **görməsəydi, ona meyl edərdi. Biz pisliyi və biabırçılığı** [zinanı] **ondan sovuşdurmaq üçün belə etdik. O, həqiqətən, Bizim sadiq bəndələrimizdəndir!" (Yusuf, 12/24)***

*Təfsirçilər Yusif əleyhissəlamın o qadına olan meylinin əsli haqqında müxtəlif baxışlara malikdirlər.*

*Bir nəzər nöqtəsinə görə Yusif əleyhissəlamın meyl etməsi qadının meyli növündəndir. Əgər Allah onu qorumasaydı, o, bu işi edəcəkdi.*

*İkincisi, qadın Yusifin onunla bir olmasını istəmişdi. Yusifin də ona meyli vardı. Yəni onu özünə arvad etmək təmənnasına düşmüşdü.*

*Üçüncüsü, ayədə ifadə olunan mənaya görə Yusif (ə.) tərəfindən qadına həm meyl və həm də işi sonraya saxlamaq (təxirə salmaq) niyyəti vardı. Həqiqətən, o qadın ona artıq meyl etmişdi. Əgər Rbbinin dəlilini görməsəydi, o da ona meyl edəcəkdi. Lakin dəlili görüncə, Yusif (ə.) bu niyyətindən çəkindi. Buna görə, burada "لولا ...səydi" ədatı bu barədə cavabın öncədən verildiyini bildirir. Mənası da budur ki: əgər filankəs səni xilas etməsəydi, sən həlak edilənlərdən olardın.*

*Dördüncü nəzər nöqtəsinə görə, o, qadını özündən uzaqlaşdırmaq üçün onu vurmaq istəmişdi. Rəbbindən*

---

çoxarvadlılığın beynəlxalq hüquq normalarına müvafiq şəkildə tənzimlənməsi bəşəriyyətin sağlam inkişafına saflaşdırıcı təsir göstərər.

*gördüyü dəlil isə bu idi. Uca Allah ona bildirir ki: əgər qadını vursan, bu sənin öz əleyhinə bir dəlil olacaq. Qadın deyəcək ki, sən ondan bir şey istəmisən və mən də bunun əleyhinə olduqda, o məni vurdu (Bunu İbn Ənbəri nəql etmişdir. Bax: İbn Cəvzi, Zədul məsir IV, 203)*

*Qeyd edim ki, bu son baxışa Məhəmməd Rəşid Rıza Təfsirul-Mənarda üstünlük vermişdir. Eyni şəkildə bu açıqlamanı verən Əbu Bəkr əl-Cəzairi də bu nəzər nöqtəsini üstün sayaraq demişdir:* ***"Doğrudan da [****qadın****] ona meyl salmışdı. Əgər Rəbbinin dəlilini görməsəydi , ona meyl edərdi…"*** *Yəni, qadın uzun müddət davam edən müxtəlif tədbirlərinə baxmayaraq, istədiyini ona qəbul etdirə bilmədikdə, ona şər atmaq qərarına gəldi. O da özünü qorumaq üçün qadını vurmaq istədi. Ancaq Uca Allah ona öz nəfsinə məxsus bir dəlil göstərdi və bu səbəbə görə Yusif (ə.) qadına əl vurmadı*[2]*. Bunun əvəzinə evdən çölə qaçmağı üstün tutdu. Qadın da onu geri döndərmək məqsədilə onun arxasınca gedərək ona çatdı (Bax: Əysərut-Təfəsir, II, 391)*

*İfadə ardıcıllığının dəlalət etdiyi nəzər nöqtəsi də budur. Bundan əvvəlki kərim ayədə aşağıdakılar buyurulur:*

***"Evində olduğu qadın [****Züleyxa Yusifi****] tovlayıb yoldan çıxartmaq***[Σ136] ***istədi və qapıları bağlayaraq: "Di gəlsənə!" – dedi…" (Yusuf, 12/23)***

*Burada "tovlayıb yoldan çıxarmaq" qadının Yusifdən qapıları bağlamasından sonra özü ilə birgə olmasını istəməsi mənasını verərək, onun bu istəyini aşkar edir və Yusifə: tez*

---

[2] Qeyd etməliyəm ki, buna görə ***"Doğrudan da [****qadın****] ona meyl salmışdı"*** anlamındakı ifadənin sonunda vəqf etmək (yəni, dayanmaq – red.) lazımdır. Daha sonra cümlə: "***Əgər Rəbbinin dəlilini görməsəydi, ona [****qadına****] meyl edərdi"*** – deyə davam etdirilməlidir. Beləliklə, oxucu Yusif əleyhissəlamın belə bir meylə sonadək qapılmadığını anlayır.

[Σ136] *Onunla yaxınlıq etmək*(Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 297)

*yanıma gəl, çünki mən səninlə olmaq istəyirəm demişdi. Yusif əleyhissəlam isə:*

***"…Mən** [sənin bu hərəkətindən]* ***Allaha sığınıram. Axı o** [sənin ərin]* ***mənim ağamdır. O mənə yaxşı baxır. Həqiqətən, zülm edənlər nicat tapmazlar!" –*** *deyə cavab verdi.*

*Yusif əleyhissəlamın bu kəskin cavabı qadının sifətinə bir şillə kimi dəymiş, niyyətini boşa çıxarmış və əmrinə qarşı olmuşdu. Xüsusilə, o böyuk bir adamın zövcəsi olan hörmətli bir xanım idi. Yusif isə onun yanında xidmət edən bir cavan oğlandı. Buna görə ələ almaq məqsədi ilə onu vurmaq istədi. Düşünürdü ki, əgər yumşaqlıqla, cəlbedici sözlərlə onu ələ ala bilmədisə, bu yolla istədiyinə nail olsun.*

*Qadının gəlib ona çatmasına başqa bir ayədə verilmişdir. Uca Allah buyurur:* ***"…Biz pisliyi və biabırçılığı** [zinanı]* ***ondan sovuşdurmaq üçün belə etdik…" (Yusuf, 12/24)***

*Buna görə, ondan bədxahlığın təsirini uzaqlaşdıran Uca Allah idi. Bəhs edilən bədxahlıq isə Yusifin də qadını vurması olacaqdı. O, qadını vursaydı, bu onun ancaq zərərinə olardı. Belə olduqda onu ittiham etmək asanlaşardı. Uca Allah ondan (hörmətli şəxsin zövcəsi ilə zina etmək demək olan) çirkinliyi yox etmiş və qabaqlamışdı. Buna səbəb kimi Uca Allah:* ***"…O, həqiqətən, Bizim sadiq bəndələrimizdəndir!" (Yusuf, 12/24) –*** *deyə buyurmuşdur.*

*Çünki Yusif aleyhissəlam Allahın xilas etdiyi, Öz risaləti üçün seçdiyi, pisliklərdən və hər cür biabırçılıqlardan qoruduğu qullarından idi. Yusif əleyhissəlamın pisliyə və çirkinliyə məruz qalmasına imkan verilmədi. Uca Allah bu bəlanı ondan uzaqlaşdırdı. Bundan ötrü Uca Allah:* ***"…Biz pisliyi və biabırçılığı** [zinanı]* ***ondan sovuşdurmaq üçün belə etdik…" –*** *deyə buyurursa da, pislikdən və biabırçılıqdan*

*uzaq tutaq deyə buyurmamışdır. Bu isə Yusif əleyhissəlamın özünün də böyük bir adamın zövcəsinə eyni şəkildə meyl etmək sevdasına düşdüyünü deyənlərin baxışlarını inkar edir.*

*Buradakı "meyl etmənin" döymək kimi təfsir edilə biləcəyinin digər bir dəlili də budur: Yusif əleyhissəlam onu döymək istəyən qadının əlindən xilas olmaq məqsədilə qaçmaq istəmişdi. Qadın isə onu tutmaq və güclə onu qucaqlamaq üçün gedib arxadan ona çatdıqda onun köynəyindən yapışarkən o cırılmışdı. Bu Uca Allahın:* ***"…hər ikisi qapıya tərəf cumdu.*** *[Züleyxa]* ***onun köynəyini arxadan cırdı…" (Yusuf, 12/25)*** *buyruğunda bildirilir.*

***Bu hekayətdən çıxarılan nəticələr***

*1. Xidmətçi, sürücü və digər kişini qadınla bir yerdə qalmaqdan çəkindirmək, onun otağına girərək onunla tək qalmasının yolveriməzliyini başa salmaqdır. Beləliklə, qadınların da, böyük vəzifə sahibinin zövcəsinin düşdüyü vəziyyətə bənzər bir vəziyyətə düşməsinin qarşısı alınır. Xüsusən də, ev sahibi (evin kişisi) evdə olmadığı hallarda. Digər tərəfdən, qadınların da özgə kişilərlə bir yerdə olması, xüsusilə də evdə işləyən xidmətçilər və sürücülərlə tək qalması yolverilməzdir.*

*2. Sürücülər, xidmətçilər, müəllimlər Allahın qoruduğu Yusif ilə müqayisə edilə bilməzlər. Onlar Rəbbin mərhəməti ilə qorunmadıqları müstəsna həyasızlıqlara düçar ola bilərlər.*

*3. Əzizin zövcəsinin düşdüyü ərinə xəyanət vəziyyətindən qadınları çəkindirməkdir. Onun bu vəziyyəti haqqında xəbər digər qadınlara da çatmış və onlar həmin qadını yolundan azmış bir şəraitdə görmüşlər.*

*4.Yusif əleyhissəlamın davranışına uyğun olaraq zina və zinakarlığa yönəldən səbəblərdən uzaq durmaq lazımdır. Xüsusilə, dini bu işləri ona haram edən müsəlman üçün vəziyyət belədir.*

## *İsa əleyhissəlam səmadadır və diridir*

*Uca Allah İsa əleyhissəlam haqqında aşağıdakıları buyurur:*

***"O vaxt Allah buyurdu: "Ya İsa, həqiqətən, Mən sənin ömrünü tamam edib Öz dərgahıma qaldıraram, səni kafirlərdən pak edərəm…". (Ali-İmran, 3/55)***

*Bəzi adamlar bu kərim ayənin zahiri deyilişindən yanlış olaraq İsa əleyhissəlamın vəfat etməsi və ölməsini qəbul edə bilərlər. Əgər mötəbər təfsirçilərin bu kərim ayənin təfsiri zamanı etdikləri açıqlamalara diqqət yetirsələr, belə bir yanlışlıq aradan qalxar. Ayə haqqında təfsirçilər fərqli nəzər nöqtələrinə malikdirlər:*

*1.Yanlışlıq,* ***sənin ömrünü tamam edib*** *ifadəsindəki "ömrünü tamam etməni" öldürmə kimi başa düşməkdən və bunun səmaya yüksəlməzdən əvvəl olacağını qəbul etməkdən qaynaqlanmışdır. Buna aşağıdakı kimi cavab vermək olar:*

*Uca Allahın:* ***sənin ömrünü tamam edib*** *buyruğu vaxtı müəyyənləşdirmədiyi kimi, bunun keçmişdə olduğunu da ifadə etmir. Əlbəttə, Uca Allah onun ömrünü bir gün tamamlayacaq. Lakin bu işin keçmişdə olduğuna dair bir dəlil yoxdur. Uca Allahın:* ***səni… Öz dərgahıma qaldıraram*** *buyruğunun* ***sənin ömrünü tamam edib*** *buyruğuna aidiyyətinə də dəlil olacaq bir əlamət yoxdur. Çünki dilçilərin böyük əksəriyyətinin rəyinə görə "وَ və" nə tərtib baxımından (aid olanla aid edilən arasında ardıcıllıq), nə də onların cəmi*

*baxımından (ikisinin bir yerdə olmasını) ifadə etmir. "Və" bağlayıcısı ancaq məsələdə ortaqlığı bildirir. Buna sübut isə Uca Allahın bu buyruğudur: "[Qiyaməti inkar edən]* ***belə deyirlər: "Dünya həyatımızdan başqa heç bir həyat yoxdur; ölürük və dirilirik…". (Casiyə, 45/24)***

*Beləliklə, kərim ayə "və"nın tərtib rolunu oynamadığını göstərir. Çünki burada "və" bağlayıcısından sonra gələn, ifadə baxımından isə, ondan öncə gəlməli olan "həyat" kəliməsi qoşulduğu "ölüm" sözündən əvvəl buyurulur.*

*Buna görə ayənin mənası belə olmalıdır: "Mən səni Öz dərgahıma qaldıraram və ömrünü tamam edərəm". Başqa mötəbər dəlillərə əsasən İsanın (ə.) səmada yaşadığı, yerə gəlib Dəccalı öldürəcəyi, xaçı sındıracağı və, bir qədər sonra göstərəcəyimiz kimi, daha başqa vəzifələr yerinə yetirəcəyi, bunlardan sonra isə Allahın onun həyatını tamam etdirəcəyi (yəni canını aldıracağı) məlumdur. (Bax: Ədvaul-Bəyan, Zədul-Məsir və digər təfsirlər)*

*2. İkinci açıqlamaya görə, buradakı "ömrünün tamam edilməsi" deyimindən məqsəd İsanın (ə.) səmaya yüksəldilməsi üçün yuxu mənasındakı ölümə işarə etməkdir. Ona görə ayəni: "Mən səni yatıracaq və dərgahıma qaldıracağam" kimi başa düşmək olar.*

*Qurani Kərimdə "ölüm" sözünün "yuxu" əvəzində işlənildiyini bu buyruqlarda görürük:*

***"Sizi gecələr yuxuya daldıran***[Σ137]***, gündüz isə nə etdiyinizi bilən Odur…". ((Ənam, 6/60)***

---

[Σ137] *Və bu minvalla sizi bir növ ölüm halına salıb hiss-həyəcandan məhrum edən* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 215)

***"Allah** [əcəli çatan kimsələrin] **canlarını onlar öldüyü zaman, ölməyənlərin** [hələ əcəli çatmayanların] **canlarını isə yuxuda alar…"**[Σ138]**. (Zumər, 39/42)***

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) də yuxudan oyandıqda belə deyərdi: "Bizi öldürüb yenidən dirildən və ölümdən sonra dirildərək hüzurunda toplayan Allaha həmd olsun!" (Buxari)*

*Həm Quranda, həm də Sünnədə "ölüm" kəlməsinin "yuxu" kimi işlədilməsinin doğruluğu sübut olunmuşdur. Buna görə İsa əleyhissəlamın yuxuda olduğu halda səmaya yüksəlməsi, Həsən Bəsirinin açıqladığı kimi, ona qarşı şəfqətli bir münasibətin nəticəsidir.*

*3. Üçüncü təfsir: İbn Əbi Hatim Qatədənin belə dediyini eşitmişdir: Bu buyruq irəli keçən və arxaya saxlanılanlar (yəni, cümlə üzvlərində yerdəyişmə olması) qəbilindəndir. Yəni, mən səni qaldıracağam və sonra da qiyamət günündən əvvəl yer üzünə göndərib orada canını alacağam. Bu, yerə qayıtmaq qiyamətin əlamətlərindən biri olacaqdır.*

*Bu, əl-Fərra ilə əz-Zəccacın da nəzər nöqtəsidir. Onun öldürüləcəyinin özünə bildirilməsinin faydası da səmaya qaldırılacağının ölümünə mane olmayacağını ona anlatmaqdan ibarətdi.*

*4. Dördüncü açıqlamaya görə "sənin ömrünü tamamlayıb" buyruğundakı "ömrünü tamamlamaq" (vəfat etdirmək) ifadəsi bir şeyi ələ keçirib aldığı və əvəzini ödədiyi*

---

Σ138 **"***(Çünki yuxu da ölüm kimi bir şeydir, yuxu zamanı ruh bədəni tərk edər).* **Ölümünə hökm olunmuş kimsələrin canlarını** *(ruhlar aləmində)* **saxlayar** *(onların ruhu bir daha bədənlərinə qayıtmaz, beləliklə də bədən ölüb gedər).* **Digər** *(ölümünə hökm olunmamış)* **kimsələrin canlarını isə müəyyən bir müddətədək** *(əcəlləri gəlib çatıncaya qədər yuxudan oyandıqda bədənlərinə)* **qaytarar. Həqiqətən, bunda düşünən bir qövm üçün əlamətlər vardır!"** ***(Zumər, 39/42)***

*zaman işlədilən "təvaffi – vermək, ödəmək" felindəndir, ismi feildir. Beləliklə, ərəblər: "Filan adam borcunu tamam aldı" deyərkən, bu feli işlədirlər. İbn Quteybə Ğaribul-Quran adlı əsərində: "sənin ömrünü tamam edəcəyəm" deyimi – "ölməmişdən yerdən səni götürüb aparacağama" bərabərdir. (Bax: Yasir Əhməd əş-Şimali, Muhimul-İxtiləf beynə Əyətil-Quran)*

*İmam İbn Cərir ət-Təbəri deyib ki: "Bilindiyi kimi, əgər Uca Allah onu öldürmüş olsaydı, onu ikinci dəfə öldürməzdi. Çünki, o təqdirdə onu iki dəfə öldürmüş olardı. Belə olduqda, ayənin izahını belə vermək olar: "Ey İsa! Mən səni yer üzündən götürüb öz dərgahıma qaldıracaq və səni, peyğəmbərliyini inkar edən kafirlərdən təmizləyib pak edəcəyəm". (Bax: Təbəri, VI, Cəmiul-Bəyan, 460, Mahmud Şakirin tədqiqatı ilə)*

*Qeyd edim ki, nəzərdən keçirilən bütün formalarda ayənin təfsiri doğrudur. Bunların arasında daha üstün dəyərləndirilən dördüncü təfsirdir. O isə, Uca Allahın:* ***"Sənin ömrünü tamam edib Öz dərgahıma qaldıraram"*** *buyruğunda məqsədinin: "sən həyatda olduğun halda ölmədən və yuxuya dalmadan yerdən şəxsiyyətini götürəcəyəm" ifadəsinin olduğunu bildirməkdir. "Öz dərgahıma qaldıracağam" buyruğu isə öldürmənin növünü bəyan etməsidir. Az öncə qeyd etliyimiz kimi, Təbəri və Quteybənin üstünlük verdikləri nəzər nöqtəsi budur. Əlusinin Ruhul-Məani adlı təfsirində bildirdiyi İbn Abbasdan gələn səhih rəvayət də elə budur.*

*Buna görə Uca Allahın:* ***sənin ömrünü tamam edib*** *buyruğunun "səni öldürəcəyəm" mənasında yozulmasına ehtiyac qalmır. Uca Allahın:* ***"Səni qaldıraram"*** *buyruğu da bəzilərinin zənn etdiyi kimi, "ruhunu qaldıraram" deməyi bildirmir. Bunun izahı isə az əvvəl qeyd etdimiz "öldürmək" mənasına dair verdiyimiz müxtəlif təfsir formalarındadır. Doğrusunu ən yaxşı bilən Allahdır.*

## *İsa əleyhissəlamın öldürülmədiyinə dəlil olan ayələr*

*1. Uca Allah buyurur ki: [Onların lənətə düçar olmalarının bir səbəbi də:]* ***"Biz Allahın elçisi Məryəm oğlu əl-Məsihi öldürdük", - deməleridir. Halbuki onlar İsanı nə öldürdülər, nə də çarmıxa çəkdilər. Onlarda yalnız belə bir təsəvvür yarandı. Bu haqlı ixtilafda onlar onun*** *[şəxsən öldürülməsi]* ***barəsində, əlbəttə, şəkk-şübhə içərisindədirlər. Onların buna dair heç bir məlumatı yoxdur. Onlar ancaq zənnə qapılırlar. Həqiqətdə onu*** *[İsanı]* ***öldürməmişlər. Xeyr, Allah onu Öz dərgahına qaldırmışdır. Şübhəsiz ki, Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!" (Nisa, 4/157-158)***

*Uca Allahın: "Həqiqətdə onu (İsanı) öldürməmişdilər. Allah onu Öz dərgahına qaldırmışdır" buyruğu onun öldürülməsini inkar etməklə səmaya yüksəldildiyini göstərir. Bu ayə Məsih əleyhissəlamın diri olduğu halda səmaya qaldırılmasına aid qəti dəlildir. Onların şərh edilməsinə isə ehtiyac yoxdur. Çünki, "بل xeyr (əksinə)" ifadəsi inkardan sonra gəlircə, deməli ondan sonra gələn ifadənin də qabağında gələn inkarı təsbit etməsi mənasını bildirir. Əgər qaldırmaq təkcə ruhun yüksəldilməsi kimi yozularsa, onda bu daha əvvəlcədən rədd edilmiş öldürülmə və asılma ilə ziddiyyət təşkil etmir. Çünki öldürməklə ruhun yüksəldilməsinin eyni cür başa düşülməsi mümkündür. Həm də bu zaman belə bir açıqlama əvvəlki inkarın rədd edilməsini zəruriləşdirir.*

*Buna görə kərim ayədə İsa əleyhissəlamın ruhu və canlı bədəni ilə birgə səmaya qaldırılması məsələsi olduqca aydındır.*

*2. Uca Allah belə buyurur:* **"Kitab əhlindən**[Σ139] **elə bir kəs olmaz ki, ölümündən əvvəl ona [***İsaya***] iman gətirməsin, lakin o, [***İsa***] qiyamət günündə onların əleyhinə şəhadət verəcəkdir" (Nisa, 4/159)**

*"Ölümündən əvvəl" ifadəsi İsa əleyhissəlamın axır zamandakı ölümündən əvvəli bildirir. Belə ki, bu şərhi İbn Abbas, Abdurrahman b. Zeyd, Əbu Hureyrə, Həsən əl-Bəsri və Qatədə rəvayət etmişlər. Buna İbn Cərir ət-Təbəri də üstünlük vermiş, İbn Kəsir isə belə demişdir:*

*Şübhəsiz ki, bu baxış haqq olan bir baxışdır. Yəhudilərin İsa əleyhissəlamı öldürüb xaça çəkilmələrini və savadsız xristianlardan yəhudilərin bu dediklərini qəbul edənlərin iddialarının batil olduğunu göstərən ayələrin daşıdığı məqsəd bundadır. Beləliklə, məqsəd – İsa əleyhissəlamın varlığını, Allah dərgahında olduğunu və qiyamət günündən öncə yer üzünə gələcəyini bildirməkdir. (I, 577).*

*3. Uca Allah buyurur:*

**"Şübhəsiz ki, o [***İsanın zühuru***], qiyamət saatı haqda bir bilgidir…" (Zuxruf, 43/61)**[Σ140]

*İbn Abbac tərəfindən nəql edilən mərfu (yəni, Peyğəmbərə (sallallahu əleyhi və səlləm) isnad edilən – red.) rəvayətə görə Uca Allahın:* **"Şübhəsiz ki, o [***İsanın zühuru***], qiyamət saatı haqda bir bilgidir..."** *buyruğu haqqında Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə demişdir: "Yəni qiyamət günündən öncə Məryəm oğlu İsanın zühur etməsi…" (İmam Əhməd və Hakim rəvayət etmiş, Hakim səhih olduğunu bildirmiş, Zəhəbi isə onunla razılaşmışdır)*

---

Σ139 *Yəhudilərdən və xaçpərəstlərdən* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 192)

Σ140 Ayə türk dilindən müstəqil olaraq tərcümə edilmişdir.

*İbn Kəsir deyib ki, bu şərhi digər bir oxunuş da təsdiqləyir. Çünki başqa qiraətdə* ***"Şübhəsiz ki, o,***[Σ141] ***qiyamət saatı üçün bir əlamətdir…"****. Mücahid də demişdir ki, İsanın (ə) qiyamət üçün bir əlamət olması və qiyamət günündən əvvəl Məryəm oğlu İsanın zühur edəcəyini bildirir.*

*Qeyd etməliyəm ki, bu kərim ayələr İsa əleyhissəlamın diri qalmasının sübutudur. Həm də o qiyamət əlamətlərindən biridir. Kitab əhli onun Allahın qulu və elçisi olmasına iman gətirəcək və İslam şəriətini qəbul edəcəklər.*

## *İsa əleyhissəlamın zühurunu bildirən hədislər*

*1. Peyğəmbər (sallallahu əleyhi və səlləm) buyurub ki: "Nəfsim əlində olana and olsun ki, Məryəm oğlunun aranızda ədalətli hakim kimi nazil olacağı vaxt çox yaxındır. O, xaçı sındıracaq, donuzları məhv edəcək, vergini*[Σ142]*ləğv edəcək, var-dövlət bol olacaqdır. Belə ki, heç kim onu götürməyəcək. Hətta adicə bir səcdə belə (hər kəs üçün) dünyadan və dünya malından xeyirli olacaqdır. Sonra isə Əbu Hureyrə dedi ki, əgər istəsəniz:* ***"Kitab əhlindən elə bir kəs olmaz ki, ölümündən əvvəl ona (İsaya) iman gətirməsin, lakin o, (İsa) qiyamət günündə onların əleyhinə şəhadət verəcəkdir" (Nisa, 4/159)*** *buyruğunu oxuyun". (Buxari)*

*Bu hədis İsa əleyhissəlamın səmada olduğunu və yaşadığını, axır zamanda yerə nazil ediləcəyinə və gələcəyi vaxt isə İslam şəriəti əsasında hökm verəcəyinə aydın bir dəlildir.*

---

[Σ141] İsa peyğəmbər (ə)

[Σ142] Kitabın türk variantında bu söz "***cizye"*** kimi verilmişdir. Abdullah Yeginin "Yeni lüğat"ində (Hizmet Vakfı Yayınları, İstanbul – 1997, səh. 87) ***cizyə*** –vergi, xərac mənalarını verir və göstərilir ki, müsəlman dövlətlərində "müsəlman olmayanlardan alınan vergidir" (Bax: xərac).

*2. Peyğəmbər (sallallahu əleyhi və səlləm) buyurub ki: "İmamınız sizdən olduqda, Məryəm oğlu aranızda nazil olan vaxt halınız necə olacaq (onu necə qarşılayacaqsınız)?" (Buxari, Ənbiya, b. Nuzulu İsa, IV, 142)*

## *Müsəlmanların yəhudilərlə müharibəsi*

*Uca Allah buyurur ki:*

***"Biz İsrail oğullarına kitabda** [Tövratda]**: "Siz yer üzündə iki dəfə fitnə-fəsad törədəcək və çox dikbaşlıq edəcəksiniz!"- deyə bildirdik". Onlardan birincisinin** [cəza] **vaxtı gələndə üstünüzə çox güclü qullarımızı**[Σ143] **göndərdik. Onlar evlərinizin arasında gəzib dolaşırdılar. Bu vəd artıq yerinə yetirildi**[Σ144]**.** [Bundan] **sonra sizə onların üzərində təkrar zəfər çaldırdıq, var-dövlət, oğul-uşaq verməklə kömək göstərdik və sayca sizi daha çox etdik. Yaxşılıq da etsəniz, özünüzə etmiş olursunuz, pislik də! İkinci fitnə-fəsadınızın** [cəza] **vaxtı gəldikdə üzünüzü qara** [sizi xəcil] **etmək, məscidə** [Məscidüləqsaya] **birinci dəfə girdikləri kimi girmək və ələ keçirdikləri bir şeyi büsbütün məhv etmək üçün** [fars və rum padşahlarını] **üstünüzə göndərdik. Ola bilsin ki, Rəbbiniz sizə rəhm etsin! Əgər siz** [yenidən yaramaz əməllərinizə] **qayıtsanız, Biz də** [sizi yenidən cəzalandırmağa] **qayıdarıq. Biz Cəhənnəmi kafirlərdən ötrü bir zindan etdik!" (İsra, 17/4-8)***

*Uca Allah Kitabında İsrail oğullarına yer üzündə iki dəfə fəsad törədəcəklərinə, bunlardan birincisinin vaxtı çatdığı zaman Allahın üstlərinə çox güclü qullarını göndərəcəyini, onlar tərəfindən ölkələrinin işğal edilib İsrail oğullarına işgəncələr veriləcəyini, ikincisinin vədəsi çatdıqda isə bir qövmü üstlərinə göndərəcəyini və bu səbəbə görə kədərlərinin üzlərindən oxunacağını, bu qövmin daha əvvəl, birinci dəfə məscidə girildiyi kimi, təkrarən məscidə girəcəklərini xəbər verdikdən sonra "Əgər siz* [*yenidən*

---

Σ143 *Büxtünəssəri, yaxud Calutu orduları ilə birlikdə* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 339)

Σ144 *Siz Zəkəriyyanı öldürdünüz, onlar da sizi qətl edib, əsir edib, yurdunuzu xaraba qoydular.* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 339)

*yaramaz əməllərinizə] qayıtsanız, Biz də [sizi yenidən cəzalandırmağa] qayıdarıq", - deyə buyurur.*

*Beləliklə, onlar üçüncü dəfə də fəsad törətməyə təkrarən qayıtmış olsalar, şəni uca Allahın da düşmənlərini onların üstünə qaldırmaqla onlardan yenidən intiqam alacağını bildirir. Bunu Uca Allah:* ***" Əgər siz qayıtsanız, Biz də qayıdarıq"*** *buyruğu ilə bəyan edir. (Bax: Şinqiti, Ədvaul-Bəyan, III, 370)*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) buyurur ki: "Müsəlmanlar yəhudilərlə vuruşmadıqca, qiyamət qopmayacaq. Müsəlmanlar yəhudiləri öldürəcəkdir. Belə ki, hər bir yəhudi bir daşın və ya bir ağacın arxaında gizlənəcəkdir. Ağac və ya da daş dil açaraq: Ey müsəlman, ey Allahın qulu, bax, arxamda bir nəfər yəhudi var, gəl onu öldür deyəcəkdir. Bunların arasında təkcə ğarqad ağacı istisnadır. O, yəhudilərin ağaclarındandır". (Muslim)*

***Ayələrlə hədisdən çıxan bəzi nəticələr***

*1. Yer üzündə zülm və fəsad törətmənin dünyada və axirətdə pis aqibəti olacağını bildirir.*

*2. Peyğəmbər (sallallahu əleyhi və səlləm) müsəlmanların yəhudilərlə vuruşacağını, müsəlmanların onların üzərində qələbə çalacağını xəbər verir. Bu isə, onlar öz dinlərindən möhkəm yapışacaqları zaman baş verəcəkdir. Yəhudilərin gəlib Fələstində toplaşması müsəlmanların onları məhv etməsini asanlaşdıracaq. Bunlar, Uca Allahın rizası ilə, Peyğəmbərin (sallallahu əleyhi və səlləm) qiyamətə yaxın zamanda gerçəkləşəcək xəbərdarlıqlarındandır.*

## *Təkcə Allah bəs edər*

*Uca Allah belə buyurur:*

***"Ya Peyğəmbər! Sənə və sənin ardınca gedən möminlərə təkcə Allah bəs edər" (Ənfal, 8/64)***

*İbn Qeyyim (A. r. e.) ayənin təfsirində bir sıra nəzər baxışları açıqlayaraq nəql edir:*

*1. Təkcə Uca Allah sənə də, sənə tabe olanlara da bəs edər. Onunla bərabər hər hansı başqa bir kəsə ehtiyac yoxdur.*

*2. "Sənə bəs edər" sənin üçün kifayətdir mənasındadır. Yəni Allah sənə də kifayət edər, sənə tabe olanlara da kifayətdir, bəs edər. Belə ki, ərəblər (ayədəki cümlə quruluşuna bənzər bir məna ilə): "Sənə də, Zeydə də bir dirhəm bəsdir" deyirlər. Deyilən, bu barədəki iki açıqlamanın ən doğru olanıdır. Yəni, sənə tabe olan möminlərə də Allah bəs edər.*

*3. Ayə, sənə Allah və sənə tabe olanlar bəs edər, mənasını verir. Hərçənd bəziləri açıqlamalarını belə versələr də, bu şübhəsiz bir yanlışlıqdır; ayənin bu şəkildə başa düşülməsi yolverilməzdir. Çünki bəs etmək və kifayət qədər olmaq təkcə Allaha məxsusdur, eynilə təvəkkül, təqva və ibadət kimi. Uca Allah:* ***"Əgər onlar səni aldatmaq istəsələr, sənə təkcə Allah kifayətdir. [****O Allah ki****] səni Öz köməyi ilə və möminlərlə müdafiə edib möhkəmlətdi". (Ənfal, 8/62)***

*Ayədən göründüyü kimi, kifayət etmə və möhkəmlətmə arasındakı fərq nəzərə alınmışdır. Bəs olmağın təkcə Allaha aidliyi bildirildiyi halda, möhkəmlədilmənin Allahın köməyi və qullarının vasitəsi ilə yerinə yetirilməsi bildirilmişdir. Belə ki, Uca Allah tövhid və təvəkkül əhli olan qullarını təkcə Allahın onlar üçün kifayət edəcəyini söylədiklərinə görə onları təqdir edir:*

***"O kəslər ki, xalq onlara: "Camaat sizə qarşı*** *[qüvvə]* ***toplamışdır, onlardan qorxun!" – dedikdə,*** *[bu söz]* ***onların imanını daha da artırdı və onlar: "Allah bizə bəs edər. O nə gözəl vəkildir!" – deyə cavab verdilər". (Ali-İmran, 3/173)***

*Onların: "Allah və Peyğəmbəri bizim bəsimizdir" dediklərini görmürük.*

*Belə söylədikləri üçün Uca Rəbbimiz də onları təriflədiyinə görə, Onun peyğəmbəri necə ola bilərdi ki, Sənə Allah və sənə tabe olanlar bəs edər desin? Halbuki, ona tabe olanlar yalnız Uca Allahın onlara bəs etdiyini söyləmişdilər. Bu məsələdə Allaha peyğəmbərini şərik qoşmamışdılar. Belə olduqda, necə ola bilər ki, Uca Allah peyğəmbərinə özü ilə bərabər ona tabe olanların bəs olduqlarını bildirməklə Ona şərik olduqlarını buyursun? Şübhəsiz ki, bu, heç vəchlə mümkün olmayan, batildən də batildir.*

*Bunun bir oxşarı da Uca Allahın:* ***"[Ya Peyğəmbər!] Məgər Allah Öz bəndəsinə kifayət deyilmi?!" (Zumər, 39/36)*** *ayəsidir.*

*Uca Allah beləliklə təkcə Özünün quluna bəs etdiyini* ***ona***[Σ145] *bildirir. Necə ola bilər ki, yetərlilikdə Allahla bərabər,* ***ona*** *tabe olanlardan da bəhs edilsin?!*

*Belə bir izahın mənasız olduğunu sübut edən dəlillər isə saysız-hesabsızdır. (Bax: İbn Qeyyim, Zadul-Məad, I, 3.)*

## *Allahın Kitabı ilə hökm verməkdən uzaqlaşmaq bəlalara uğramağa səbəb olur*

---

[Σ145] Peyğəmbərə (sallallahu əleyhi və səlləm)

***"De: "Allah başınızın üstündən və ayaqlarınızın altından** [göydən və yerdən] **sizə əzab göndərməyə, sizi dəstələr halında qarışdırmağa və birinizə digərinizin zorunu daddırmağa qadirdir!". Gör ayələrimizi onlara nə cür izah edirik ki, bəlkə, başa düşsünlər!" (Ənam, 6/65)***

*Uca Allahın:* ***"De: "Allah başınızın üstündən və ayaqlarınızın altından sizə əzab göndərməyə… qadirdir!"*** *ayəsi nazil olduqda Allahın Elçisi (sallallahu əleyhi və səlləm): "Sənin çöhrənə sığınıram", – deyə buyurdu. Və ya* ***"…sizi dəstələr halında qarışdırmağa və birinizə digərinizin zorunu daddırmağa qadirdir!"*** *ayəsində isə Peyğəmbər (sallallahu əleyhi və səlləm): "Bu ikisi daha xəfif ya da yüngüldür" - deyə buyurdu. (Buxari və başqaları)*

*Sonra, Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə demişdir: "Allah yer üzünü mənə görə cəm etdi (və göstərdi). Onun şərqini də, qərbini də gördüm. Mənim ümmətimin səltənəti, yerdən mənə kiçildilib göstərilən yerlərə qədər uzanacaqdır. Mənə qırmızı (qızıl) və ağ (gümüş) iki xəzinə verildi. Allahımdan ümmətimi kütləvi qıtlıqla həlak etməməsini, canlarına və mallarına qəsd edən özlərindən olmayan bir düşmənin ümmətim üzərində hökmranlıq etməməsini xahiş etdim. Allahım da belə buyurdu: "Ey Məhəmməd! Mən bir işə hökm verirəmsə, şübhəsiz ki, o geriyə dönməz və Mən sənin ümmətinin bir hissəsi başqa bir hissəsini həlak edənədək və bir hissəsi digərini əsir alanadək onları ümumi bir qıtlıqla həlak etməməyi, özlərindən olmayan bir düşmənin onların malları və canları üzərində hökmranlıq etməməsi istəyini yerinə yetirdim. Lap istəyirsə yer üzünün hər tərəfindən olan insanlar yığışıb onlara qarşı gəlsinlər və yaxud onun hər tərəfindən kim istəyirsə bir yerdə toplaşıb gəlsinlər" - deyə buyurdu". (Muslim və başqaları)*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur: "Rəbbimdən üç şey istədim. Mənə ikisini verdi, amma üçüncüsünü vermədi. Rəbbimdən ümmətimi kütləvi açlıqdan həlak etməməsini dilədim, bu istəyimi verdi. Yenə Ondan ümmətimi suda boğularaq həlak edilməsini istədim, onu da mənə verdi. Yenə də Ondan ümmətimin bir hissəsini digər bir hissəsinə qırdırmamasını istədim, onu mənə vermədi". (Muslim)*

*Müsəlmanlar arasında baş verəcək bu qırğınlar Peyğəmbərin (sallallahu əleyhi və səlləm) aşağıdakı buyruqlarında qeyd edilmişdir:*

*"İmamları (rəhbərləri) Allahın Kitabına uyğun olan hökmlər verməyərək, Allahın nazil etdiklərindən (bir qismini) onlara xeyirli olduğunu gördükləri üçün seçməyə başlayarlarsa, mütləq Allah da onları bir-birinə qırdırar". (Hakim hədisin səhih olduğunu bildirmiş, Zəhəbi isə onunla razılaşmışdır.)*[R12]

*Əbu Davud ikinci hədisdə aşağıdakı əlavəni qeyd edir: "Və şübhəsiz ki, mən ümmətimi yoldan azdıracaq imamlarından (rəhbərlərindən) qorxuram. Ümmətimin ki arasına qılınc düşdü (bir-birilərini öldürməyə başladılarsa), bu qiyamət gününədək aradan qalxmayacaq. Ümmətimin bəzi tayfaları müşriklərə qoşulmadıqca və bəzi tayfaları bütlərə sitayiş etmədikcə, qiyamət qopmayacaq. Heç şübhəsiz ki, millətimin arasında hər biri peyğəmbər olduğunu iddia edən otuz nəfər yalançı ortaya çıxacaqdır. Baxmayaraq ki, mən peyğəmbərlərin sonuncusuyam. Məndən sonra peyğəmbər olmayacaqdır. Bununla bərabər,*

---

[R12] Hədisi bu mətnlə İbn Məcə (Sünən, 4019), Əbu Nueym (Hilyətul-əvliya, 8/334) və başqaları rəvayət etmişdir. Şeyx Əlbani «Səhih hədislər silsiləsi» (1/217, hədis 106) əsərində onun həsən isnadlı olduğunu bildirmişdir. Hakim isə Mustədrək (4/583, hədis 8623) əsərində mənaca buna oxşar uzun bir rəvayət nəql etmişdir. Allah daha yaxşı bilir.

*ümmətimin haqlı olan məğlubedilməzləri, onların əleyhinə olanların onlara zərər verə bilməyəcək və Allahın əmri nazil olanadək dəyişməz qalacaq bir tayfa da olacaqdır". (Əlbani hədisin sənədinin səhih olduğunu bildirir)*

*Təbəri deyir ki, bu ayədə sözü gedən bütün məsələlərlə bağlı məhz bu ümmətin nəzərdə tutulduğunu bildirən təfsirçilərə gəlincə, mənim nəzərimcə, onlar bu ümmət arasında Allaha qarşı çıxacaq və Allahı qəzəbləndirəcək şeylərin ardıyca gedəcək kimsələrin gəlməsi kimi yozulur. Bunlara görə bu ümmətdən olan və belə işləri görənlər*[Σ146]*, onlardan əvvəlki ümmətlərin etdikləri kimi, Allahın əmrlərinə qarşı çıxacaq Ona küfr edəcəklər. Elə buna görədə onlardan əvvəlkilərin başına gələn müxtəlif əzab və əziyyətlərin bənzərləri Məhəmməd ümmətinin başına gələcəkdir. (Bax: Təbəri, XI, 431, Mahmud Şakirin tədqiqatı ilə)*

---

[Σ146] Allaha qarşı çıxanlar və Allahı qəzəbləndirəcək şeylərin ardıyca gedənlər.

***Ayə və hədislərdən çıxarılan nəticələr***

*1. Şəni uca Allah* ***ümmətlərə*** *göydən də, yerdən də əzab göndərərək onları məhv və həlak etməyə qadirdir. Allahın Elçisi (sallallahu əleyhi və səlləm) ümmətinin suda boğulması və buna bənzər əzabların göndərilməsindən Rəbbinə sığınmışdır.*

*2. Hədisdə Uca Allah üçün təşbih etməkdən danışmadan ona layiq şəkildə bir surət (üz) aid edilir. Uca Allah:* ***"…Ona bənzər heç bir şey yoxdur…" (Şura, 42/11)*** *– deyə buyurur.*

*3. Bir ümmət ki, Allahın şəriəti əsasında qərar qəbul etməkdən uzaqlaşaraq, ona əks qayda-qanunlardan istifadə edərsə, Uca Allah həmin ümməti qruplara, firqələrə ayıraraq bölməyə və onların bir qismini digərinə qarşı qoymağa qadirdir. Təəssüflər olsun ki, məhz indiki vaxtdakı vəziyyət buna bənzəyir.*

*4. Uca Allah peyğəmbəri Məhəmmədə (sallallahu əleyhi və səlləm) yer üzünün şərqini və qərbini göstərmək üçün onların hər ikisini bir yerdə göstərməyə qadirdir. Onun ümmətinin səltənəti də yer üzündə cəm edilib ona bir yerdə göstərilən qədər olacaqdır.*

*5. Uca Allah İslam ümmətinə qarşı mərhəmətlidir. Göydən ona məhvedici bir əzab göndərməyəcəkdir. Onlara qıtlıq üz versə də, ümummilli miqyasda olmayacaq. Hətta, bu, İslam ərazilərinin ən geridə qalmış bölgələrində belə ancaq kiçik bir yeri əhatə edəcək. (Nəvəvi, Muslim şərhi).*

*6. Uca Allah İslam millətinə qarşı mərhəmətlidir. O, üstlərinə onları məhv edəcək əcnəbi bir düşmən göndərmir. Əksinə, onların biri digəri tərəfindən narahat edilməyə məhkum olunmuşdur. Bu isə öncəkindən daha az zərərlidir.*

*7. Allahın Elçisi (sallallahu əleyhi və səlləm) ümməti üçün Kitabı və Sünnəni tətbiq etməyən azdırıcı imamlardan qorxmuş və onlardan ehtiyatlı olmağa çağırmışdır.*

*8. Bu ümmətin arasında qılınc özünə yer taparsa (indiki vaxtda olduğu kimi), qiyamətə qədər üzərlərindən qaldırılmayacaqdır.*

*9. Bu ümmətin arasında şirk var. Şirk isə Allahdan qeyrisinə dua etmək, Allahın nazil etdiklərindən savayı olanlarla hökm çıxarmaq və bunlara oxşar şeylərlə ibadəti Allahdan başqasına yönəltmək məqsədi daşıyır.*

*10. Peyğəmbər olduqlarını iddia edən yalançı adamların olacağını Peyğəmbər (sallallahu əleyhi və səlləm) xəbər vermişdir. İlk dövrlərdə Museylimətul-Kəzzab, son dövrlərdə isə Qulam Mirzə Əhməd kimiləri. Lakin Peyğəmbərdən (sallallahu əleyhi və səlləm) başqa peyğəmbər gəlməyəcəkdir.*

*11. Bu ümmətdən bir təbəqə qiyamət gününə qədər haqqa, İslama və tövhidə möhkəm sarılmağı davam etdirəcəkdir.*

## *Qurani Kərimin şeytanın sui-qəsdlərindən uzaq saxlanılması*

*Uca Allah buyurur ki:*

***«[**Ya Rəsulum!]* ***Biz səndən əvvəl də elə bir rəsul, elə bir nəbi göndərmədik ki, o, arzu etdikdə Şeytan onun arzusuna bir xələl qatmasın! Lakin Allah Şeytanın vəsvəsəsini batil edər. Sonra isə Allah Öz ayələrini möhkəmlədər. Allah biləndir, hikmət sahibidir! Şeytanın vəsvəsəsini qəlblərində mərəz və ürəkləri qatı, sərt olanlar üçün bir sınaq vasitəsi etsin. Şübhəsiz ki, zalımlar haqdan uzaq bir nifaq içindədirlər. Və elm verilən kəslər də bilsinlər***

***ki, haqq sənin Rəbbindəndir. Artıq ona inansınlar və ürəkləri ondan arxayın olsun. Şübhəsiz ki, Allah iman gətirənləri doğru yola yönəldər». (Həcc, 22/52-54)***

*Cəlaleyn Təfsirinə öz izahını yazan əl-Məhəlinin də aralarında olduğu bəzi təfsirçilər batil bir təfsiri götürərək: «Şeytan peyğəmbər kimi göndərilənlərin xoşuna gələcək qiraəti ilə Onun (sallallahu əleyhi və səlləm) arzusuna Qurandan olmayan bir şeylə xələl qatdı» – deyə bildirmişlər. Peyğəmbərin (sallallahu əleyhi və səlləm) Nəcm surəsində qureyşlilərin bir yığıncağında:* ***«Bir deyin görək Lat və Uzza nəyə qadirdirdilər?! Digər üçüncü olan Mənat da həmçinin?!». (Nəcm, 53/19-20)*** *buyurduğu ayələri oxuduqdan sonra, şeytanın onun dili ilə və elmsiz olaraq: «Və bunlar ali bütlərdir. Şübhəsiz ki, onlardan şəfaət diləyirlər» kimi sözlər söylədiyini və buna görə qureyşlilərin razı qaldıqlarını bildirmişdir. Daha sonra isə, guya Cəbrail onun bu sözlərinin şeytandan olduğunu ona xəbər vermiş, o da bu məsələdən xeyli narahat olmuş və bu kərim ayə ilə ona təsəlli verilmişdir.*

*2. Onun bu sözü batildir. Elm adamları ümumi rəy əsasında aşağıdakıları qəbul ediblər: Haqqında danışılan bu Ğaraniq (yəni, bütlər) hekayəti həm mətn baxımından, həm də sənəd etibarilə batildir. Bu, zındıqlar*[Σ147] *tərəfindən uydurulmuşdur. Qazi İyad «əş-Şifə» adlı əsərində, Əbu Bəkr İbn-Ərəbi, İbn Kəsir və başqaları bunu qətiyyətlə rədd ediblər. Bilavasitə bu hekayətdən mümkün olduqca uzaq durmaq lazımdır. Çünki İslam düşmənləri və qərb şərqşünasları bundan istifadə etməklə Qurana böhtan atmağa çalışırlar. Onlar, ayrıca olaraq, şeytanın Qurana məxsus olmayan şeyləri ona sala biləcəyini iddia edirlər. Hədis alimi əl-Əlbani bu hekayəti rədd etmək məqsədilə aşağıda adıçəkilən dəyərli bir əsər yazmışdır: «Nəsbul-*

---

[Σ147] **Zındığ –** dinsiz, kafir.

*Minciniq linəsfi qıssatil-Ğaraniq» («Ğaraniq hekayətinin külünü göyə sovurmaq üçün mancanaq qurmaq»). Əsər nəşr olunmuşdur.*

***Ayənin düzgün təfsiri***

*Həmin ayənin təfsiri ilə bağlı olaraq edilən ən gözəl şərh doktor Əbu Şuhbənin «əl-Məvduatu vəl-İsrailiyyatu fit-Təfsir» adlı əsərində ayənin təfsirinə dair verdiyi açıqlamadır:*

*Bu iftiralara cavab vermək üçün ustad imam Məhəmməd Abduhun bu ayənin təfsiri ilə bağlı etdiyi açıqlamaların xülasəsini təqdim etmək istəyirəm: ayə iki formada təfsir edilmişdir.*

*Birincisinə görə buradakı «التمني arzu» (izahındakı kimi) «oxumaq» mənasındadır. Ancaq «الإلقاء* ***bir xələl qatma»*** *qərbpərəstlərin bəhs etdiyi mənada deyil. Əksinə, bu, sözün ifadə edə biləcəyi bir sıra batil və şübhəli şeyləri təlqin etmək mənasını verir, amma danışan öz qarşısına bunları məqsəd qoymur və yaxud sözün belə məna daşıma ehtimalı olmur. Lakin o, həmin sözün bu nəticəni verdiyini iddia edir. Bu isə qarşı tərəfi aciz qoymaq istəyən, iş-gücü haqqın əleyhinə mübarizə aparmaq olan, şübhələrə uyan, şübhələrin arxasında gizlənərək danışan kimsələrin gördüyü bir işdir. «****Bir xələl qatmaq»*** *istəyinin şeytana aid edilməsi, onun öz vəsvəsələri ilə bir sıra şübhələri araya qatmaq istəməsindən irəli gəlmişdir. Buna görə məna belə olmalıdır: «Biz səndən əvvəl də elə bir rəsul, elə bir nəbi göndərmədik ki, o, xalqına Allah barədə danışarkən və yaxud Allahın ona nazil etdiyi doğru yolu ehtiva edən bir vəhyi onlara oxuduğu zaman, onun əleyhinə söyləmədiyi sözləri uyduran, sözlərin yerlərini dəyişdirən, onları təhrif edən və bunu insanlar arasında yayan bir sıra şarlatanlar ortaya çıxmasınlar. Peyğəmbər də haqq yolunda ədalətli qələbə əldə*

*edincəyədək və Allahın Şeytanın vəsvəsəsini aradan qaldırıb, haqqı möhkəmləndirincəyədək, haqq yolunda bunlara qarşı mübarizə apararaq cihad edir. Uca Allahın bu qayda-qanunu qulları arasında bərqərar etməsində məqsəd – təmizi murdardan ayırd etmək və, beləliklə, qəlblərində xəstəlik olan zəif iman sahiblərini sınağa çəkməklə yanaşı, həm də haqq sahibləri üçün haqqı aşkar edib aydınlaşdırmaqdır. Elm verilənlər məhz bunlardır. Onlar, beləliklə, bu haqqın Rəbblərindən gələn bir həqiqət olduğunu bilir və bu həqiqətlə qəlbləri rahatlıq və sakitlik tapır.*

*İkincisinə görə, burada barəsində bəhs edilən «arzulamaq» sözü ilə (oxumaq istəmək mənasında) nəzərdə tutulan arzuolunan bir işin baş verməsinin istənilməsi və nəfsin öz-özlüyündə müxtəlif xəyallara qapılmasıdır. Bu söz göstərilən anlamda götürüldükdə, mənası belə olur: Allah öz xalqını yeni bir doğru yola dəvət etmək üçün nə qədər peyğəmbər və nəbi göndəribsə, onların şəriətlərinin son məqsədi, peyğəmbərlərin ən böyük istəkləri – xalqlarının iman gətirmələridir. Bizim Peyğəmbərimiz (sallallahu əleyhi və səlləm) də bu məsələdə ən yüksək səviyyədə idi. Belə ki, Uca Allah belə buyurur:* ***«[****Ya Rəsulum!****] Yoxsa [****kafirlər****] bu Qurana inanmasalar, arxalarınca təəssüflənib özünü həlak edəcəksən?!» (Kəhf, 18/56)*** *– deyə buyurur. Bir başqa yerdə də:* ***«Sən***[Σ148] ***təşnə olsan da, insanların əksəriyyəti iman gətirən deyildir!» (Yusuf, 12/103)*** *deyilir.*

*Bu halda məna belədir: Biz nə qədər peyğəmbər və nəbilər göndərsək də, onlar mütləq belə bir yüksək təmənnada olduqda, şeytan onların yolunda maneələr qoyur, peyğəmbərlərlə onların məqsədləri arasında keçilməsi mümkün olmayan elə uçurumlar törədir ki,*

---

[Σ148] *Qövmünün imana gəlməsini* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 306).

*insanların qəlbinə vəsvəsə salır. Belə süni əngəllərin nəticəsində insanlar da peyğəmbərlərə qarşı çıxır, nə vaxtsa silahla və ya sözlə haqq elçilərinə qarşı mübarizəyə girişirlər. Dəvətin hələ ilk dönəmlərində olduğu kimi, peyğəmbəri müdafiə edən tərəfdarları az ikən, ona zərər yetirdikləri vaxt, iman gətirməyənlər özlərinin haqlı olduqlarını zənn edirdilər. Lakin Uca Allah bu barədə qoyduğu qanuna görə kafirləri mərhələlərlə əzaba düçar edir (tədricən əzaba yaxınlaşdırır). Onlarla möminlər arasındakı savaşda qələbə növbəylə qazanılır. Qəlblərində şübhə və münafiqlik olanlar buna aldanırlar. Fəqət Uca Allah şeytanın yaratdığı şübhələrin yox olmasını çox sürətlə həyata keçirir. Haqqa kömək edənlərin zəifliyini qüvvətə, gücsüzlüklərini isə əzəmətə döndərir. Allahın sözü ən yüksək söz, kafirlərinki isə ən alçaq olur. Beləliklə, onlara elm verilmiş şəxslər Allahın elçilərinin gətirdiklərinin haqqın özü olduğunu bilirlər və qəlbləri rahatlıq və sakitlik içində olur. Şübhəsiz ki, Allah iman gətirənləri ən düzgün yola yönəldəndir. Bax, əsl haqq budur. Bundan kənarda nə varsa batildir.*

## *Görkəmli elm xadimi Şinqitinin mükəmməl bir ayə təfsiri*

*Görkəmli elm xadimi Məhəmməd əl-Əmin Əş-Şinqiti kərim ayəni həqiqətən ecazkar bir bir tərzdə təfsir etmişdir. O, təfsirində bunu bildirmişdir: Uca Allahın:* ***«Lakin Allah Şeytanın vəsvəsəsini batil edər»*** *buyruğunun «şeytan onun oxunmasına oxunuşa aid olmayan şeyləri salar» kimi olduğunu söyləyənlərin baxışlarını işıqlandırdığını görürük. Çünki burada batil etmənin bir sözün mənası kimi batil olunduğunu demişdik. Burada da onun mənası batil və rədd etməkdir. Bu isə ərəblərin: günəş kölgəni yox etdi, külək izi sildi sözlərinə oxşayır. Bu, sanki Uca Allahın şeytanın qoyduğu şeyləri aradan götürdüyünü göstərir və, «bu batil etdiyi, elçilərin və peyğəmbərlərin oxuduqlarından deyil» deməkdir. Bundan əvvəl nə qədər bu barədə desək də, zənnimizcə doğru olan və Quranın, aydın şəkildə sübut etdiyi, açıqlayacağımız bu anlamındadır. Bəli, kərim ayə haqqında açıqlamalar verən təfsirçilər buna diqqət yetirmə-yiblər. Bəhs etdiyimiz açıqlama belədir: Şeytanın Peyğəmbərin (sallallahu əleyhi və səlləm) qiraətinə, o qiraətin təsdiq və ya qəbul edilməsinə əngəl törədən şübhələr və vəsvəsələr təlqin etməsinə, onlara bu qiraətin bir cadu və ya bir şer, ya da ki, keçmişin məsəlləri olduğuna inandırmaq istəməsinə, bunların Allah tərəfindən endirilməmiş olmasına, Allaha iftira atılmış şeylər olduğunu insanlara söyləməsinə bənzər.*

*Nəticədə belə məna alınmasına sübut olan budur: Uca Allah yuxarıda haqqında bəhs edilən şeytanın qarışıqlıq salmasındakı hikmətdən məqsədin insanların imtahan edilməsi olduğunu bildirməkdir. Çünki Allah:* ***«[****Allah ona görə belə edir ki****] Şeytanın vəsvəsəsini qəlblərində mərəz və ürəkləri qatı olanlar üçün bir sınaq vasitəsi etsin…» (Həcc, 22/53)****– deyə buyurur. Sonra isə* ***«Və elm verilən kəslər də***

***bilsinlər ki, haqq [**Quran**] sənin Rəbbindəndir. Artıq ona inansınlar və ürəkləri ondan arxayın olsun…»***[Σ149] *deyə buyurur. Burada* ***«Və elm verilən kəslər də bilsinlər ki, haqq [**Quran**] sənin Rəbbindəndir…»*** *buyruğu aşağadakıları vurğulayır: Şeytan insanlara Peyğəmbərin (sallallahu əleyhi və səlləm) onlara oxuduqlarının haqq olmadığını təlqin edir. Bədbəxtlər onun bu təlqinini doğru sanarlar ki, bu da onlar üçün bir fitnəyə çevrilər. Elm verilən kəslər, şeytanın təlqini ilə iddia etdiyi kimi, Peyğəmbərin (sallallahu əleyhi və səlləm) oxuduqlarının yalan deyil, haqqın özü olduğunu bilən möminlər isə, şeytanın dediklərinin yalan olduğunu bildirərlər.*

*Bax, bu imtahan və sınaq heç bir şeylə əlaqədar deyil. Onu şeytan özündən Peyğəmbərin (sallallahu əleyhi və səlləm) oxuduqlarına əlavə etmişdir. Döğrusunu ən yaxşı bilən Allahdır. Bu şərhə görə, şeytanın etdiyi təlqinlərin rədd edilməsi, onların aradan qaldırılması, elm verilmiş insanlara təsir göstərə bilməməsi bildirilir.*

***«…Öz ayələrini möhkəmlədər…»*** *buyruğunun mənası isə: O, bu avazlı oxunu hökmləri ilə möhkəmləndirir. Beləliklə, bunların həqiqətən Allah tərəfindən nazil edilmiş vəhy olmasını üzə çıxardır. Şeytanın bu ayələrin qarşısını almaq məqsədilə öz təlqini ilə təsir göstərməyə çalışmasının heç bir faydası yoxdur. Burada qeyd edildiyi kimi, şeytana Allahın Elçisinin və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) oxuduqlarına təsir göstərmək imkanı verməsi, möminlərini kafirlərdən ayırd etmək məqsədilə Allahın insanları sınamasından ötrüdür.*

*Məhz bu sınağı Uca Allah lap əvvəlcə dəfələrlə təkrar misal çəkdiyimiz bir çox kərim ayələrdə aydın dillə bildirmişdir. Uca Allahın aşağıdakı ayələrində olduğu kimi:*

---

[Σ149] Həcc surəsi, 22/54

***«Biz cəhənnəm gözətçilərini yalnız mələklərdən etdik. Biz onların sayını ancaq kafirlərin imtahana çəkilməsi, kitab verilənlərin yəqinlik hasil etməsi, iman gətirnlərin imanının daha da artması, kitab əhlinin və möminlərin şübhəyə düşməməsi, həmçinin qəlblərində mərəz olanların və kafirlərin: «Allah bu misalla nə demək istəyir?» - demələri üçün etdik. Allah istədiyi kimsəni belə sapdırır və istədiyini də doğru yola salır…» (Muddəssir, 74/31)***

***«…[****Ya Rəsulum!****] İndi yönəldiyin qibləni yalnız Peyğəmbərə tabe olanlarla ondan üz çevirənləri bir-birindən ayırd etmək üçün təyin etdik…» (Bəqərə, 2/143)***

***«…Sənə göstərdiyimiz mənzərəni[Σ150] və Quranda lənətlənmiş ağacı[Σ151] insanlar üçün yalnız bir imtahan etdik…» (İsra, 17/60).*** *Burada: «Ancaq o bir fitnə (sınaq)» mənasındadır. Uca Allahın aşağıdakı buyruğunda olduğu kimi:* ***«[****Ey insanlar!****] Qonaq olmağa bu [****Cənnət****] yaxşıdır, yoxsa zəqqum[Σ152] ağacı? Biz onu zalımlar üçün bir bəla etdik. O elə bir ağacdır ki, Cəhənnəmin lap dibindən çıxar» (Saffat, 37/ 62-64)***

*Bu kərim ayə nazil olduqda onlar belə demişdilər: Budur, Məhəmmədin yalançılığı indi üzə çıxdı. Çünki ağaclar quru yerlərdə bitməz. Ağac cəhənnəmin dibində necə bitə bilər? Buna bənzə misallarla daha öncə keçən ayələrdə dəfələrlə rastlaşmışıq. Doğrusunu ən yaxşı bilən Uca Allahdır.*

---

[Σ150] Qeyd etmək vacibdir ki, ayənin türk variantında bu fraqment «sənə göstərdiyimiz yuxu» kimi çevrilmişdir. Quranın türk dilində olan başqa bir tərcüməsində isə ifadə «sənə göstərdiyimiz görüntülər» şəklindədir ki, sonuncu V. Məmmədəliyevin tərcüməsinə daha yaxındır.

[Σ151] *Cəhənnəmdəki zəqqum adlı ağacı* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 344)

[Σ152] *Cəhənnəmdəki pis qoxulu, meyvəsi zəhər kimi acı* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 503)

*«**Şeytanın vəsvəsəsini....bir sınaq vasitəsi etsin**» buyruğundakı «لام ləm» aşağıdakı mənanı verir:*

*Daha güclü görünən, «ləm»in «qatmaq» anlamındakı felə aid olmasıdır. Yəni, şeytan elçi və peyğəmbərlərin arzularına (oxumalarına) qarışmaq istəmişdir. Beləliklə, Uca Allah onun bu işə qatılmaq istəməsini qəlblərində mərəz olan kəslərə bir imtahan (sınaq) etmişdir. Bu isə o deməkdir ki, bu hərf «**...möhkəmlədər**» buyruğuna müvafiqdir deyən əl-Həvfi ilə «**...batil edər**» mənasındakı felə uyğundur deyən İbn Atiyyənin nəzər nöqtəsinə ziddir.*

*Bunun «onlar üçün bir imtahan» olmasının anlamı isə onların zəlalət və küfr içində qalmalarının səbəbini bildirir. «**Şeytanın vəsvəsəsini qəlblərində mərəz...»** yəni, küfr və şübhə olanlar **«...üçün bir sınaq vasitəsi etsin**» deməkdir. (Bax: Ədvaul-Bəyan, V, 732)*

***Ayədən çıxarılan bəzi nəticələr***

*1. Şeytanın Peyğəmbərin (sallallahu əleyhi və səlləm) qiraətinə qarşı onu təsdiq və qəbul etməyə maneçilik törədən şübhə və vəsvəsələri təlqin etməsi, onun bu qiraətinin bir sehr, bir şer və yaxud qədim əfsanələrdən olduğunu və onların Allaha qarşı uydurulmuş bir iftira kimi təlqin edilməsinə bənzəyir. Belə ki, Qurani Kərim bütün göstərilən xüsusiyyətləri nəzərə alaraq onlardan bəhs edir və bütün şübhələrə cavab verir.*

*2. Peyğəmbərlərin hamısı öz xalqlarının iman gətirməsini istəyirlər. Lakin şeytanlar insanların qəlbinə maneələr, əngəllər və vəsvəsələr salırlar. Bu vəsvəsələri isə Uca Allah qəlblərində mərəz və şübhə olan kimsələri sınamaq vasitəsi etmişdir. Allah onlara əməllərinin əvəzini verəcəkdir. Beləliklə, bu sınaqla Uca Allah həqiqətən iman gətirənləri aşkar edib doğru yola yönəldəcəkdir.*

*3. Şeytanın elçinin və yaxud peyğəmbərin qiraətinə dair fitnə törətmək məqsədilə bir hərəkət edəcəyi barədə Allahın hökmü aydın şəkildə bəyan edilir.*

*4. Uca Allah həmin fitnənin nəticəsi olaraq qəlbi mərəzli və daşlaşmış olanları həlak edəcəyini və bu fitnənin möminlərin inamını daha da artıracağını, doğru yolda onları daha da irəliyə aparacağını izah edir.*

*5. Uca Allah qiyamət günü qulları arasında iman və təqva əhlinə himayəsinə sığınmaq, şirk və günah əhli olan kimsələri isə zəlil etmək üçün hökm verəcəyini bildirir. (Sonuncular Əbu Bəkr əl-Cəzairi, Əysərut-Təfəsir, III, 171-dən götürülmüşdür.)*

## *Günahkarlıq və millətin məhvinə onun təsiri*

*Uca Allah buyurur ki:*

***«Biz bir məmlkəti məhv etmək istədikdə onun naz-nemət içində yaşayan başçılarına[Σ153] əmr edərik. Lakin onlar pis-pis işlər törədərlər. Beləliklə, hökm vacib olar və onu yerlə yeksan edərik» (İsra, 17/16)***

*1. «Onun naz-nemət içində yaşayan başçılarına» Allaha itaət etmələrini, onun vəhdaniyyətini qəbul və elçilərini təsdiq etmələrini, o elçilərə onlara vəhy edilənlərlə bağlı tabe olmağı «əmr edərik».*

*«Pis-pis işlər törədərlər», yəni Rəblərinin əmrinə xilaf çıxar, ona itaətsizlik göstərər və elçilərin dediklərini yalan sayarlar.*

*«Beləliklə, hökm», yəni əzabla qorxudulma sözü «vacib olar».*

*«Və onu yerlə yeksan edərik», yəni onları kökündən məhv edərik.*

*Həqiqət olan bu ifadəni bir çox kərim ayələr nişan verir. Uca Allah aşağıdakı buyruğu kimi:*

***«[**Şeytanla dost olanlar**] ədəbsizlik[Σ154] etdikləri zaman: «Atalarımızı belə gördük. Bunu bizə Allah əmr etmişdir», - deyirlər. [**Ya Peyğəmbər!**] De: «Allah ədəbsizlik əmr etməz…» (Əraf, 7/28)***

*Şəni uca Allahın həyasızlığı əmr etmədiyini aydın ifadə etməsi, Onun:* ***«naz-nemət içində yaşayan başçılarına əmr edərik»*** *buyruğunun onlara itaət etmələrini əmr etsək də*

---

Σ153 *Allaha itaət etməyi, iman gətirməyi* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 340)

Σ154 *Bütpərəstlik adəti üzrə Kəabəni çılpaq təvaf etmək* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 229)

*etiraz edərlər mənasında olduğuna aydın bir dəlildir. Əksinə, biz onlara günah işlətmələrini əmr etmərik ki, onlar da pis-pis işlərlə məşğul olsunlar anlamında ola bilməz. Çünki Allah həyasızlığı əmr etməz.*

*Ayənin mənası ilə bağlı düzgün olan bu nəzər nöqtəsi eyni qaydada ərəblərin öyrəşdiyi anlatma üslublarında da istifadə edilir. Məsələn, onlar: «Mən ona əmr etdim, o tabe olmadı» deyərlər. Yəni, mən ona itaət etməyi əmr etdimsə də, o tabe olmadı. Yoxsa ki, ayənin mənası, aydın göründüyü kimi, «mən ona tabe olmamasını əmr etdim» kimi deyildir.*

*2. («Əmr edərik» anlamında verilən buyruq eyni zamanda yazılışı dəyişmədən) «əmərna» və «amərna» formasında onların böyüklərini və əmirlərini (başçılarını) çoxaltdıq ifadəsini bildirir. Bu açıqlamanı əl-Kisai vermişdir. (Bax: Şinqiti, Ədvaul-Bəyan, III, 441)*

*3.* ***«Onun naz-nemət içində yaşayan başçılarına əmr edərik»*** *buyruğu aşağıdakıları bildirir: Biz onlardan olan şər əhlini ölkənin rəhbərliyinə gətirərik, onlar da orada itaətsizlik şəraiti yaradarlar. Bu işi gördükləri vaxt Allah da onları əzabla həlak edər. Bu isə Uca Allahın:* ***«Beləliklə, hər bir ölkənin günahkarlarını oranın başçıları təyin etdik…» (Ənam, 6/123)*** *buyruğuna oxşayır. Bu açıqlamanı Əli b. Təlhə İbn Abbasdan (A.o.r.) rəvayət etsə də, həm də Əbu Aliyə, Mücahid və ər-Rabi b. Ənəsin baxışları ilə eynidir.*

*4. «Biz bir məmlkəti məhv etmək istədikdə onun naz-nemət içində yaşayan başçılarına əmr edərik» buyruğu onların sayının artırılmasını bildirir. Bu açıqlamanı da əl-Avfi İbn Abbasdan rəvayət edir. (Bax: İbn Kəsir, III, 33)*

***Ayədən çıxarılan bəzi nəticələr***

*1. Naz-nemət içində yaşayanlardan kənarda qalanlar onlara tabe olurlar və elə buna görə də onlarla birgə məhv edilirlər.*

*2. Məhv edilmə hamını əhatə edir:* ***«Sizdən təkcə zalımlara toxunmayacaq***[Σ155] ***bəladan qorxun…» (Ənfal, 8/25)***

*Allahın Elçisindən (sallallahu əleyhi və səlləm): «Aramızda saleh insanlar olduğu haldadamı məhv ediləcəyik?» - deyə soruşulduqda, o: «Bəli, günahlar, fisqi-ficur çoxalarsa», - deyə cavab vermişdir. (Buxari)*

*Ancaq o bölgədə və ölkənin camaatı arasında yaxşılığa əmr verib, pisliyi rədd edən islahatçılar olduqda, onlar həlak edilməzlər. Uca Allah belə buyurur:* ***«Məmləkətlərin əhalisi əməlisaleh olduğu ikən Rəbbin onları haqsız yerə məhv etməz!» (Hud, 11/117).*** *Çünki islahatçılar, əməlisaleh olanlardan fərqli olaraq, insanların nöqsanlarını düzəltməyə çalışırlar.*

*3. Allah cəmiyyətləri məhv edərkən Öz ədalətinə əsaslanır. Xalqlar ancaq Allahın elçilərinin xəbərdarlığından sonra məhv edilirlər. Çünki Uca Allah:* ***«…Biz peyğəmbər göndərməmiş [****Heç bir ümmətə****] əzab verməri k!» (İsra, 17/15), -*** *deyə buyurur.*

*4. Naz-nemət içində yaşamaqdan çəkindirilirik. Çünki bu itaəti unutmağa, günahkarlığa sövq etdirir və sonra da tamamilə kökündən məhv olunmağa doğru aparır.*

*5. Qəza-qədər və habelə ilahi ədalətə iman əqidəsi qeyd olunur.*

---

[Σ155] *Pis əməllərin müqabilində hamıya üz verə biləcək* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 251)

## *Uca Allahın: «Səni şaşqın vəziyyətdə tapıb yol göstərmədimi?!» (Zuha, 93/7) ayəsinin anlamı*

*Görkəmli elm xadimi Məhəmməd əl-Əmin Əş-Şinqiti yanlış başa düşülmənin qarşısını almaq məqsədilə aşağıdakıları söyləyir:*

*Bu kərim ayənin zahiri mənasından Peyğəmbərin (sallallahu əleyhi və səlləm) ona vəhylər nazil olmamışdan öncə zəlalət içində olduğu təsəvvürü yaradırdı. Halbuki Uca Allah:* ***«…Üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə tərəf tut…» (Rum, 30/30)*** *– deyə buyurur və bu buyruq Peyğəmbərin (sallallahu əleyhi və səlləm) hənif dininə görə yaradıldığını göstərir. Aydın görünən bu xüsusiyyət ondan ibarətdir ki, ata-anası onu nə yəhudi, nə xristian, nə də atəşpərəst etməyiblər. Əksinə, o, Uca Allah onu elçi kimi göndərincəyə qədər, fitrətən dəyişməmişdir. Buna isə o, Hira mağarasında ibadətlə məşğul olarkən vəhyin ona nazil olmasından sonra sabitləşən xüsusiyyətləri sübutdur. Vəhyin nazil olmasından əvvəl onun yerinə yetirdiyi ibadətlər Məhəmməd Peyğəmbərin (sallallahu əleyhi və səlləm) öz fitrətinə sadiq qalmasına aydın bir dəlildir.*

*Uca Allahın:* ***«Səni şaşqın vəziyyətdə tapıb yol göstərmədimi?!»*** *ayəsinin mənası aşağıdakı kimi: Nə fitrətlə, nə də ağılla dərk edilməsi mümkün olmayan və ancaq vəhy nazil edilməsi vasitəsilə bilinən və habelə hazırda bildiyin şəriət hökmləri və dini elmlərin sirlərindən qafil olduğun halda, səni tapıb sənə nazil etdiyi vəhylə bunlara nail olmadınmı? – deyə, bildirilir. Allahın vurğuladığı «şaşqınlıq (zəlalət)», bu şərhə görə, bilikdən uzaq olma anlamındadır.*

*Uca Allahın:* ***«…Əgər biri [****şəhadəti****] unudarsa, o birisi onun yadına salsın…» (Bəqərə, 2/282)*** *buyruğu da bu mənada işlədilmişdir. Uca Allahın:* ***«[****Musa****] belə cavab verdi: «…Rəbbim xəta etməz və unutmaz!» (Taha, 20/52)*** *buyruğu*

*ilə:* ***«Onlar: «Allaha And olsun ki, sən yenə öz köhnə yanlışlığında qalmaqdasan!» - dedilər» (Yusuf, 12/95)*** *buyruqları da bu mənada işlədilmişdir. Sonra, buna Uca Allahın:* ***«…Sən kitab nədir, iman nədir bilməzdin…» (Şura, 42/52)*** *buyruğu da dəlildən ibarətdir. Çünki «iman» ifadəsinin işlədilməsindən məqsəd İslam dininin şəriət hökmlərindən ibarət olmasını bəyan etməkdir.*

*Uca Allahın məqsədi:* ***«…Hərçənd ki, sən əvvəlcə əsla xəbərdar deyildin» (Yusuf, 12/3)*** *buyruğu ilə* ***«…sənə…bilmədiklərini öyrətdi…» (Nisa, 4/113); «Sən Quranın sənin özünə nazil olacağına ümid etmirdin. Ancaq o, Rəbbindən bir mərhəmət olaraq sənə göndərildi…» (Qəsəs, 28/86)*** *buyruqları da yuxarıdakı müddəanı göstərir.*

*Bir nəzər nöqtəsinə görə «şaşqın vəziyyətdə» ifadəsi ilə Peyğəmbərin (sallallahu əleyhi və səlləm) kiçik yaşlarında Məkkənin dar küçələrində, digər baxışa görə isə, Peyğəmbərin (sallallahu əleyhi və səlləm) Şama səfər edərkən yolu azmasına işarədir. Doğrusunu ən yaxşı bilən Allahdır. Elmi Allaha tapşırmaq daha yaxşıdır. (Ədvaul-Bəyan, IX, 334)*

## *Kafirlərə bənzəməyə çalışmanın qadağan edilməsi*

*Uca Allah buyurur ki:*

***«Ey iman gətirənlər! «Raina»[Σ156] deməyin, «unzurna» söyləyin, eşidin! Kafirləri şiddətli əzab gözləyir» (Bəqərə, 2/104)***

---

[Σ156] *Bu söz ərəb dilində «bizi qoru», «bizdə gözün olsun», «bizə bax», «bizi gözlə», «bizə qayğı və ehtiram göstər» mənalarında işləndiyi halda, ibrani dilində yuxarıdakı mənalarla yanaşı, «bizə çobanlıq et», «bizim çobanımız»,*

*Hafiz İbn Kəsir ayənin təfsirində deyir ki:*

*Uca Allah mömin qullarına söz və əməlləri ilə kafirlərə bənzəməyə can atmalarını qadağan etmişdir. Belə ki, yəhudilər danışıqlarında kiçildici məqsədlərlə birdən çox məna verməsi ehtimalı olan ibarələr işlədirdilər (Allah onlara lənət etsin). Buna görə, onlar «bizi dinlə, bizə qulaq as» demək istədikdə, «raina» deyirlər və bununla axmaqlıq və biliksizlik mənasını verən «ər-rauna»nı nəzərdə tuturdular. Beləliklə, Uca Allah belə buyurur:* ***«Yəhudilərin bir qismi [****Tövratdakı****] sözlərin yerini dəyişib təhrif edir və dillərini əyərək dinə [****İslama****] tənə vurmaq məqsədilə [****sənə qarşı****]: «Eşitdik və qəbul etmədik; eşit, eşitməz olasan [****kar olasan****] və raina», - deyirlər. Əgər onlar: «Eşitdik və itaət etdik; eşit və bizə tərəf bax!», - desəydilər, əlbəttə, onlar üçün daha xeyirli və daha doğru olardı. Lakin Allah onları öz küfrləri ucundan lənətə düçar etmişdi. Onların yalnız az bir hissəsi iman gətirmişdir». (Nisa, 4/46)***

*Onlar salam verdikləri zaman ölüm mənası verən «əs-səm» kəlməsini işlədərək «əs-səəmu aleykum» dediklərinə dair bir sıra hədislər rəvayət edilir. Buna görə Uca Allah bizə:* ***«Və aleykum (sizə də olsun)»*** *- deyə əvəz çıxmağımızı əmr etmişdir. Bizim onlara etdiyimiz qarğış qəbul olunur, amma onların bizə etdikləri qəbul edilmir. Bundan məqsəd Uca Allahın möminlərə söz və əməlləri ilə kafirlərə oxşamalarını qadağan etməsidir. Uca Allah belə buyurur:*

***«Ey iman gətirənlər! «Raina» deməyin, «unzurna»*** *(«bizə də bax»)* ***söyləyin, eşidin!Kafirləri şiddətli əzab gözləyir».***

---

*«ay səfeh» mənalarında da işlədilir. Yəhudilər həmin sözdən Peyğəmbərə (sallallahu əleyhi və səlləm) qarşı bir istehza vasitəsi kimi istifadə edirdilər.* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 129)

*Səhih bir sənəd əsasında Peyğəmbərin (sallallahu əleyhi və səlləm) belə buyurduğu rəvayət edilmişdir:*

*«Mən qiyamətdən az öncə qılıncla göndərildim ki, tək olan Allaha heç bir şərik qoşmadan ibadət edilsin. Ruzim nizəmin kölgəsində təqdir edilmişdir. Zəlil olmaq və alçalmaq isə mənim əmrimə qarşı çıxanlar barəsindədir və hər kim ki, bir tayfaya bənzəməyə çalışarsa, o da onlardandır» (Səhih hədis kimi Əhməd və başqaları tərəfindən rəvayət edilmişdir.)*[R13]

*Hədisdə sözləri, hərəkətləri, geyimləri, bayramları, ibadətləri və daha başqa, bizə şəriətlə yol verilməyən və bizim eyni şeyləri etməyimiz qəbul olunmamış digər bütün məsələlərdə kafirlərə bənzəməyə səy göstərmə haqqında ağır bir qadağa və hədələmə qoyulmuşdur.*

*Bir də, sənədlə sübuta yetirildiyinə görə Abdullah b. Məsud onun yanına gələn və: «Mənə bir məsləhət ver» deyən bir adama belə demişdir: Sən Uca Allahın:* ***«Ey iman gətirənlər!» -*** *deyə buyurduğunu eşitdiyin yerdə ona qulaq as, diqqətlə dinlə. Çünki şübhəsiz ki, o, ya əmr etdiyi bir xeyirdir, ya da yasaqladığı bir şər.*

*İbn Cərir demişdir ki: Bizə görə doğru olan budur: Şəni Uca olan Allah möminlərə peyğəmbərinə «rainə» demələrini qadağan etmişdir. Çünki bu, Uca Allahın peyğəmbərinə deyilməsini yaxşı qarşılamadığı bir sözdür. Eynilə Peyğəmbərin (sallallahu əleyhi və səlləm) söylədiyi aşağıdakı hədisdə olduğu kimi: «Siz üzümə «əl-kərm» deməyin, onun yerinə «əl-həbələ» (salxım) deyin. Siz «mənim qulum» deməyin, lakin «mənim gənc igidim»*

[R13] Şeyx Əlbani «əl-İrva» (5/109, hədis 1269) əsərində bu hədisin həsən isnadlı olduğunu bildirmişdir.

*deyin». (Hədisin birinci hissəsini Muslim, ikinci hissəsini Əhməd rəvayət etmişdir. Hədis səhihdir. I, 148)*[R14]

***Ayədən çıxan bəzi nəticələr***

*1. Sözlərində, hərəkətlərində, geyimlərində, adətlərində, bayramlarında, ibadətlərində özünü kafirlərə bənzətmək qadağan edilmişdir. Lakin təyyarə, tank, sualtı qayıqlar və buna bənzər müsəlmanları qüvvətləndirməyə kömək edən müasir kəşflərdə kafirlərin etdiklərini etməyə çalışmaq yolveriləndir*[Σ157]*, hətta vacibdir. Çünki Uca Allah:* ***«…kafirlərə qarşı bacardığınız qədər qüvvə … tədarük edin…» (Ənfal, 8/60)*** *deyə buyurmuşdur.*

*2. Peyğəmbərlə (sallallahu əleyhi və səlləm) davranmaq üçün zəruri olan ədəb-ərkana yiyələnmək və onun dərəcəsi ilə uzlaşmayan sözlərlə ona müraciət etməmək lazımdır. Məsələn, hörmətini azaltmaq üçün yəhudilərin Peyğəmbərə (sallallahu əleyhi və səlləm) söylədikləri «raina» kimi bir söz deyilməməlidir.*

*3. İşlədilməsi qadağan edilmiş bəzi kəlmələr vardır: Üzümə kərm demək kimi. Bunun əvəzinə «əl-həbələ» deyilir. Həmçinin «mənim qulum» deyilməyərək, bunun yerinə «mənim gənc igidim» deyilməlidir.*

---

[R14] Hədisin ikinci hissəsi, əsli baxımdan nəinki imam Əhməd (2/444, hədis 9727), hətta Buxari (h. 2552) və Muslim (h. 2249) tərəfindən də rəvayət edilmişdir.

[Σ157] Çünki çağdaş zəmanəmizdə silah və texniki vasitələr ümumbəşəri təhlükəsizlik və təhlükə anlayışları ilə bağlı və onların sırasına daxil olduğu üçün, onlar şəriətin qadağan etdiyi yasaq obyektləri ilə eyniləşdirilə bilməz. Allahın son dini olan İslamın müzəffər qələbəsi uğrunda düşmənin bütün imkanlarından yararlanmaq heç də ona bənzəmək mahiyyəti daşıya bilməz. Burada məqsəd və hədəflər Uca Allahın hökmləri ilə müəyyənləşdirilmişdir və kafirlərə adekvat deyildir.

## *Rəhmanın qullarının keyfiyyətləri*

*1. Uca Allah buyurdu ki:* ***«Rəhmanın bəndələri o kəslərdir ki, onlar yer üzündə təmkinlə gəzər…» (Furqan, 25/63).*** *Onların keyfiyyətlərindən biri də yer üzündə sakit, ağır-ağır və təvazökarlıqla yeriməläri, təkəbbürlənərək ayaqlarını yerə şəstlə vura-vura getməmələridir. Beləlikl, Uca Allah buyurur:* ***«Yer üzündə təkəbbü1rlə gəzib dolanma. Çünki sən nə yeri yara bilər, nə də yüksəlib dağlara çata bilərsən» (İsra, 17/37)***

*İbn Kəsir demişdir ki: «Yer üzündə təkəbbürlə gəzib dolanma», yəni cüssəlilərin yeridiyi kimi lovğalanaraq və sağ-sola əzilib büzülməklə yerimə! Çünki sən yerişinlə yeri yara bilməyəcəksən.*

*«Nə də yüksəlib dağlara çata bilərsən», yəni əzilib büzülməklə, lovğalanmaqla, özünü bəyənməklə bu qədər uzanmayacaqsan. Əksinə, özünü belə aparan adam məqsədinin tam ziddinə olaraq, hələ bir cəzalandırıla da bilər. (Təkəbbürlə davrananlar qiyamət günü zərrə dənəcikləri mislində olacaqlar.)*

*2.* ***«…cahillər onlara söz atdıqları zaman [****onları incitməmək üçün****] salam deyərlər» (Furqan, 25/63)*** *Yəni, səfehlər pis sözlərlə onlara müraciət etsələr, oxşar sözlərlə onlara cavab qaytarmazlar. Əksinə, onlar əziyyət verməyən və günah olmayan sözlər deyərlər. Pisliyə qarşı ən gözəl sözlər işlətmək məqsədilə onlar «sələmun əleykum» da, digər nəzakətli sözlər də deyə bilərlər. Bu, bağışlamaq və yaxud incikliyi unutmaqla da ola bilər. (Bax: Qasimi təfsiri)*

*3.* ***«Onlar gecəni Rəbbi üçün səcdə və qiyam içində keçirər». (Furqan, 25/64)*** *Gecənin bir hissəsində namaz*

*qılar, ayaq üstə dayanar və dua edərlər. Çünki Uca Allah onların xasiyyətləri ilə bağlı olaraq aşağıdakıları deyir:*

***«Onlar ibadət üçün yataqlarından qalxar, qorxu və ümid içində Rəbbinə dua edər və onlara verdiyimiz ruzilərdən sərf edərlər» (Səcdə, 32/16)***

*Allahın Elçisi (sallallahu əleyhi və səlləm) buyurub ki: «Hər kim gecələr oyanaraq səslə:*

*«Tək və şəriki olmayan Allahdan başqa heç bir tanrı yoxdur. Səltənət (hökmranlıq və hakimiyyət) yalnız Onundur. Hər cür həmdsənalar təkcə Ona məxsusdur. Onun gücü hər şeyə çatır. Allah hər növ çatışmazlıqlardan uzaqdır. Təkcə Ona həmdsəna edirəm. Ondan başqa heç bir tanrı yoxdur. Allah ən böyükdür. Allahla bir olmadıqca heç bir şeyə güc gəlmək olmaz, taqət qalmaz» dedikdən sonra: «Allahım, mənə bağışlanma nəsib et» deyilər və yaxud da dua edilərsə, dua qəbul olunar. Əgər dəstəmaz alıb, namaz qılarsa, namazı qəbul olunar». (Buxari və başqaları)*

*Mən bu duanı oxudum və duam qəbul edildi.*

*4.* ***«Və belə deyərlər: «Ey Rəbbimiz! Cəhənnəm əzabını bizdən sovuşdur. Şübhəsiz ki, onun əzabı həmişəlikdir! Doğrudan da, o, nə pis məskən, nə pis yerdir!» (Furqan, 25/65-66)***

*Onların xüsusiyyətlərindən biri də Cəhənnəm əzabını onlardan uzaqlaşdırması üçün Rəbbinə dua etmələridir. Çünki Cəhənnəm əzabı əbədi olacaqdır. Orada qalmaq və orada olmaq necə də pisdir! Kərim ayədən göründüyü kimi, Allaha Cəhənnəm odundan qorxduqları üçün ibadət etmədiklərini söyləyən sufilərin iddiası rədd edilir.*

*5.* ***«Onlar [****mallarını****] xərclədikdə nə israfçılıq, nə də xəsislik edər, bu ikisinin arasında orta bir yol tutarlar». (Furqan, 25/67)***

*Uca Allah onları orta yolu tutmaqla səciyyələndirmişdir. Onlar çəkdikləri xərclərində israfçılığa yol vermədikləri kimi, xəsislik edib özlərini və ailə üzvlərini də darda qoymazlar. Onlar orta yol adamıdırlar.*

*Təbəri ayənin təfsirində bunları deyir:*

*«Uca Allahın burada xərcləmədə israfdan danışarkən nəzərdə tutduğu məqsəd Öz qullarına mübah*[Σ158] *bildiyi həddi aşmaqdır.*

*Xəsislik etmək (ərəb. iqtər - red) isə Allahın buyurduğundan da az xərcləməkdir. Orta yol isə iksinin arasında olandır».*

*Bu ayənin mənasını Uca Allah aşağıdakı buyruğu ilə açıqlayıb:*

***«Nə əldən çox bərk ol, nə də əlini tamamilə açıb israfçılıq et. Yoxsa həm qınanarsan, həm də peşman olarsan!» (İsra, 17/29)***

*Uca Allah xəsisliyi qınayıb, israfçılığı qadağan etmiş və qənaətlə dolanmağı əmr edərək buyurmuşdur ki: Sən kimsəyə heç bir şey verməyən, xeyrxahlığa maneə törədən bir xəsis olma. İmkanından artığını, gəlirindən daha çox xərcləməkdə həddini aşma, israfçılıq etmə! Çünki sən xəsislik etsən qınanarsan. İnsanlar səni qınayar, məzəmməd edər və səni lazım olan adam kimi qəbul etməzlər. Bacardığından artıq əliaçıq olsan, vaxt gələr çarəsiz (əl-həsir) qalarsan, xərcləməyə bir şey tapmazsan. Həsir – hərəkət edə bilməyən, taqətsizliyindən və acizliyindən yerindən tərpənməyən minik hevanına deyilir. Məhz İbn Abbas və əl-Həsən bu kərim ayənin toxunulan xəsislik və israfçılığın qadağan edilməsi məqsədiylə*

---

[Σ158] ***Mübah*** – işlədilməsində savab və günah olmayan bir şey

*deyildiyini bildirmək üçün açıqlamışlar. (Bax: İbn Kəsi, III, 37)*

*6.* ***«Onlar Allahla yanaşı başqa bir tanrıya ibadət etməz…» (Furqan, 25/68)***

*Həqiqətən, bu əhəmiyyətli bir xüsusiyyətdir. Allahın qullarının Onun Təkliyini (Vahidliyini) qəbul etmələri, bütün ibadətlərində, əlaxüsus da dua etdikləri zaman Ona heç kəsi şərik qoşmadıqları bəllidir. Çünki dua da ibadətdir. Xüsusilə də, Allahdan başqa – ölülərə də (ya peyğəmbər olsun, ya da övliya) dua etmək xeyirli əməlləri puç edən şirkin növlərindəndir. «Allahın Peyğəmbərindən (sallallahu əleyhi və səlləm) «Hansı günah daha böyükdür» soruşulduqda: «Səni Yaradana tay qoşmağın» deyə cavab vermişdir». (Buxari və Muslim)*

*7.* ***«…Allahın haram buyurduğu cana nahaq yerə qıymaz…» (Furqan, 25/68)***

*Allahın qullarının başqa bir xüsusiyyəti də onların Allahın haram etdiyi canları öldürməməsidir. Qız uşaqlarını diri-diri basdırmaq və digər hallar da bu qəbildəndir. Ancaq öldürülmənin haramlığını aradan qaldıran hallar istisnadır. Mürtədlik edən, başqasını qəsdən öldürən, yer üzündə fitnə-fəsad törədənlər kimi. Bunlar ədalətli hökm əsasında öldürülənlərdilər.*

*8.* ***«…zina etməzlər…» (Furqan, 25/68).***

*Rəhmanın qulları zinaya yaxınlaşmazlar. Çünki o, həyasızlıq və pis bir yoldur. O, həm insana və həm də cəmiyyətə zərərlidir. Müxtəlif xəstəliklərə səbəb olur, ailələri dağıdır və özündə başqa təhlükələr daşıyır.*

***«…Hər kəs bunu etsə, cəzasını çəkər. Qiyamət günü onun əzabı qat-qat olar və [****o, əzab****] içində zəlil olub əbədi qalar» (Furqan, 25/68-69)***

*Allahdan qeyrisinə dua etmək, canı nahaq öldürmək və zina etmək kimi qeyd olunan böyük günahların hər hansı birini törədən şəxs qiyamət günü bir cəza kimi əzabının təkrarlanması, zəlil və yazıq vəziyyətdə o əzaba əbədi məhkum edilməsi kimi bir cəza ilə qarşılaşacaqdır.*

*Ancaq bütün törətdiklərindən elə bu dünyada Uca Allaha «tövbə edənlər istisnadır». Şübhəsiz ki, Uca Allah qoyduğu şərtlərinə uyğun olaraq tövbə edənlərin tövbəsini qəbul edir.*

*9.* ***«O kəslər ki, yalan şahidlik etməzlər…» (Furqan, 25/72)***

*Təbəri deyib ki: ayənin təfsirinə yanaşmalar arasında həqiqətə ən yaxın olanı aşağıdakı kimi deyilmişdir:*

*Şirk, mahnı, yalan və buna bənzər «uydurma» (yalan) adının verildiyi hər bir şeyə şahid olmayan, şahidlik etməyən şəxslərdir. Çünki Allah onların əsas keyfiyyətləri baxımından yalan şahidlikdə iştirak etmədiklərini bildirir. Bilavasitə xəbər və ya əməl kimi qəbul edilməsi lazım gələn bir dəlil tapılmadıqca onlar hər hansı bir şeyə zəmanət vermirlər. Allahın Elçisi (sallallahu əleyhi və səlləm) də belə buyurmuşdur:*

*«Sizə böyük günahların ən böyüyünü xəbər verimmi?» - deyə üç dəfə soruşdu. Biz: Ver, ey Allahın Elçisi, dedik. Belə buyurdu: «Allaha şərik qoşmaq, ata-anayla ədalətsiz davranmaq». O yerə söykənərək oturdu və belə buyurdu: «Diqqət edin, bir də yalan söz, diqqət edin, bir də yalan şahidlik». Bu sözləri o qədər təkrarladı ki, kaş ki, sakitləşəydi, deyə ürəyimizdən keçirtdik. (Buxari və Muslim)*

*10. «…**faydasız bir şeylə rastlaşdıqları**[Σ159] **zaman onlardan üz çevirib vüqarla keçərlər» (Furqan, 25/72)***

*Ondan üz çevirərək xoşluq və təmkinlə onu geridə qoyaraq gedərlər. Təbəri deyir ki, bu barədəki baxışlar arasında məncə, həqiqətə ən yaxın olan belədir: Uca Allah təriflədiyi bu möminlərə dair xəbər verərək, onların faydasız sözlərin və işlərin yanından şərəflə üz çevirib getdiklərini bildirir. Faydasız (boş iş və söz) ərəb dilində əsli və həqiqiliyi olmayan, batil olan, ya da çirkin görünən hər bir işin ifadə edildiyi məfhumdur. İnsanın başqa bir insanı reallıqla əlaqəsi olmayan yalan sözlərlə söyməsi faydasızdır. Çirkin sayılan bəzi yerlərdə evlənməkdən açıq ifadələrlə bəhs edilməsi də faydasızlıqdan irəli gəlir. Eyni formada da müşriklərin tanrıçalarına təzim etmələri isə, ibadət etdikləri varlığın, onların etdikləri qaydaya uyğun bir həqiqətin olmadığından ötrü, saxtakarlıqdır. Mahnı dinləmək isə din əhli arasında çirkin sayılan işlərdəndir. Belə olduğu halda, bütün bunlar hamısı bir yerdə faydasızlığın əhatə dairəsinə daxil olur. Bilavasitə, faydasız kimi, açıqlanması zəruri olan hər hansı bir şey üçün deyilənlərin bir hissəsi nəzərdə tutulmuş və digər bir hissəsi isə nəzərdə tutulmamışdır deyilişi aydınlaşdırıcı aspektə malik deyil. Çünki söylənən hər hansı bir xəbərin və yaxud, əqli baxımdan, belə bir düzəlişin edilməsinə dair sübut aşkar olunmamışdır.*

*11. **«O kəslər ki, Rəbbinin ayələri zikr olunduğu vaxt özünü onlara qarşı kar və kor kimi aparmaz» (Furqan, 25/73)***

*İbn Kəsir demişdir ki, bu möminlərin xasiyyətlərindəndir:*

***«Möminlər yalnız o kəslərdir ki, Allah adı çəkiləndə ürəkləri qorxudan titrəyər, Allahın ayələri oxunduğu zaman***

---

[Σ159] *Lağlağı bir söhbət eşitdikləri zaman* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 422)

***həmin ayələr onların imanlarını daha da artırar, onlar ancaq öz Rəbbinə təvəkkül edər» (Ənfal, 8/2)***

*Amma kafir bu keyfiyyətlərə malik deyil. O, Allahın kəlamını dinlədiyi zaman ondan təsirlənməz. Halında hər hansı bir dəyişiklik baş verməz. Əksinə, o, küfründə, azğınlığıında, biliksizliyində və yolunu azmaqda davam edib gedər.*

*Uca Allahın: «özünü onlara qarşı kar və kor kimi aparmaz» buyruğu ilə bağlı olaraq əş-Şəbidən, bir qrup adamlar səcdə edərkən onların (niyə) belə etdiklərini eşitməyən bir şəxsin də onlarla birlikdə səcdə etməsi haqda soruşduqda, o, bu: «O kəslər ki, Rəbbinin ayələri zikr olunduğu vaxt…» buyruğu oxudu.*

*Bu o demək idi ki, onlarla birgə səcdə etməsin. Çünki o, səcdə əmri barədə düşünmək imkanı tapmamışdır. Mömin insanın isə təsadüfən rast gəldiyi tanımadığı adamlara elə o saat tabe olması lazım deyil. Əksinə, o, görəcəyi işi uzaqgörənliklə, qəti qənaətə gəldikdən və aydınlaşdırdığı səbəbə istinad edərək yerinə yetirməlidir.*

*Qatədə Uca Allahın: «O kəslər ki, Rəbbinin ayələri zikr olunduğu vaxt özünü onlara qarşı kar və kor kimi aparmaz» ayəsinin təfsiri haqqında aşağıdakıları söyləyir: Uca Allah buyurur ki, onlar Onun ayələri oxunarkən kar və kor deyildilər. Allaha and içirəm ki, onlar haqdan gələni dərk edən və Onun Kitabından eşitdiklərindən faydalanan insanlar idilər». (İbn Kəsir, III, 329)*

*12.* ***«Və o kəslər ki: "Ey Rəbbimiz, bizə zövcələrimizdən və uşaqlarımızdan gözümüzün işığı olacaq övladlar ehsan buyur…" – deyərlər».***

*İbn Kəsir demişdir ki, bu buyruqla bellərindən və nəsillərindən gələnlərdən Allaha itaət edən, Ona heç bir*

*varlığı şərik qoşmadan camaatla və təklikdə ibadət edən şəxslər yaratması üçün dua edənlər nəzərdə tutulur.*

*a. İbn Abbas demişdir ki, Allaha itaət etməklə bağlı olan işləri yerinə yetirməklə dünyada da, axirətdə də üzlərini ağ edəcək insanlar*[Σ160] *nəzərdə tutulur.*

*b. İkrimə demişdir ki, onlar bu sözlərilə gözəlliyi və yaxud gözəl görünüşü nəzərdə tutmurdular. Onlar öz nəsillərindən törəyənlərin Allaha ibadət edənlərdən olmalarını istəyirdilər.*

*c. Həsən Bəsridən bu kərim ayə haqqında soruşulduqda, o, belə cavab vermişdi ki, bu, Uca Allahın müsəlman bəndəsinə onun zövcəsinin, qardaşının, çox istədiyi dostunun Allaha itaət etdiyini göstərməsidir. Allaha and olsun ki, müsəlman üçün Allaha itaət edən bir övlad və ya bir nəvə, bir qardaş, çox istədiyi dost görməkdən də böyük bir gözaydınlığı*[Σ161] *olacaq bir şey yoxdur.*

*13.* ***«...və bizi müttəqilərə imam [****rəhbər****] et».*** *Yəni, bizi başqalarına doğru yol göstərən insanlardan et.*

*İbn Kəsir deyir ki, İbn Abbas, əl-Həsən və əs-Suddi belə demişlər: Sən bizi, xeyirə aparan yolda itaət edilən rəhbərlərdən et.*

*Digərləri isə: Sən bizi doğru yola çağıran, doğru yola aparan, xeyirə səsləyən kimsələrdən et, - deyə şərh etmişlər.*

***«Məhz beləleri səbr etdiklərinə görə cənnət guşəsi ilə mükafatlandırılacaq, orada ehtiramla, salamla qarşılanacaqlar. Onlar orada əbədi qalacaqlar…» (Furqan, 25/75-76)***

---

Σ160 Yəni, əməli saleh insanlar.

Σ161 Burada: əməli saleh insanların yetişməsi ilə bağlı müjdə, xoş xəbər.

*İbn Kəsir demişdir ki, Uca Allah mömin qullarının haqqında bəhs edilən gözəl keyfiyyətlərini, sözlərini və əməllərini qeyd etdikdən sonra, «məhz onların», yəni bu keyfiyyətlərə sahib olanların qiyamət günü Cənnət deyilən «hündür bər-bəzəkli evlərlə» mükafatlandırılacaqlarını bildirir. Bu, onların «səbr etdiklərinə görədir», yəni bütün bunları yerinə yetirəcəkləri halda, Allahın vədi gerçəkləşəcəkdir.*

*«Və onlar orada» Cənnətdə «ehtiram və salamla qarşılaşacaqlar». Yəni orada onlara salam veriləcək, hörmət göstəriləcək, onlar diqqət və ehtiramla qarşılanacaqlar. Salam (sağlamlıq) onlara məxsusdur və onlara «sizə salam olsun» deyiləcəkdir. Çünki hər bir qapıdan mələklər onların yanına gələcək və «səbr etdiyinizə görə sizə salam olsun, axirət yurdunun aqibəti necə də gözəldir» deyəcəklər.*

*«Onlar orada əbədi qalacaqlar» buyruğu – orada yerləşdiriləcəklər, başqa bir yerə köçürülməyəcəklər, ölməyəcəklər və oradan heç yerə getməyəcəklər mənasındadır.*

*«O nə gözəl qərargah və daimi məskəndir» buyruğu isə, «görünüşü etibarilə gözəl bir yer, dincəlmək və gecələmək üçün rahat olan bir məkan» olduğunu bildirir. (III, 333)*

***Bu ayələrdən çıxarılan bəzi nəticələr***

*1. Təvazökarlığın, hərəkətdə olarkən sakitliyə riayət etməyin üstünlüyü və özünü yüksək tutmağın haram edilməsi.*

*2. Pisliyə yaxşılıqla cavab verməyin üstünlüyü.*

*3. Gecələr namaz qılmaq və dua etmək üstün tutulan bir əməldir.*

*4. Xərcləməkdə nə xəsis, nə də israfçı olmamaq yaxşı xasiyyətdir.*

*5. Şirk, adam öldürmək və zinakarlıq haramdır.*

*6. Şərtlərinə uyğun olaraq edilən tövbə günahları silir.*

*7. Yalançıya şahid olmaq və yalandan şahidlik etmək haramdır.*

*8. Boş və mənasız şeylərdən uzaq olmaq alicənablıqdandır.*

*9. Quranı oxuyub yaxşıca düşünmək və ona lazımınca əməl etmək çox dəyərli bir işdir.*

*10. Rəhman Allahın qullarının keyfiyyətlərinə sahib olanlar üçün Cənnət, Allahın qayğısı və nəvazişi nəzərdə tutulmuşdur.*

## *Uca Allahın yoluna dəvət necə edilir?*

*Uca Allah buyurur ki:*

***«[**Ya Rəsulum!**] İnsanları hikmətlə, gözəl öyüd-nəsihət ilə Rəbbinin yoluna dəvət et, onlarla ən gözəl surətdə mübahisə et…» (Nəhl, 16/125)***

*İbn Kəsir bu ayənin təfsirində deyir ki:*

*Uca Allah Elçisi Məhəmmədə (sallallahu əleyhi və səlləm) insanları Allahın yoluna hikmətlə dəvət etməsini əmr etmişdir.*

*İbn Cərir demişdir ki, **hikmət** – Allahın Peyğəmbərinə (sallallahu əleyhi və səlləm) nazil etdiyi **Kitab** və **Sünnə**dir, gözəl öyüd-nəsihət və Quranda göstərildiyi kimi insanları pislik etməkdən saxlayan, onların başına gələn qəzaları onlara xatırlatmaqdır. İnsanlara Allahın əzabından çəkinmələri üçün məhz bunları xatırlat!*

*«Onlarla ən gözəl surətdə mübahisə et» də onlardan mübahisə və mübarizəni zəruri sayanlarla ən gözəl tərzdə mehribanlıqla, xoş müraciət vasitəsilə mübahisə et və çəkiş. Uca Allahın:* ***«Kitab əhlinin zülm edənləri istisna olmaqla, onlarla ən gözəl tərzdə mücadilə edin!..» (Ənkəbut, 29/46)*** *buyruğunda olduğu kimi. Uca Allah ona yumşaq davranmasını əmr edir. Çünki Musa ilə Harunu (ikisinə də salam olsun) Fironun yanına göndərdiyi zaman aşağıdakı buyruğu ilə eyni tərzdə əmr vermişdir:*

***«Onunla yumşaq danışın. Bəlkə, öyüd-nəsihət qəbul etsin, yaxud qorxsun!» (Taha, 20/44)*** *(İbn Kəsir, II, 591)*

*İbn Qeyyim bir qədər əvvəldəki ayənin təfsirində deyir ki, Uca Allah dəvətin pillələrini insanların səviyyəsinə görə təyin etmişdir:*

*a. Haqqın əleyhinə inad göstərməyən, haqdan üz çevirməyən, ağıllı və haqqı qəbul edən bir kəs məhz hikmət yolu ilə dəvət edilir.*

*b. Haqqı qəbul etməklə yanaşı bir sıra ehtiyatsızlıqlara və ləngimələrə yol vermiş şəxslər gözəl öyüd-nəsihətlərlə dəvət edilirlər. Bu isə müjdələmə və qorxutma yolu ilə əmr və qadağaların yerinə yetirilməsidir.*

*c. İnadkarlıqla inkar edən şəxsə qarşı isə ən gözəl üsullarla mübarizə aparılır.*

*Bu ayənin mənası ilə əlaqədar olan dərketmə şəkli məhz budur. Yunan məntiqinin əsiri olanların düşündükləri kimi deyil. Çünki onlara görə hikmət açıq müqayisədir və bu hal da dəvətin bir növüdür. Gözəl nəsihət müraciət edilən müqayisədir və əslində bu, avamların dəvətidir. Ən gözəl üsulla mübarizə isə qovğalı*[Σ162] *müqayisədir. Öz növbəsində, o da təklifləri qəbul edilən çəkişmə müqayisəsi ilə mübahisə*

---

Σ162 Mübahisədoğurucu

*tərəflərinin gəldiyi nəticələri rədd etməkdir. Lakin belə bir açıqlama tərzi batildir və bu, fəlsəfi əsaslara görə qurulmuşdur. Müsəlmanların tətbiq etdiyi üsullara və din qaydalarına – haqqında bəhs edilməsi mövzumuza aid olmayan – bir çox nəzər nöqtələrindən ziddir. (Miftəhu Dəris-Səadə, I, 193)*

***Bu kərim ayədən çıxan bəzi nəticələr***

*1. İslama dəvətin vacibliyi və çağırışa tövhidlə başlamağın zəruriliyi. Belə bir dəvət hər kəsə vacib deyil. Bəziləri onu yerinə yetirsələr, digərlərindən məsuliyyət götürülər.*

*2. Dəvət zamanı işlədiləcək üsullar izah edilir. Bunlar isə dəvətin Quran və Sünnə ilə yerinə yetirilməsidir.*

*3. İnsanlar yumşaqlıqla, sərtlikdən və tündməcazlıqdan uzaq bir üslubla dəvət edilməlidirlər. Uca Allah belə buyurur:* ***«[****Ya Rəsulum!****] Allahın mərhəməti səbəbinə sən onlarla yumşaq rəftar etdin. Əgər qaba, sərt ürəkli olsaydın, əlbəttə, onlar sənin ətrafından dağılıb gedərdilər. Artıq sən onları əfv et, onlar üçün bağışlanmaq dilə, işdə onlarla məsləhətləş, qəti qərara gəldikdə isə Allaha təvəkkül et!...» (Ali-İmran, 3/159)***

## *Dəvət elmə əsaslanmalıdır*

*Uca Allah buyurur ki:*

***«[****Ya Rəsulum!****] De: «Bu mənim yolumdur. Mən və mənə tabe olan [****möminlər****] açıq-aşkar bir dəlillə Allaha çağırırıq. Allah pakdır, müqəddəsdir. Mən isə müşriklərdən deyiləm!» (Yusuf, 12/108)***

*1. Hafiz İbn Kəsir ayənin təfsirində deyir ki:*

*Uca Allah cinlərə və insanlara göndərdiyi Elçisinə (sallallahu əleyhi və səlləmə) insanlara aşağıdakıları xəbər verməsini əmr etmişdir: Onun bu yolu və Sünnəsi vahid və tək olan, şəriksiz olan Allahdan başqa heç bir tanrı olmadığına şahidlik etməyə dəvətdir. O (sallallahu əleyhi və səlləm) və Ona tabe olanlar bu müddəaya əsaslanaraq, şübhəsiz ki, təfəkkür və şəriətcə qəti bir dəlillə Allaha dəvət edirlər.*

*Uca Allahın: «Allah pakdır, müqəddəsdir» buyruğu: «mən Onun şəriki, bənzəri, tayı-bərabəri, övladı, anası, arvadı, köməkçisi və yaxud da söhbət üçün bir kimsəsinin olmasından Onu uzaq və pak sayır, müqəddəs hesab edir və Ona səcdə qılıram» kimi qəbul edilməlidir. Allah bütün bunlardan tamamilə uzaqdır, müqddəsdir və bərabəri yoxdur. (II, 495)*

*2. Təbəri də belə deyir: Uca Rəbbimiz peyğəmbəri Məhəmmədə (sallallahu əleyhi və səlləm) deyir ki: «Ey Məhəmməd, de ki, Allahın təkliyinə, bütün yalançı tanrıçaları və bütləri kənara ataraq yalnız Ona itatə etməyə, günahlardan azad olmaq üçün Ona ibadətə dəvət etməkdən ibarət olan bu iş mənim yolumdur və mənim dəvətimdir. Mən vahid və tək olan, şəriksiz olan Allaha dəvət edirəm».*

*Mən bunları qəti «bir bəsirətlə», yəni yəqinlik və elmlə dəvət etdiyim kimi, eynilə, mənə tabe olan, məni təsdiq edən və mənə iman gətirənlər də həmin fərasətlə bu yola dəvət edərlər.*

*«Allah pakdır, müqəddəsdir» buyruğu: «Allah səltənətində şəriki olmayan və yaxud Onun hökmranlığından kənarda hər hansı bir məbudun olmasından uzaqdır, pakdır və çox böyükdür» anlamını bildirir.*

*«Mən müşriklərdən deyiləm». Mən Ona şərik qoşanlardan uzağam. Onlardan deyiləm, onlar da məndən*

*deyillər. (Təbəri, Cəmiul-Bəyan, XVI, 290, Mahmud Şakirin araşdırması ilə)*

***Ayədən və təfsirindən çıxan nəticələr***

*1. Allahın tövhidinə və tövhidin bütün hallarda birinci qəbul edilməsinə dəvət etmə hökmü verilmişdir.*

*2. Tövhid – Allahdan başqa heç bir tanrının olmaması (yəni, Allahdan başqa haqq məbudun olmadığı) ilə ifadə edilir.*

*3. Dəvətçi din məsələlərində elm və bəsirətlə dəvət etməlidir. Məhz belə olduqda o, insanlar üçün faydalı olar. Biliksiz cahil isə faydadan çox zərər verər.*

*4. Uca Allah Zatında və sifətlərində şərikdən pak və uzaqdır.*

*5. Şirkdən uzaq olmaq lazımdır. Şirk – ibadət növlərindən hər hansı birini Allahdan qeyrisinə yönəltməkdir. Ölüləri və ya hazırda mövcud olmayanları köməyə çağırmaq (onlara dua etmək) və yaxud da İslama məxsus olmayan hökmləri yerinə yetirməkdir.*

*6. Elm söz və əməldən əvvəl gəlir. Çünki Uca Allah:* ***«Bil ki, Allahdan başqa heç bir tanrı yoxdur…» (Məhəmməd, 47/19)*** *– deyə buyurmuşdur. Buxari də öz «Səhihində» «Elmin söz və əməldən əvvəl gəldiyi» barədə bəhs etmişdir.*

*Bildirirəm ki, müslmanın bilik əldə etməmişdən əvvəl dəqiq bir söz söyləməsi, ya da doğru bir əməl işlətməsi mümkün deyil.*

## *Allahın və Onun Peyğəmbərinin dəvətini qəbul edin*

*Uca Allah buyurur ki:*

***«Ey iman gətirənlər! Peyğəmbər sizi, sizləri dirildəcək bir şeyə dəvət etdiyi zaman Allahın və Onun Peyğəmbərinin dəvətini qəbul edin. Bilin ki, Allah insanla onun qəlbi arasına girər və siz axırda Onun hüzuruna cəm ediləcəksiniz!» (Ənfal, 8/24)***

*1. Buxari demişdir ki, «sizləri dirildəcək» sizi islah edəcək, «dəvətini qəbul edin» çağırışına tabe olun deməkdir.*

*2. Mücahid Uca Allahın: «…sizləri dirildəcək…» buyruğu haqqa (baş əyin) deməkdir.*

*3. Qatədə demişdir ki, bu qurtuluşu, əbədi qalmanı və həyatı ehtiva edən Qurani Kərimdir.*

*4. əs-Suddi demişdir ki: «…sizləri dirildəcək şeyə…» buyruğu aşağıdakıları bildirir: Küfrlə öləndən sonra İslamla onları dirildəcəklər.*

*5. Urvə b. əz-Zubeyr deyib ki: «sizləri dirildəcək bir şeyə», yəni daha əvvəl siz zəlil olduğunuz halda Allahın onunla sizi əzizlədiyi, zəif olduğunuz halda sizi qüvvətləndirdiyi, düşmənləriniz tərəfindən məhv ediləcəyiniz halda onlara qarşı sizi qoruduğu döyüş çağırışına tabe olun deməkdir. (Bax: İbn Kəsir, II, 297)*

*Cihada dirildilmə deyilməsinin səbəbi, düşmənlərin güclərini itirməsinin müsəlmanların dirildilməsi və qüvvətləndirilməsi ilə bağlı olmasındadır. Başqa cür desək, dirildilməni, yəni əbədi həyatı zəruri edən şəhidliyə və həm*

*də həyatın cövhərini təşkil edən o dünya*[Σ163] *həyatında mükafata səbəb cihaddır. Çünki, Uca Allah belə buyurur:* ***«…Axirət yurdu isə, şübhəsiz ki, əbədi həyatdır. Kaş biləydilər!» (Ənkəbut, 29/64) –*** *Bu isə, daimi həyat deməkdi. (əl-Qasimi, Məhasinut-Təvil, VIII, 34)*

*6. əl-Fərra demişdir ki, «Sizləri dirildəcək bir şey»in deyilişindən məqsəd «işlərinizi canlandıracaq şeylərə» işarə vurmaqdır.*

*Buna görə «onların dirildilməsi» ilə bağlı beş nəzər nöqtəsi irəli sürülmüşdür:*

*1. Dünya və axirətdə işlərinin islah edilməsidir.*

*2. Dünya həyatında müsəlmanların gözəl bir qaydada xatırlanmaları, axirətdə isə əbədi həyata qovuşmalarıdır.*

*3. Axirətdə nemətlərin daimiliyidir.*

*4. Mömin olmalarıdır. Çünki kafir ölü kimi olur.*

*5. Öldükdən sonra onlar dirildiləcəklər. Bu isə, «bundan məqsəd cihaddır» deyənlərin nəzər nöqtəsinə görə edilən açıqlamadır. Çünki şəhidlər diridirlər və cihad onları, zəlil olduqları halda, ucaldar. Sanki bu yolla həyata qayıdarlar. (Bax: Zadul-Məsir, III, 339)*

*Uca Allahın: «Bilin ki, Allah insanla onun qəlbi arasına girər» buyruğuna gəlincə isə,*

*A. Qasimi demişdir ki, «bu, bir-neçə məna vermə ehtimalı olan bir buyruqdur».*

*a. Uca Allah insanın qəlbinə hakimdir. O, qəlbi istədiyi kimi çək-çevir edir. Əgər insanı hidayətə yönəltmək istəyirsə, qəlbi ilə küfr arasına, yox əgər onun zəlalətini istəyirsə, qəlbi ilə imanı arasına girir.*

---

[Σ163] Axirət

*Bu mənadakı açıqlamanı Hakim özünün Müstədrək adlı əsrində İbn Abbasdan rəvayət etmiş və səhih olduğunu bildirmişdir. Bu şərhi Peyğəmbər (sallallahu əleyhi və səlləm) tərəfindən rəvayət edilən aşağıdakı hədislər təsdiqləyir: Peyğəmbər (sallallahu əleyhi və səlləm): «Ey qəlbləri çək-çevir edən (Allahım)! Dinin üçün qəlbimə möhkəmlik ver» duasını çoxlu-çoxlu deyərdi». (Əhməd və hədisin həsən olduğunu bildirmiş Tirmizi)*

*«Adəm oğullarının qəlbləri Rəhmanın iki barmağının arasında vahid bir qəlb kimidir. Onları istədiyi kimi çək-çevir edir». Daha sonra, Allahın Elçisi (sallallahu əleyhi və səlləm) belə buyurdu: «Ey qəlbləri çək-çevir edən Allahım! Qəlblərimizi sənə itaətə yönəlt». (Muslim)*

*b. Bu buyruq, ölüm gəlməmişdən qabaq itaətə başlamaq üçün bir çağırışdır. Buna görə Uca Allahın: «Allah insanla qəlbi arasına girər» buyruğu aşağıdakıları bildirir: Onun canını alır və bu gedişlə o, əlindəki fürsəti itirir. Bu isə pak bir qəlbə sahib olmaq, onun xəstəliklərini və mərəzlərini müalicə etmək, Allahın istədiyi formada canı Ona təslim etməkdir. Məhz bu fürsəti əldən verməyin, Allaha və Peyğəmbərinə (sallallahu əleyhi və səlləm) səmimi qəlblə itaət edin. Beləliklə, ölüm insan ilə onun qəlbi arasına girməyə bənzədilmişdir. Çünki insan qəlbiylə özünə faydalı olan və ya olmayan şeyləri bilmək və dərk etmək imkanına malikdir. (Bax: Qasimi, Məhasinut-Təvil, VIII, 35)*

*Qeyd etməliyəm ki, şərəfli hədisdə mərhəmət sahibi olan Allahın barmaqlarının olmasına sübut vardır. Lakin bu, Onun Uca Zatına layiq bir formadadır, mövcud olan heç nəyə bənzədilə bilməz. Əlləri, baldırı, ayağı, üzü, Quran və Sünnədə əksini tapmış digər sifətləri də bu qəbildəndir.*

*1. «İnsan ilə qəlbi arasına girər». Mömin ilə küfr, kafir ilə iman arasına girər. (İbn Abbasdan rəvayət edilmişdir.)*

*2. Mömin ilə itaətsizlik arasına, kafir ilə tabeçilik arasına girər. (əl-Avfi, İbn Abbasdan rəvayət edilmişdir.)*

*3. İnsan ilə qəlbi arasına girərək dərk etməsinə imkan verməz. (Mücahid)*

*İbn əl-Ənbəri demişdir: yəni, kişi ilə ağli arasına girər. O halda (saleh – red.) əməllər etməyə tələsin. Çünki siz ağlınızı itirməyəcəyinizə arxayın ola bilməzsiniz. Nəticədə əvvəllər gördüyünüz işlərin əvəzini alarsınız.*

*4. Mənası budur: O, insana çox yaxındır, onun gizli saxladığından, sirlərindən heç biri Onun üçün gizli qala bilməz. (Qətadə)*

*5. İnsan ilə qəlbi arasına girər. Bilavasitə Onun icazəsi olmadan nə imana gələ bilər, nə də kafir ola bilər. (Suddi)*

*6. İnsan ilə qəlbi arasına girər. Yəni, insan ilə onun istəyi arasında maneə yaradar. (İbn Quteybənin fikridir)*

*7. İnsan ilə qəlbi və onun təmənnasında olduğu uzun ömür, kömək və daha başqa şeylərin arasına girər*[Σ164]*.*

*8. İnsan ilə qəlbi arasına ölüm vasitəsi ilə girər. O halda, ölümdən qabaq (yaxşı –red.) işlər görməyə tələsin.*

*9. İnsanla qəlbi arasına Öz elmilə girər. Bilavasitə qul qəlbində nə cür pisliklər gizlədərsə də, Allah mütləq onu bilər və o bunu Allahdan gizli saxlaya bilməz.*

*10. Qəlbinə saldığı qorxunun və ya inamının arasına girər. Qorxmasına baxmayaraq təhlükəsizlikdə olar, təhlükəsizlikdə olduğunu eşitdiyi halda, qorxar. (Zadul-Məsir, III, 340)*

---

[Σ164] Yəni, insanın bu şeylərə olan münasibətini kəsər, insanı onlardan uzaqlaşdırar, təcrid edər.

*B. Təbəri bir az əvvəl yuxarıda keçən sözlərə bənzər açıqlamaları qeyd etdikdən sonra, bunları söyləyir:*

*Uca Allah: «Bilin ki, Allah insan ilə qəlbi arasına girər»-deyə ümumi bir ifadə işlətməklə Onun qul ilə qəlbi arasına girməsini xəbər verir. Bəhs etdiklərimiz, bu məsələlərdən hər hansı birini digərinə nisbətən fərqləndirmir. Buyruğun bütün bu mənaları vermək xüsusiyyəti vardır. Qəbul edilməsi zəruri olan xəbəri fərqləndirən digər bir dəlil təsdiq edincəyə qədər, onu (xəbəri) ümumiyyətlə qəbul etmək lazımdır.*

***Ayədən çıxarılan bəzi nəticələr***

*1. Uca Allahın və Peyğəmbərinin (sallallahu əleyhi və səlləm) çağırışını, əmr edilən əməli yerinə yetirmək və qadağan edilənlərdən uzaqlaşmaq vasitəsilə qəbul etmək fərzdir. Çünki müsəlman insan və cəmiyyət məhz bu yolla həyatını qurmalıdır.*

*2. İnsan və cəmiyyətin xoşbəxt bir həat sürməsinə kömək edən xüsusiyyətlərdən biri də onların Allah yolunda cihad etməsidir. Çünki cihad, sanki bu yolla həyat tapırlar kimi onları izzətləndirir.*

*3. Ağlı başında olan hər bir müsəlmanın xəstəlik və ya ölüm gəlməzdən öncə saleh əməl sahibi olması lazımdır.*

## *Yaradılmışların zəifliyi və Yaradıcının qüvvəsi*

*Uca Allah buyurub ki:*

***«Ey cin və insan tayfası! Əgər göylərin və yerin ətrafından kənara çıxa bilərsinizsə, çıxın. Siz ancaq qüvvətlə*[Σ165] *çıxa bilərsiniz!»*[Σ166] *(Rəhman, 55/33)***

*1. Yəni siz Allahın əmri və qədərindən*[Σ167] *qaça bilməzsiniz. O sizi hər tərəfdən əhatə etmişdir. Siz Onun hökmündən xilas olmaq gücünə malik olmadığınız kimi, Onun hökmünün barənizdə həyata keçirilməsinə mane ola bilməzsiniz. Hara getsəniz də mühasirədə olduğunuzu görəcəksiniz. Bu, məhşərdə belə olacaqdır. Mələklər hər tərəfdən yeddi sırayla bütün məxluqları əhatə edəcəklər. Kiminsə bu əhatədən çıxıb başqa bir yerə getməyə gücü çatmayacaq.*

*«Buna dair güc və imkan», yəni Allahın hökmü olmadıqca, bu mümkün olmayacaq.*

***«Məhz o gün insan: «Qaçıb can qurtarmağa yer hardadır?» - deyəcəkdir». Xeyr, [****o gün****] heç bir sığınacaq olmayacaqdır! O gün [****ey insan!****] duracaq yer ancaq Rəbbinin hüzurudur!» (Qiyamə, 75/10-12)***

*Bir başqa ayədə isə Uca Allah belə buyurur:* ***«Günah qazananlara günahları qədər cəza verilər. Onları zillət basar. Onları Allahdan heç kəs qurtara bilməz. Onların üzü, sanki gecənin zülmət parçaları ilə örtülmüşdür. Onlar cəhənnəmlikdirlər, özləri də orada əbədi qalacaqlar!». (Yunus, 10/27)*** *Buna görə Uca Allah belə buyurur:* ***«[****Qiyamət günü****] sizin***

---

[Σ165] *Allahın sizə bəxş etdiyi elmin qüdrətilə* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 588)

[Σ166] *Yaxud siz oradan qüdrət və qüvvət vasitəsilə çıxa bilərsiniz ki, bu da sizdə yoxdur!* (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, səh. 588)

[Σ167] Alın yazısından.

***üstünüzə tüstüsüz alov və alovsuz tüstü göndəriləcək və siz bir-birinizə kömək də edə bilməyəcəksiniz». (Rəhman, 55/35)***

*Bütün şərhlərə görə ayənin mənası budur: Siz qiyamət günü qaçıb getmək istəmiş olsanız mələklər və cəhənnəmə məhkum edilmişləri oraya aparan cəhənnəm mələkləri geriyə dönməyiniz üçün üstünüzə alov və əridilmiş mis yağdıracaqlar. Bundan ötrü Uca Allah:* ***«…siz bir-birinizə kömək də edə bilməyəcəksiniz. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!» (Rəhman, 55/35-36)*** *– deyə buyurur. (Bax: İbn Kəsir, IV, 274)*

*2. əl-Qasimi ayənin təfsirində deyir ki:*

***«Ey cin və insan tayfası! Əgər göylərin və yerin ətrafından kənara çıxa bilərsinizsə, çıxın».*** *Yəni əgər göylərin və yerin hüdudlarını aşa bilsəniz və Rəbbinizi aciz qoya bilsəniz, Onun hegemonluq meydanında qələbəsinə güc gələrək və ölkəsindən xaricə, sizə gücü çatmayacaq bir hala gəlincəyə qədər qaça bilsəniz, «qaçın!» Tez olun, bu sərhədləri aşın və çıxıb gedin.*

*«**Siz ancaq qüvvətlə çıxa bilərsiniz!»**, yəni güc və qələbə ilə. Lakin siz bunlara necə nail ola bilərsiniz?*

*Buna yaxın bir buyruq da:* ***«Siz nə yerdə, nə də göydə [**Allahı**] aciz buraxa bilməzsiniz!» (Ənkəbud, 29/22)*** *ayəsidir.*

*3. Ayənin mənasının belə olduğu da söylənilmişdir: Əgər siz göylərdə və yerdə nələr olduğunu bilsəydiniz! Amma bilin ki, hər hansı bir qüvvə və imkan olmadan, yəni Allahdan açıq-aydın bir dəliliniz olmadan, bilməyəcəksiniz deməkdir.*

*Birinci şərh daha güclü görünür. Çünki əvvəlki ayələrdən birində Uca Allah, qulların əməllərinin əvəzinin veriləcəyinin qaçılmaz olduğunu bildirdikdən sonra «ey cin və insan tayfası …çıxa bilərsinizsə…» deyə, buyurur.*

*Beləliklə, Allah onları cəzalandırmağı istədiyi təqdirdə, onların xilas olmağa güclərinin çatmayacağı açıqlanır.*

***«Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!» (Rəhman, 55/34)***

*4. İbn Cərir deyib ki: Yəni, necə hamınızın bir-birinizə bərabər olduğunuzu yalandan deyə bilərsiniz. Axı, heç biriniz Allahın barənizdə verdiyi hökmün əleyhinə bir şey edə bilməzsiniz.*

*5. Qazi (Beydavi) demişdir ki: Qorxutma bir yaxşılıqdır. Verilən əvəzlə itaət edəni asi olandan ayırd etmək və kafirlərdən intiqam almaq isə nemətlər sayılır. (Qasimi, XV, 292-295)*

***Ayədən çıxarılan bəzi nəticələr***

*1. Uca Allahın qüdrət və sifətlərinin əzəməti açıqlanır.*

*2. Xəlq edilmişlərin Yaradıcı qarşısında dünyada da, axirətdə də aciz olduqları izah edilir.*

*3. Bütün yaradılışlar Allahın onların barəsində gerçəkləşdirməsini istədiyi bir şeyin əleyhinə gedə bilməzlər.*

*4. Ölümdən sonra dirilmə və əməllərinin əvəzinin veriləcəyinə iman gətirmə əqidəsinin vurğulanması.*

## *Surələrin başlıqlarının mənası*

*Uca Allahın:* ***«Əlif, ləm, mim», «əlif, ləm, ra», «əlif, ləm, mim, sad», «ha, mim», «ayn, sin, qaf», «nun»***-*a dair buyruqlarında adaları çəkilən bu hərflərin hansı mənaları daşımaları barədə təfsirçilər müxtəlif nəzər nöqtələrinə malikdirlər. Kimsə deyib:*

*1. Bunlar Uca Allahın biliyini ancaq Özü üçün saxladığı məsələlərdəndir və belə də təfsir etmişdir.*

*2. Bunlar surələrin adlarıdır deyərək, aşağıdakı hədisi dəlil də gətirmişlər:*

*Peyğəmbər (sallallahu əleyhi və səlləm) cümə günü sübh (fəcr) namazında* ***«Əlif, ləm, mim» (Səcdə, 1)*** *ilə* ***«İnsanın elə bir dövrü olub keçmişdir ki…» (İnsan, 76/1)*** *surələrini oxuyardı. (Buxari və Muslim)*

*Mücahid demişdir ki: «Əlif ləm mim», «ha mim», «əlif ləm mim sad» və «sad», Uca Allahın Qurani Kərimi onlarla başladığı bir sıra başlıqlardır (Yəni bunlar Quranın surələrinin adlarıdır).*

*3. Digər təfsirçilər isə deyirlər ki, bu hərflərin surələrin başlanğıcında verilməsi Quranın icazını*[Σ168] *bəyan etmək və bir-birlərinə müraciətdə istifadə etdikləri bu muqatta*[Σ169] *(bir-birindən ayrı olan) hərflərdən olmaqla onlara oxşarının yaradılmasında insanların aciz olduqlarını bildirmək üçündür.*

*Aralarında Razi və Qurtubi kimi muhəqqiqlərin*[Σ170] *də olduğu bir qrup bu nəzər nöqtəsini rəvayət etmişlər. Şeyxülislam İbn Teymiyyə də, Hafiz əl-Məzzi də bu görüşü*

---

[Σ168] ***İcaz*** – aciz qoymaq, çaşdırmaq (lüğəvi məna); möcüzə dərəcəsində doğru söz söyləmək, oxşarını yaratmaqda başqalarını aciz qoymaq; az sözlə çox şey anlatmaq. Qurandakı **icaz:** Quran ondörd əsrdir ki, bütün həqiqətlərini kainat sərgisində nümayiş etdirdikcə hər kəs, hər millət, hər məmləkət onun ləl-cəvahiratından, həqiqətlərindən almış və alır. Ötüb keçən ən amansız müharibələr, planerar fəlakətlər, kataklizmlər, qırğınlar, azğınlıqlar onun misilsiz həqiqətlərinə, gözəl üslublarına xələl gətirə bilməmiş, köhnəltməmiş, həqiqətlər xəzinəsini tükəndirə bilməmiş. Bütün bunlar **icazdır.** (Bax: Ömer Sevincgül, "Özel lüğat", İstanbul, 2003, ZAFER yayınları, 1-ci nəşr, səh. 249)

[Σ169] ***Muqatta (muqattaa)*** – bitişik olmayan, kəsik, ayrı (Bax: Əvvəlki mənbə, səh. 454)

[Σ170] ***Muhəqqiq*** – həqiqəti araşdırıb tapan tədqiqatçı İslam alimi. (Bax: Əvvəlki mənbə, səh. 444)

*qəbul etmişlər. Zəməxşəri deyir ki, bunların heç də hamısı Quranın başlıqlarında bir yerdə göstərilməmişdir. Dəvət və onun əleyhinə çıxanları tənbeh etmə daha aydın olsun deyə, hekayələrin çoxunun təkrarlandığı bir çox yerdə aydın şəkildə dəvətin təkrarlandığı kimi, təkrarlanmışdır. Bu başlanğıcların bəziləri «sad», «nun», «qaf» kimi tək bir hərflə, bəziləri «ha, mim» kimi iki hərflə, bəziləri «əlif, ləm, mim» kimi üç hərflə, bəziləri «əlif, ləm, mim, ra» və «əlif, ləm, mim, sad» kimi dörd hərflə, bəziləri «kəf, ha, yə, ayn, sad» və «ha, mim, ayn, sin, qaf» kimi beş hərflə nazil edilmişdir. Ərəblərin üslublarında kəlmələr də bu formadadır: tək, iki, üç, dörd və beş hərflidir. Bundan artıq hərfi olanı yoxdur. (Bax: İbn Kəsir, I, 60)*

*İbn Kəsir demişdir ki, buna görə o hərflərlə başlayan hər hansı surədə hökmən Quranın qələbəsi, icazı və əzəmətindən bəhs edilir. Tədqiq edildikdə görmək olur ki, bu, iyirmi doqquz surədə var. Bununla əlaqədar Uca Allah:*

***«Əlif, Ləm, Mim. Bu, heç bir şəkk-şübhə olmayan, müttəqilərə doğru yol göstərən Kitabdır!» (Bəqərə, 2/1-2);***

***«Ha, Mim! [**Bu Quran**] mərhəmətli, rəhmli [**olan Allah**] tərəfindən nazil edilmişdir» (Fussilət, 41/1-2);***

***«Əlif, Ləm, Mim, Sad. Bu, qorxutmaq və möminlərə öyüd-nəsmhət vermək üçün sənə nazil edilən Kitabdır. Ondan ötrü ürəyində bir sıxıntı olmasın!» (Əraf, 7/1-2)** – deyə buyurur.*

*4. Bu hərflərin zamanın bilinməsi üçün sübut olduğunu, onlardan müxtəlif hadisələrin, fitnələrin, müharibələrin vaxtlarının müəyyən edilə biləcəyini iddia edənlər isə haqsız olaraq belə xəyallara düşür və onların başa düşə biləcəyinə heç bir aidiyyəti olmayan məsələyə baş qoşmuş olurlar.*

*5. Şübhəsiz ki, şəni Uca Allah bu ayələri nahaq yerə nazil etməmişdir. Qurani Kərimdə dərk olunmaz və ancaq ibadət edilməli ifadələr olduğunu söyləyən cahillər çox böyük bir xəta edirlər. Çünki bu hərflərin əslində mənaları olması bir həqiqətdir. Əgər bu barədə xətadan hifz edilmiş Peyğəmbərimizin (sallallahu əleyhi və səlləm) bizə bir səhih rəvayəti gəlib çatarsa, ona uyğun olaraq şərh edərik, yox, belə bir hədis olmazsa, məsələ üzərində dayanar və:* ***«...Biz onlara inandıq, onların hamısı Rəbbimiz tərəfindəndir» (Ali-İmran, 7)*** *-deyərik.*

*İslam alimləri bu hərflər haqqında müəyyən bir qərar üzərində yekdil rəy verməmişlər. Əksinə, müxtəlif fikirlər söyləyirlər. Hər hansı bir dəlilə istinad edərək bəzi baxışların daha güclü olduğunu müşahidə edən hər kəs həmin nəzər nöqtəsini qəbul etməlidir. Əks təqdirdə, mövzu aydınlaşana qədər fəaliyyətsiz dayanmaq lazım gələcək. (İbn Kəsir)*

*6. Ən doğrusu, onların çağırış kimi nəzərdə tutulmasıdır. Sanki məna bu cürdür: Ey doğruçuluq və bəlağət sahibi olan ərəblər! Əlif, Ləm, Mim sizə yad olmayan hərflərdir… Bu nəzər nöqtəsinin düzgünlüyünün dəlili isə Uca Allahın bu hərflərdən sonra əziz Kitabından bəhs etməsidir:*

*a.* ***«Əlif, Ləm, Mim. Bu, heç bir şəkk-şübhə olmayan, müttəqilərə doğru yol göstərən Kitabdır!» (Bəqərə, 2/1-2);***

*b.* ***«Əlif, Ləm, Mim, Sad. Bu, qorxutmaq və möminlərə öyüd-nəsmhət vermək üçün sənə nazil edilən Kitabdır. Ondan ötrü ürəyində bir sıxıntı olmasın!» (Əraf, 7/1-2);***

*c.* ***«Əlif, Ləm, Ra. Bunlar hikmətlə dolu Kitabın ayələridir!» (Yunus, 10/1);***

*d.* ***«Əlif, Ləm, Ra! Bu, ayələri hikmət sahibi, agah olan [****Allah****] tərəfindən təsbit olunmuş, sonra da müfəssəl izah edilmiş bir Kitabdır…» (Hud, 11/1)***

## *Bu hərfləri necə tələffüz edirik*

*Surələrin əvvəlində gələn bu hərfləri hər biri ayrı-ayrı olmaqla birini digəri ilə bitişdirmədən tələffüz etməliyik. Çünki Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur:*

*«Hər kim Allahın Kitabından bir hərf oxuyarsa, o hərfin əvəzində ona bir xeyir olar. Xeyir on misillidir. Mən «Əlif, Ləm, Mim» bir hərfdir demirəm. Çünki Əlif bir hərf, Ləm bir hərf və Mim də bir hərfdir» (Tirmizi və başqalarının rəvayət etdiyi səhih bir hədisdir.)*

1. *əl-Bəqərə surəsinin başlanğıcında: «Əlif, Ləm, Mim»*
2. *ər-Rəd surəsinin başlanğıcında «Əlif, Ləm, Mim, Ra»*
3. *əl-Əraf surəsinin başlanğıcında «Əlif, Ləm, Mim, Sad»*
4. *Yusuf surəsinin başlanğıcında «Əlif, Ləm, Ra»*
5. *Mömin surəsinin başlanğıcında «Ha, Mim»; Nəml surəsinin başlanğıcında «Ta, Sin»*
6. *Nun, Qaf və Sad bu adlarla bir yerdə yad edilən surəsinin başlanğıcında*
7. *Məryəm surəsinin başlanğıcında «Qaf, Hə, Yə, Ayn, Sad»*
8. *Şura surəsinin başlanğıcında «Ha, Mim, Ayn, Sin, Qaf» deyə təlffüz edilir.*
9. *Bu hərflərdən bəziləri iki hərəkə (bir əlif) uzadılır. «Ha, ha, yə, ra» kimi.*

10. *Bəzi hərflər daha çox uzadılır. Nun, Qaf, Sad, Mim, Ayn» kimi.*
11. *Bu hərflərin necə tələffüz ediləcəyi Quran qarilərindən və professor-müəllim heyətindən öyrənilir.*

## *Ziyan kafirlərə, xilas möminlərədir*

*Uca Allah buyurur ki:*

***«And olsun axşam çağına ki, insan ziyan içindədir. Yalnız iman gətirib yaxşı əməllər edən, bir-birinə haqqı tövsiyə edən və səbri tövsiyə edən kimsələrdən başqa!» (Əsr, 103/1-3)***

*Axşam çağı – Adəm oğullarının xeyir və şər qəbilindən olan hərəkətlərinin içində gerçəkləşdirdiyi zamandır.*

*Malik, Zeyd b. Əsləmdən əsr (namazı) vaxtı olduğunu dediyini rəvayət edir. Ancaq məşhur olan birincisidir. Uca Allah buna görə and içərək insanın həqiqətən ziyanda, yəni həlak edilməyə məhkum olunduğunu bildirir.*

***«Yalnız iman gətirib yaxşı əməllər edən...kimsələrdən başqa!».*** *Uca Allah insan cinsindən ziyana uğrayanlar arasından qəlbiylə iman gətirərək, əzaları ilə saleh əməl işlədənləri istisna edir.*

***«...bir-birinə haqqı tövsiyə edən...»*** *haqq olan ibadətləri yerinə yetirmək, haramlardan uzaqlaşmaqdır.*

***«...səbri tövsiyə edən kimsələrdən başqa!»*** *Müsibətlərə, «alın yazısına», yaxşılıq etməklə qəbahət və haram şeylərdən özünü saxlayan kəslərdən olub düşdükləri əziyyətlərə qatlaşaraq səbrli olmağı tövsiyə edənlər müstəsnadır. (Bax: İbn Kəsir, IV, 547)*

*İmam Şəfii (A. r. e.) deyir ki, insanlar bu surə üzərində yaxşıca düşünsəydilər, onlara bəs edərdi.*

*Çünki bu surədə elə yüksək məqamlardan bəhs edilir ki, müsəlman olan bir insan bunlara tam mənasıyla nail olarsa, kamilliyin ən yüksək səviyyəsinə çatar. Birinci şərt haqqı tanımaq, ikincisi, ona lazımınca əməl etmək, üçüncüsü, onu yaxşıca bilməyənlərə öyrətmək, dördüncüsu, haqqı öyrənməyə, ona layiqincə əməl etməyə və onu başqalarına öyrətməkdə səbrli olmalıdır.*

***Surədən çıxarılan bəzi nəticələr***

*1. Özündə xilas (qurtuluş) yolunu ehtiva etdiyinə görə Əsr surəsinin ayrı bir fəziləti vardır.*

*2. Uca Allah istədiyi şeyə and içə bilər, çünki onu yaradan Odur.*

*3. Qulların Allahdan başqasına and içmələri qəbul edilmir. Çünki Peyğəmbər (sallallahu əleyhi və səlləm) belə buyurmuşdur:*

*a. «Kim ki, Allahdan qeyrisinin adıyla and içərsə, şərik qoşmuş olar». (Səhih hədis kimi Əhməd tərəfindən rəvayət edilmişdir);*

*b. «Atalarınızın adına and içməyin. Kim ki, Allaha and içirsə, doğru and içsin ki, Ona and içilən bundan razı qalsın. Bir kəs ki, Allahın adı ilə and içməyə razı olmasa, onun Allahla bir əlaqəsi olmaz». (Səhih hədis kimi İbn Macə tərəfindən rəvayət edilmişdir)*

*c. Abdullah b. Məsud da belə demişdir: «Allahın adı ilə yalandan and içmək, başqasının adı ilə doğru and içməkdən daha çox xoşuma gəlir».*[R15]

*4. Kafirin aqibətinin zərərə və ziyana uğramaq olduğu vurğulanır.*

*5. İmana və şəriətə uyğun olan saleh əməl sahibi olanların xilas olacağı bəyan edilir.*

*6. İman söz və əməldən ibarətdir, itaətlə artır, günahlarla azalır.*

*7. Müsəlmanlar arasında haqqın və səbrin qarşılıqlı şəkildə tövsiyə edilməsi vacibdir.*

*8. Camaatla namaz, xüsusilə də əsr namazının camaatla qılınması vacibdir. Çünki Uca Allah:* ***«[****Fərz*[Σ171]*, vacib* ***] namazlara, [****xüsusilə* ***] orta namaza riayət edin…» (Bəqərə, 2/238)*** *Orta namaz isə, əsr namazıdır.*

*9. Vaxt müsəlman üçün qiymətlidir. Onu Allaha itaət ilə keçirir.*

---

R15 Bu əsəri İbn Əbi Şeybə (Musannəf, 3/79, №12281), Təbərani (Mucamul-Kəbir, 9/183, №8902), Abdurrazzəq (Musannəf, 8/469) və başqaları rəvayət etmişlər. Heysəmi «Məcmu əz-zəvaid» (4/177) və şeyx Əlbani «Səhih tərğib və tərhib» (3/131, hədis 2953) əsərində onun isnadının səhih olduğunu bildirmişdir.

Σ171 ***Fərz*** – mütləq dini təlimatdır. (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, "Şərhlər" səh. 44)

## *Quranda «zəruri» pauza*

***Təyinatı:*** *Tam məna ifadə edən söz qrupunun üzərində «dayanmaq zəruriyyəti» (ərəb. luzumul-vaqfi – red.) anlayışını verir. Özündən sonrakı ifadələrlə birlikdə oxunduqda, bu oxu tamamilə başqa bir məna kəsb edir.*

***Hökmü:*** *Belə bir yerdə pauza verilməli və ondan sonra gələn sözlə oxu davam etdirilməlidir. Ona görə bu cür pauzalara «zəruri dayanma» adı verilir.*

***Əlaməti:*** *Mim hərfidir ki, pauza lazım olan kəlmənin son hərfi üzərində yazılır.*

## *Bu pauzalarla bağlı bəzi nümunələr*

*Uca Allah buyurur ki:*

*1.* ***«Onların sözləri səni kədərləndirməsin. Yenilməz izzət bütövlükdə yalnız Allaha məxsusdur…» (Yunus, 10/65)*** *Burada «onların sözləri» anlamındakı söz üzərində pauza vermək lazımdır. Çünki daha sonra gələn «yenilməz izzət bütövlüklə yalnız Allaha məxsusdur» buyruğu ilə bir yerdə oxunduğu təqdirdə bu ifadənin kafirlərin dedikləri sözlərdən olduğu zənn edilir, halbuki, əslində bu belə deyil. Əksinə bu, Uca Allahın nazil etdiyi bir ayədir.*

*2.* ***«Artıq sən onlardan üz çevir. Carçının onları olduqca pis bir şeyə çağıracağı günədək!» (Qəmər, 54/6)*** *Burada «onlardan» sözü üzərində pauza vermək mütləq lazımdır. Çünki Uca Allahın: «Carçının…çağıracağı günədək!» buyruğuna birləşdirilərək oxunarsa, onda Uca Allahın: «Artıq onlardan üz çevir» buyruğu dünyada müşriklərdən üz çevir mənasındadır deyə zənn edilə bilərdi. Uca Allahın: «Carçının…çağıracağı günədək!» buyruğu qiyamət günü İsrafilin surunu çalacağına işarədir.*

3. ***«Əlbəttə, Allah ağcaqanadı və ya ondan daha böyüyünü misal gətirməkdən çəkinməz. İman gətirənlər bunun öz Rəbbi tərəfindən bir həqiqət olduğunu bilirlər, kafirlər isə: «Allah bu məsəllə nə demək istəyir?» - deyirlər. Allah bununla bir çoxlarını zəlalətə salır, bir çoxlarını isə doğru yola yönəldir. Allah yalnız fasiqləri zəlalətə düçar edir» (Bəqərə, 2/26)***

*Bu ayədə ayənin «misal» sözü üzərində pauza vermək lazımdır. Çünki Uca Allahın: «bununla…zəlalətə salır», yəni «ağcaqanad…misalı» anlamındakı ifadəsi kafirlərin dediyi sözlərə bənzəyir. Halbuki, bu, Uca Allahın buyruqlarındandır.*

4. ***«Allahı qoyub yalnız qadın bütlərə tapınır və yalnız asi Şeytana qulluq edirlər. Allah ona lənət etdi. O isə dedi: «Əlbəttə, mən Sənin bəndələrindən müəyyən bir qismini ələ alacağam» (Nisa, 4/117-118)***

*Burada Uca Allahın: «Allah ona lənət etdi» buyruğu üzərində pauza vermək lazımdır. Çünki Uca Allahın: «O isə dedi: «Əlbəttə, …ələ alacağam» buyruğunun Allahın sözlərindən olduğu kimi qəbul edilməməlidir. Əksinə, bu, Allahın Şeytandan nəql etdiyi Şeytana məxsus sözlərdir.*

5. ***«Ey kitab əhli! Öz dininizdə həddi aşmayın… Övladı olmaqdan [**bu bəşəri xüsusiyyətdən**] kənardır. Göylərdə və yerdə nə varsa, hamısı Onundur».*** *Ayədə «övladı» anlamındakı söz üzərində pauza vermək lazımdır. Ona görə ki, Uca Allahın: «Göylərdə və yerdə nə varsa, hamısı Onundur» buyruğundan onların övladın mülkü olduğu kimi başa düşülməsin. Əksinə, onlar Uca Allaha məxsusdur.*

6. ***«Bundan sonra Lut [**hamıdan əvvəl İbrahimə**] iman gətirdi. [**İbrahim**] dedi: «Mən Rəbbimin əmr etdiyi yerə hicrət edəcəyəm. Həqiqətən, yenilməz qüvvət sahibi, hikmət sahibi Odur!» (Ənkəbut, 29/26)***

*Bu ayədə «Lut» sözü üzərində pauza vermək lazımdır. Pauza ona görə verilməlidir ki, «Mən Rəbbimin əmr etdiyi yerə hicrət edəcəyəm» buyruğu Lutun sözləri kimi başa düşülməsin. Çünki bu sözlər, daha sonrakı ifadələrin də göstərdiyi kimi, İbrahim əleyhissəlamın sözlərindən idi.*

*7.* ***«[**Tur dağına gedən**] Musanın ardınca tayfası öz bəzək-düzək şeylərindən böyürtüsü olan bir buzov heykəli düzəltdilər. Məgər [**buzovun**] onlarla danışmadığını, onlara bir yol göstərə bilmədiyini görmədilərmi? [**Bununla belə**] ona tapınıb [**özlərinə**] zülm eləyən oldular» (Əraf, 7/148)***

*Bu ayədə pauza «bir yol» ifadəsi üzərində qoyulmalıdır. Beləliklə, bu, Musanın tayfasının bu yola ümid bəslədikləri mənasını doğrultmur. Çünki onlar yolu deyil, buzovu özlərinə tanrı seçmişdilər.*

*8.* ***«Yəhudilər dedilər: «Allahın əli bağlıdır[172]!» Bu dedikləri sözə görə onların öz əlləri bağlandı və lənətə gəldilər. Xeyr, Allahın əlləri açıqdır…» (Maidə, 5/64)***

*Burada «dedikləri sözə» ifadəsi üzərində pauza verilməlidir ki, Uca Allahın: «Xeyr, Allahın əlləri…» buyruğunun yəhudilərin dedikləri sözlərdən olması kimi başa düşülməsin. O ifadə Allahın buyruğudur.*

*9.* ***«Onlar bir ayə gəldiyi zaman: «Allah peyğəmbərlərinə verildiyinin misli bizə verilməyincə, biz iman gətirməyəcəyik!» - deyərlər. Allah peyğəmbərliyi hara [**kimə**] göndərəcəyini Özü daha yaxşı bilir…» (Ənam, 6/124)*** *Burada pauza («Allah peyğəmbərlərinə» ifadəsindəki) «Allah» sözü üzərində qoyulmalıdır ki, Uca Allahın (kafirlərə ünvanladığı cavabında): «Allah… daha yaxşı bilir» ifadəsindəki buyruğun kafirlərin dediyi sözlərdən olduğu zənn edilməsin. Bu ifadə Allahın buyruqlarındandır.*

---

Σ172 Yəni – Allah xəsisdir (əstəğfrullah!) Bax: (Qurani-Kərim, Bakı, 2004, VI nəşr, "Şərhlər", 23-cü izah, səh. 55)

*10. «[Sənin dəvətini]* ***ancaq can-dildən eşidənlər qəbul edər. Ölüləri də Allah dirildər. Sonra onlar Allahın hüzuruna qaytarılar» (Ənam, 6/36)***

*Bu ayədə pauzanın «eşidənlər» sözü üzərində qoyulması tələb olunur. Bu tərzdə oxunduqda ölülərin də eşidə bilməsi təsəvvürünü yaratmır.*

*11.* ***«Və Allahla yanaşı başqa heç bir tanrıya ibadət etmə. Allahdan başqa heç bir tanrı yoxdur….» (Qəsəs, 28/88)*** *buyruğunda pauza «başqa» sözü üzərində verilməlidir. Beləliklə, bu, başqa tanrının şəriki yoxdur anlamını vermir.*

*12.* ***«Onlar yer üzündə [****Allahı****] aciz qoya bilməzlər. Allahdan başqa onların köməyinə çata bilən də yoxdur. Onları ikiqat əzab gözləyir…» (Hud, 11/20)***

*Bu ayədə «köməyinə çata bilən» ifadəsinin üzərində pauza edilməlidir. Beləliklə, «onları ikiqat əzab gözləyir» ifadəsində bəhs edilənlərin «köməyə çata bilənlərin» olmadığı başa düşülür. Əksinə, bu onlara: «Onlar yer üzündə (Allahı) aciz qoya bilməzlər» buyruğu ilə işarə edilən kafirlər haqqındadır.*

*13.* ***«Onların sözü səni kədərləndirməsin. Biz onların gizlində də, aşkarda da nə etdiklərini bilirik» (Yasin, 36/76).*** *Ayədə «onların sözü» ifadəsi üzərində pauza verilməlidir. Beləliklə də, Uca Allahın: «Biz onların gizlində… nə etdiklərini bilirik» ifadəsinin kafirlərin dedikləri sözlərdən olduğu kimi başa düşülməməlidir. Əksinə, bu, Uca Allahın buyruqlarındandır.*

## Qurani Kərim oxunuşunda səktə[Σ173]

---

[Σ173] Türk mətnində: **sekte** – dayanma. **Təcviddə:** qiraət zamanı nəfəs almadan səsi kəsməyə deyilir (Bax: Ömer Sevincgül, "Özel lüğat", İstanbul, 2003, ZAFER yayınları, 1-ci nəşr, səh. 617)

***<u>Səktənin təyinatı</u>***

***Səktə,*** *qiraət məqsədi ilə nəfəs almadan, bir qayda olaraq, pauzadan daha az müddət ərzində səsin kəsilməsidir (oxunan ifadənin müəyyən kəlməsi üzərində qısa fasilə verilməsidir).*

***Əlaməti:*** *üzərində* ***səktə*** *edilməsi nəzərdə tutulan kəlmənin son hərfi üzərində yazılan kiçik bir «sin» hərfidir.*

***Tələb olunan:*** *Kəlmənin son hərfi üzərində* ***səktə*** *işarəsi qoyulmalıdır. Bu, ilahi (mövzu ilə bağlı Peyğəmbərdən (sallallahu əleyhi və səlləm) nəql edilən hədislərin) qeydiyyatı ilə bağlıdır. Bu barədə hədisin olmadığı hallarda* ***səktə*** *işarəsinin qoyulması (səsin kəsilməsi) bəyənilmir. İmam İbn Cəvzinin də bildirdiyi kimi, bu barədə səhih hədislər mövcuddur. Amma pauza verilməli yerlər (sözlər) qiraət kitablarının müəyyən yerlərində göstərilməsilə yanaşı onluq qiraəti (yəni, Quranın on tanınmış qarisinin –red.) arasında fərq vardır. (Bax: Əbdul-Fəttah əl-Mursifi, Hidəyətul-qari ila təcvidil- kəlamil-Bari, I, 407 və ardı)*

*Aşağıda ancaq Həfsin (on qaridən biri – red.), üzərində səktə etdiyi nümunələri qeyd edəcəyik. Bunlar altı yerdədir:*

*1. «Kəhf» surəsində:* ***«…Kitabı heç bir əyriliyə yol vermədən…» (Kəhf, 18/1)*** *buyruğunda «əyriliyə» anlamında tənvinin əvəzində qoyulan əlif (əvəz məddi). Burada* ***səktə*** *etmənin hikməti mənanı açıqlamaq və (sonrakı ayənin ilk kəliməsi olan) «doğru» sözünün, (üzərində* ***səktə*** *edilən) «əyriliyə» kəliməsinin sifəti olduğunu bildirməkdir. Əgər onun sifəti deyilsə, onda «kitab»ın sözünün halı və yaxud da götürülmüş bir fel səbəbilə təsirlikdə olandır. Bu da: «O kitabı doğru kitab etmişdir» mənasındadır.*

*2.* ***«…Vay halımıza! Bizi yatdığımız yerdən kim qaldırdı?» (Yasin, 36/52)*** *buyruğunda verilmiş «yatdığımız*

*yerdən» ifadəsindəki sözün sonundakı əlif hərfi üzərində* ***səktə*** *qoyulur. Burada* ***səktənin*** *qoyulmasının mahiyyəti daha sonra gələn «bu» işarə əvəzliyinin «yatdığımız yerdən»in sifəti kimi başa düşülməməsi ilə əlaqədardır. O, sifət deyil, yeni bir cümlə başlanğıcıdır.*

*3.* ***«Kim xilas edə bilər?» (Qiyamə, 75/27)*** *buyruğundakı «Kim» mənasındakı sözün «nun» hərfidir. Ayədə* ***səktənin*** *qoyulmasının səbəbi ondan sonra gələn kəlmədən ayrı bir kəlmənin olduğunu fərqləndirməkdir. Sonrakı kəlimə ilə birlikdə çoxluq forması (ərəb. siğatul-mubəliğa – red.) əmələ gətirən «fəəal» modelli tək bir kəlimə deyildir.*

*4. Mutəffifin surəsində verilmiş:* ***«Xeyr. Əslində onların qəlblərini qazandıqları qaplamışdır» (Mutəffifin, 83/14)*** *buyruğunda «Xeyr» sözünün ləm hərfi üzərində* ***səktə*** *qoyulur. Bununla bağlı izahat bundan əvvəlki bənddəki şərhə oxşardır.*

*5.* ***«Mal-dövlətim mənə heç bir fayda vermədi. Mülküm [****səltənətim****] də məhv olub getdi!» (Haqqə, 69/28-29)*** *ayəsinin sonunu sonrakı ayə ilə bitişik oxuduqda, «mal-dövlətim» sözünün «hə» hərfi üzərinə* ***səktə*** *qoyulur.*

*6. Ənfal surəsinin sonu ilə Tövbə surəsinin başlanğıcı arasında səktə qoymaq. Onluq qarilərdən olan digər imamlar da (yəni, Həfsdən qeyri doqquz qari də – red.) bir qiraət şəklində onunla eyni formada oxumuşlar. (Mahmud əl-Husari, Əhkəmul-Quranil-Kərim, s. 261 və ardı, Məhəmməd Minyarın izahları ilə)*

***Bir xəbərdarlıq***

*Biz burada Qurani Kərimin* ***səktə*** *qoulacaq yerlərini bu elm sahibinin izahlarına istinad etməklə göstərdik və bəzi yerlərdə bu* ***səktələri*** *məna baxımından diqqətlə*

*səciyyələndirdik. Bir daha* ***səktə*** *qoyulan yerlərin tutulması ilə bağlı olduğuna və bu barədə pauza və birləşmənin (vəslin) müxtəlif əlamətlərindən fərqli olaraq, burada ictihadın olmadığına da (yəni,* ***səktə*** *edilməsinin dəlillərə əsaslandığını irəlidə – red.) işarə etdik. Çünki başqa pauza və birləşmə əlamətləri ictihadla bağlıdır. Buna görə bəzi yerlərdə birləşmənin (vəslin) pauzadan daha münasib, ya da əksinin daha da doğru olduğunu görə bilərik. Digər tərəfdən, Quran nüsxələrindəki əlamətlər nəzər nöqtəmizə zidd ola bilər. Əgər zəruri pauza kimi göstərilən yerlər tədqiq edilərsə, bəzilərinin pauza baxımından lazım olmadığı və birgə oxunmaqla bərabər mənanın pozulmadığı da aşkar ola bilər.*

*Burada bizim üçün əhəmiyyətli olan isə, səktə edilməsinin dəlillərə əsaslanmasını və bu səbəbdən də hər zaman və hər yerdə mütləq bir məna daşıyacaq hikmətin axtarılmasının gərəkli olmamasını bildirməkdir. Buna ən böyük dəlil uca Allahın:* ***«Kim xilas edə bilər?» (Qiyamə, 75/27)*** *buyruğundakı «Kim» mənasındakı sözün üzərində* ***səktə*** *edilməsidir. Biz bunun səbəbini irəlidə açıqladıq. Buna baxmayaraq bütün qiraət alimləri burada «nun» hərfini «ra» hərfinə idğam edirlər. Bircə Həfs istisnadır, o burada* ***səktə*** *ilə oxuyur.*

*Digər tərəfdən* ***«Mal-dövlətim...» (Haqqə, 69/28-29)*** *buyruğunun «hə» hərfi üzərinə* ***səktə*** *etmənin məna baxımından hikməti nədir? Xüsusilə burada Həfsin bir başqa qiraət şəklinin olduğunu və buna görə də onun* ***«...məhv olub getdi»*** *sözündəki «hə» hərfinə idğam etdiyini də bilsək məsələ daha yaxşı başa düşülər. Çünki bunlar bir-birinə oxşar iki hərfdir (idğamul-misleyndir).*

## *Allah yaradandır və yaradılmamışdır*

*Uca Allah buyurur ki:* ***«O, [****hər şeyi****] yaradan, yoxdan var edən, [****hər şeyə****] surət verən Allahdır. Ən gözəl adlar ancaq Ona məxsusdur…» (Həşr, 59/24)***

*Şeytan: Allahı kim yaradıb deyə vəsvəsə salarsa, Peyğəmbər (sallallahu əleyhi və səlləm) bizə şeytanın bu tələsinə qarşı necə çıxacağımızı və nə deyəcəyimizi öyrətmişdir:*

*«Allaha və Peyğəmbərinə iman gətirmişəm. Allah birdir. Allah möhtac deyildir, O, nə doğmuş, nə də doğulmuşdur! Onun heç bir bənzəri yoxdur» deyilir və sonra üç dəfə sol tərəfə tüpürürmüş kimi hərəkət edir və Şeytandan Allaha sığınaraq bu işdən uzaqlaşar. Bu hərəkət (Şeytanın təlqini) o kimsədən uzaqlaşdırar. (Buxari, Muslim və başqaları tərəfindən bu hədis nəql olunmuşdur. Bu barədə olan hədislər budur.)*

*Allahın yaradıcı olduğunu və yaradılmadığını demək və qəbul etmək vacibdir. Əmr b. Dinar deyib ki, mən yetmiş ildən bu yana insanların belə dediklərini görmüş və eşitmişəm: Allah yaradandır, yaradılmamışdır. Ondan kənarda olan bütün varlıqlar yaradılmışdır. Quran istisnadır. O yaradılmamışdır. Allahdan nazil olmuş və Ona da qayıdacaqdır (Ondan nazil olmuşdur, yəni, onu öz sözü ilə deyən Odur) Bu, İmam Əhmədin də sözüdür.*

*Şeyxülislam (İbn Teymiyyə) deyib ki, Allahın sifətləri haqqında deyilənlər, Zatı haqqında deyilənlər kimidir. Buna görə Allahın sifətlərindən olan Allahın kəlamı Qurani Kərim haqqında da onun xəlq edilmiş olmadığı deyilir.*

*Quran Allahın yaradılmamış kəlamıdır. Çünki Allahın kəlamı Onun sifətlərindəndir, sifətləri isə Ona tabe olaraq yaradılmışdır.*

*Uca Allahın:* ***«Biz onu, anlaya biləsiniz deyə, ərəbcə Quran etdik» (Zuxruf, 43/3)*** *buyruğuna gəldikdə isə, İbn Kəsir və Təbəri: «Biz onu…etdik» onu nazil etdik deməkdir söyləmişlər.*

*Qurani Kərim Peyğmbərin (sallallahu əleyhi və səlləm) möcüzəsidir. Peyğəmbər (sallallahu əleyhi və səlləm) onunla həmin dildə danışan ərəbləri, ona oxşar bir ayə də olsa belə deməlerini istəmişdi. Lakin heç kimin buna gücü çatmamışdı.*

***«[****Ya Peyğəmbərim!****] De ki: «Əgər insanlar və cinlər bir yerə yığışıb bu Qurana bənzər bir şey gətirmək üçün bir-birinə kömək etsələr, yenə də ona bənzərini gətirə bilməzlər» (İsra, 17/88).***

***«De ki: «Əgər doğru deyirsinizsə, ona [****Qurana****] bənzər bir surə gətirin...» (Yunus, 10/38).***

*Quran Allah tərəfindən nazil edilmişdir. Uca Allah onu kamil etmişdir. O, bütün zaman və məkanlar üçün əlverişlidir. Bəşəriyyət, içində yaşadığı çirkablıqdan yalnız onunla qurtula bilər.*

*Quran belə tanıdılır: O, Allah tərəfindən Məhəmməd peyğəmbərə (sallallahu əleyhi və səlləm) nazil olan və tilavəti ilə ibadət edilən Allah kəlamıdır.*

*a. Quran Allahın kəlamıdır deməklə insan, cin, mələk və sairə varlıqların sözləri bu məfhum xaricində qalır.*

*b. Allah tərəfindən nazil edilmişdir deməklə Allahın Öz dərgahında saxladığı kəlimələrdən qeyrisi anlanılır. Çünki*

*hədisdə: «Yaxud dərgahındakı qeyb aləmində yalnız Özünə bəlli saxladığın hər bir adınla...» buyurulmaqdadır.*[R16]

*c. Oxunması ibadətdir qeydi ilə qüdsi hədislər kənarlaşdırılır. Çünki oxunması ilə ibadətin hasil olması, onun namazda və namaz xaricində ibadət məqsədi ilə oxunmasıdır. Qüdsi hədislərdə isə belə deyildir. Onlar namazda oxunmazlar.*

*Bu açıqlama Quranın Allah tərəfindən nazil edildiyini və yaradılmamış olduğunu bildirir.*

---

[R16] Şeyx Əlbani "Səhih Tərğib və Tərhib" (2/361, h. 1822) əsərində bu hədisin səhih olduğunu bildirmişdir. 94-cü səhifəyə bax!

## *Quran ilə Qüdsi hədis arasında fərq*

*1. Allah Quran ilə ərəbləri aciz qoymuşdur. Lakin Qüdsi hədislərlə aciz qoymaqdan söhbət aparıla bilməz.*

*2. Quran yekdilliklə nəql edilmişdir. Qüdsi hədislər isə azsaylı isnadlarla rəvayət edilmiş xəbərlərdir.*

*3. Quran söz və məna baxımından uca Allahdandır. Qüdsi hədisin mənası Allahdan, sözləri isə Peyğəmbərdəndir (sallallahu əleyhi və səlləm). Məsələn uca Allah buyurur:*

*«Ey qullarım! Mən zülmü Öz nəfsimə qadağan etdim. Onu sizin aranızda da qadağan edirəm. O halda bir-birinizə zülm etməyin». (Muslim)*

# *MÜNDƏRİCAT*

